Azərbaycan Milli Elmlər Akademiyası
A.A.Bakıxanov adına Tarix İnstitutu
TARİX İNSTİTUTU

AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI

A.A.BAKIXANOV ADINA TARİX İNSTİTUTU

# İRƏVAN XANLIĞI

*Rusiya işğalı və ermənilərin Şimali Azərbaycan torpaqlarına köçürülməsi*

2010, Bakı, Azərbaycan

Azərbaycan Milli Elmlər Akademiyası
A.A.Bakıxanov adına Tarix İnstitutu
TARİX İNSTİTUTU

AMEA A.A.Bakıxanov adına Tarix İnstitutu
Elmi Şurasının qərarı ilə çap olunur

Elmi redaktor
*Əməkdar elm xadimi, AMEA-nın müxbir üzvü,*
*t.e.d., prof. Yaqub Mahmudov*

Elmi redaktor müavini *t.e.d.,*
*prof. Tofiq Mustafazadə*

Məsul redaktor *t.e.n.*
*Güntəkin Nəcəfli*

Üz qabığı
*İrəvan şəhəri. Böyük məscid.* Dübua de Monpere F.

**MÜƏLLİFLƏR**

Əməkdar elm xadimi, AMEA-nın müxbir üzvü,
t.e.d., prof. Yaqub Mahmudov,
t.e.d., prof. Tofiq Mustafazadə, t.e.d., prof. Süleyman Məmmədov,
t.e.n. Güntəkin Nəcəfli, Nazim Mustafa, t.e.n. Gövhər Məmmədova,
t.e.n. Hacı Həsənov, t.e.n. İsrafil Məmmədov, t.e.n. Vidadi Umudlu,
t.e.n. Səidə Hacıyeva, t.e.n. İradə Məmmədova, t.e.n. Nigar Gözəlova

**REDAKSİYA HEYƏTİ**

Əməkdar elm xadimi, AMEA-nın müxbir üzvü,
t.e.d., prof. Yaqub Mahmudov (elmi redaktor),
t.e.d., prof. Tofiq Mustafazadə (elmi redaktor müavini),
t.e.n. Güntəkin Nəcəfli (məsul redaktor), akademik İsmayıl Hacıyev,
t.e.d., prof. Fuad Əliyev, t.e.d. Kərim Şükürov, fəls.e.d. Sabir Əsədov,
t.e.n. Cəbi Bəhramov, t.e.n. Elmar Məhərrəmov

# Kitabın içindəkilər

Azərbaycan Milli Elmlər Akademiyası
A.A.Bakıxanov adına Tarix İnstitutu
TARİX İNSTİTUTU

# Ermənilərin XIX əsrdə şimali Azərbaycan torpaqlarına köçürülməsi tarixi həqiqətdir

Oxuculara təqdim olunan bu kitabda Cənubi Qafqazın tarixində mühüm rol oynamış Azərbaycan dövlətlərindən birindən — İrəvan xanlığından (1747-1828) bəhs olunur. Bu Azərbaycan dövləti XIX əsrin əvvəllərində yadelli işğalçılara qarşı qəhrəmancasına mübarizə aparmışdır.

İrəvan xanlığının tarixi Azərbaycan xalqının minillər boyunca yaratdığı zəngin maddi və mənəvi mədəniyyət tarixinin ayrılmaz tərkib hissəsidir.

İrəvan xanlığı XVIII əsrin ortalarında Nadir şah imperiyasının süqutundan sonra meydana gəlmiş Azərbaycan dövlətlərindən — xanlıqlarından biri idi.

Hazırda Ermənistan Respublikasının yerləşdiyi ərazi yaxın keçmişdə — XIX əsrin əvvəllərində Azərbaycan dövləti olan İrəvan xanlığının torpaqları idi. Bu torpaqların ən qədim yerli əhalisi - aborigen sahibləri Azərbaycan türkləri idi.

İrəvan xanlığının yarandığı ərazi ən qədim türk torpaqlarıdır. Azərbaycan xalqının formalaşmasında yaxından iştirak etmiş hürrilər, kimmerlər, iskitlər, saklar, hunlar və digər çoxsaylı oğuz və qıpçaq türkləri məhz bu regionda, xüsusilə Göyçə gölü* ətrafındakı torpaqlarda yaşamış və özlərindən sonra zəngin tarixi-mədəni iz qoymuşlar.

Azərbaycan xalqının və digər türk xalqlarının qəhrəmanlıq eposu olan "Kitabi-Dədə Qorqud" dastanlarında təsvir olunan bir çox mühüm tarixi hadisələr, proseslər Azərbaycanın məhz bu regionunda — İrəvan xanlığının ərazisində cərəyan etmişdir.

Böyük Azərbaycan hökmdarı Uzun Həsənin (1468-1478) tapşırığı ilə yazılmış Oğuznamədə — Əbu Bəkr Tehraninin "Kitabi-Diyarbəkriyyə"sində oğuz türklərinin soy kökündə duran Oğuz xaqanın məhz burada — Göyçə dənizi ətrafındakı torpaqlarda yaşadığı, dünyasını burada dəyişdiyi və burada da dəfn olunduğu qeyd edilir. Xanlar xanı Bayandur xaqan və bir çox digər oğuz-türk sərkərdələri də özlərinin ata-baba yurdu olan bu diyarda fəaliyyət göstərmiş, burada da dünyalarını dəyişmiş, dəfn olunmuşlar.[1]

İrəvan xanlığının ərazisi, ayrı-ayrı işğalçı imperiyaların hökmranlıq dövrləri istisna edilməklə, ən qədim zamanlardan başlayaraq həmişə Azərbaycan dövlətlərinin tərkibində olmuşdur. Bu torpaqlar həm də Azərbaycan-türk tayfalarının elliklə və ən sıx şəkildə yaşadığı regionlardan biri idi.

XIX əsrin əvvəlində baş vermiş Rusiya işğallarına qədər İrəvan xanlığı əhalisinin mütləq əksəriyyəti Azərbaycan türkləri idi. Qeyd etmək lazımdır ki, erməni katolikosluğu mərkəzinin 1441-ci ildə İrəvan

*1918-ci ildə Qərbi Azərbaycanda — keçmiş İrəvan xanlığının ərazisində erməni dövləti yaradıldıqdan sonra Göyçə gölünün adı 1930-cu ildə ermənilər tərəfindən dəyişdirilib "Sevan" adlandırılmışdır.

[1] Geniş məlumat üçün bax: Əbubəkr Tehrani. Kitabi-Diyarbəkriyyə. Fars dilindən tərcümə edən, ön söz, şərhlər və göstəricilərin müəllifi Rahilə Şükürova. Bakı, 1998, s.46-47.

(Çuxursəd) bölgəsinə köçürülməsinə qədər burada ermənilərə məxsus heç bir kənd və yaxud torpaq sahəsi olmayıb. Hətta erməni katolikosluğunun yerləşdiyi Üçkilsə (Valarşabad*) kəndi belə 1443-cü ildən başlayaraq ermənilər tərəfindən müxtəlif vasitələrlə hissə-hissə Azərbaycan türklərindən alınmışdı.**

Azərbaycan dövləti olan İrəvan xanlığını Azərbaycanın dövlət idarəçiliyi tarixində mühüm rol oynamış məşhur Qacarlar adlanan türk sülaləsindən olan xanlar idarə etmişlər. Xanlığın bütün idarəçilik sistemi, ictimai, siyasi, mədəni və təsərrüfat həyatı, burada yaşayan əhalinin məişət mədəniyyəti Azərbaycanın minillər boyunca davam etmiş ümumi tarixi inkişaf sisteminin ayrılmaz tərkib hissəsi idi. İrəvan xanlığı öz inkişaf xüsusiyyətlərinə görə həmin dövrdə mövcud olmuş digər Azərbaycan xanlıqlarından heç nə ilə fərqlənmirdi.

İrəvan xanlığının ərazisində, tarix boyu, Azərbaycan xalqına məxsus çoxsaylı yaşayış məskənləri — kəndlər, şəhərlər salınmış, minlərlə tarixi abidələr — qalalar, məscidlər, minarələr ucaldılmış, karvansaralar, hamamlar inşa olunmuşdu.*** Bölgədəki bütün yer adları — toponimlər Azərbaycan xalqına məxsus idi. Bu inkarolunmaz həqiqəti hətta erməni mənbələri də təsdiq edir.**** Xanlığın ərazisində saysız-hesabsız qədim oğuz-türk qəbiristanları və bu qəbiristanlarda Azərbaycan xalqına məxsus külli miqdarda qoç heykəlləri, qəbirüstü abidələr vardı. Bütün bunlar Azərbaycan xalqının maddi mədəniyyət möhürləri idi…

Lakin XIX əsrin əvvəllərində Cənubi Qafqazın tarixində qanlı faciələr dövrü başlandı. Regionu ələ keçirməyə çalışan Rusiya imperi-

---

* "Valarşabad" toponimi Arşakilər (Arsaklılar) sülaləsindən olan Sanatürkün (Sanatrukun) oğlu Valar şahın (194-216) adı ilə bağlıdır. Uzun tarixi dövr ərzində "Valarşabad" kimi işlənmiş bu toponim erməni ədəbiyyatında təhrif olunaraq "Vağarşabad" formasına salınmışdır. Valarşabadın əsası Valar şah tərəfindən qoyulmuşdu [bax: 95,116; 190, 29].

** Bax: bölmə 2, cədvəl 1.

*** Bax: bölmə 4, cədvəl 2, 3.

**** Bax: bölmə 2, əlavə 2.

yası Azərbaycan xanlıqlarına qarşı müharibələrə başladı. Çox çəkmədən Cənubi Qafqaz Rusiya imperiyasının Qacarlar İranı və Osmanlı dövlətinə qarşı apardığı qanlı müharibələr meydanına çevrildi.

Osmanlı dövləti və Qacarlar İranı ilə sərhəddə yerləşən İrəvan xanlığının ələ keçirilməsi Rusiya imperiyasının işğalçılıq planlarının mühüm tərkib hissəsi idi. 1804-1813-cü illərdə Azərbaycan torpaqlarının işğalı uğrunda gedən Birinci Rusiya — İran müharibəsi zamanı İrəvan xanlığı iki dəfə (2 iyul-3 sentyabr 1804-cü il; 3 oktyabr-30 noyabr 1808-ci il) Rusiya qoşunlarının güclü hücumlarına məruz qaldı. Lakin İrəvan xanlığı Rusiyaya təslim olmadı və öz müstəqilliyini qoruyub saxlaya bildi. Xanlığın əhalisi müdrik və cəsur dövlət xadimləri olan Məhəmməd Hüseyn xan Qacarın (1784-1805) və Hüseynqulu xan Qacarın (1806-1827) başçılığı ilə doğma vətəninin müdafiəsinə qalxaraq çar qoşunlarına qəhrəmanlıqla müqavimət göstərdi. Böyük itkilər verən Rusiya imperiyasının hakim dairələri İrəvan xanlığını ələ keçirmək üçün şirnikləndirici vasitələrə əl atdı. Rusiyanın Cənubi Qafqazdakı hərbi qüvvələrinin baş komandanı general Qudoviç İrəvan sərdarının (Hüseynqulu xan Qacar — ***red.***) qardaşı Həsən xan Qacara qalanı könüllü təslim edəcəyi halda onu sərbəst buraxaraq, İrəvan qalası və şəhəri istisna olmaqla, bütün xanlığın hakimi təyin olunacağına Rusiya imperatoru adından vəd verdi.[1] Həsən xan Qacar Rusiya imperatoru adından verilən bu təklifi rədd etdi.

Çar Rusiyası Azərbaycan torpaqlarının işğalında ermənilərin köməyindən, erməni xəyanətindən dövlət səviyyəsində istifadə edirdi. Məsələn, çarın həmin dövrdə verilmiş bir fərmanına bununla bağlı ayrıca bənd daxil edilmişdi: "…Hər cür nəvazişlə erməniləri öz tərəfinizə çəkməyi xüsusi olaraq sizin ixtiyarınıza buraxıram".[2]

---

[1]Акты, собранные Кавказскою Археографическою Комиссиею (АКАК), т.III, Тифлис, 1869, sənəd 447, s.239-240.
[2]АКАК, т. I, Тифлис, 1866, sənəd 548, s.436.

Bütün bunlara baxmayaraq, Birinci Rusiya — İran müharibəsi zamanı Rusiya imperiyası İrəvan və Naxçıvan xanlıqlarını işğal edə bilmədi. Hər iki xanlığın yerli əhalisi olan Azərbaycan vətənpərvərləri doğma yurdun azadlığı uğrunda işğalçılara və onlara kömək edən ermənilərə qarşı qəhrəmanlıq mübarizəsi aparıb və qələbə çaldılar.

İrəvan xanlığını işğal etmək niyyətindən əl çəkməyən I Nikolay İrəvan və Sərdarabad qalalarını ələ keçirməyin hərbi - strateji əhəmiyyətini nəzərə alır, bunu tez-tez general Yermolova xatırladırdı. Rusiya imperatoru 1826-cı il oktyabrın 21-də Yermolova yazırdı: "Əgər İrəvanı ya silah gücünə, ya İrəvan Sərdarını pulla ələ almaq yolu ilə, ya da onunla gizli münasibətlər qurmaqla ələ keçirmək mümkündürsə, bu imkanı əldən verməyin".[1]

İkinci Rusiya — İran müharibəsi (1826-1828) zamanı İrəvan xanlığının işğalına xüsusi önəm verən çar I Nikolay (1825-1855) Yermolova göndərdiyi 1826-cı il 1 avqust tarixli fərmanında işğalçı generala xüsusi olaraq tapşırırdı: Təcili olaraq İrəvan Sərdarı üzərinə yürüş edin. Tezliklə sizdən belə cavab gözləyirəm: "Allahınköməkliyi ilə Sərdar daha yoxdur və İrəvan vilayəti tamamilə tutulub". Siz və 15 min nəfərlik rus ordusu qələbə qazanmaq üçün kifayətdir.[2]

Azərbaycan vətənpərvərlərinə başçılıq edən İrəvan sərdarı Hüseynqulu xan Qacar, qardaşı "Aslanlar başı" titulunu daşıyan Həsən xan və onun nəvəsi Fətəli xan Qacar 1827-ci ildə Rusiya işğalçılarına qarşı İrəvanı (27 aprel — 23 iyun; 24 sentyabr — 1 oktyabr) və Sərdarabad qalasını (16-17 aprel; 14-20 sentyabr) dörd dəfə qəhrəmancasına müdafiə etdi. Çar generalı Benkendorfun Sərdarabad qalasını təslim etmək tələbini rədd edən Həsən xanın nəvəsi Fətəli xan Qacar işğalçılara sərt və birmənalı cavab verdi: "Qalanı təs - lim etməkdənsə onun dağıntıları altında ölməyim yaxşıdır".[3] İrəvan qalasının qəhrəman müdafiəçisi Həsən xan Qacar isə son an-

[1]Шербатов М. Генерал-фельдмаршал князь Паскевич. Его жизнь и деятельность, т.II, СПб., 1890, с.122.

[2]Записки Алексея Петровича Ермолова (1816-1827), ч.II, Москва, 1868, с.214; Bax: bölmə 8, sənəd 3.

[3]Потто В.А. Кавказская война в отдельных очерках, эпизодах, легендах и биографиях, т.III, вып.1-4, СПб., 1886, с.304-305.

da qalanı düşmənə təslim etməkdənsə partlatmaq məqsədilə barıt qülləsinə yanan fitil qoymuşdu. Lakin poruçik Lemyakin bunu vaxtında görmüş və əli ilə yanan fitili götürmüşdü.

Lakin xəyanət öz işini gördü. Ermənilər İrəvan qalasını mühasirədə saxlayan Paskeviçlə əlaqəyə girdilər və azərbaycanlıların qalanın hansı hissəsində yerləşdikləri, top atəşlərini hara istiqamətləndirmək lazım olduğu barədə işğalçılara məlumat verdilər.[1]

Erməni xəyanətindən istifadə edərək İrəvan qalasını ələ keçirən və xanlığı işğal edən rus qoşunlarının baş komandanı Paskeviç bu "qələbəyə görə" qraf titulu,[2] 2-ci dərəcəli Georgi ordeni, 1 milyon rubl məbləğində pul mükafatı və İrəvan qalasının ələ keçirilməsinə görə "Erivanski" titulu aldı.[3] İrəvan qalasının alınması Sankt-Peterburqda bayram edildi və bu münasibətlə xüsusi rəsmi keçid düzənləndi. Bundan əlavə, İrəvan qalasının alınması münasibətilə xüsusi medallar təsis olundu [bax: bölmə 8, şəkil: 5,6].

İşğalçı Rusiya qoşunlarının İrəvanda törətdikləri dağıntılar və şəhərə vurduqları zərərlə bağlı V.Potto bu hadisənin canlı şahidinin dediklərini olduğu kimi qələmə alaraq yazırdı: "Qalanın cənub-şərq küncünə çatarkən divar və bürclərin dağıntısı məni heyrətə saldı. Mənə elə gəlir ki, rus mühasirə artilleriyasının dörd gündə etdiyini çərxi-fələk dörd əsrdə belə edə bilməzdi".[4]

Rusiya müstəmləkəçiləri İrana və Türkiyəyə qalib gəldikdən sonra, Türkmənçay (1828) və Ədirnə (1829) müqavilələrinə əsasən, Cənubi Qafqazda Qacarlar İranı və Osmanlı imperiyasına qarşı gələcək işğalçılıq planlarını həyata keçirmək üçün xristian — istinadgah məntəqəsi yaratmaq məqsədilə həmin dövlətlərin ərazisində yaşayan erməniləri kütləvi surətdə Şimali Azərbaycan torpaqlarına, əsasən İrəvan, Naxçıvan,* Qarabağ xanlıqlarının ərazisinə və indiki Gürcüstan Respublikasının məhz azərbaycanlılar yaşayan bölgələrinə köçürdü. İrəvan və Naxçıvan xanlıqlarını işğal etmiş general Paskeviç

[1]Ениколопов И. Грибоедов и Восток, Ереван, 1954, с.85-86.
[2]Шербатов М. Göstərilən əsəri, s.330.
[3]Потто В.А. Кавказская война в отдельных очерках, эпизодах, легендах и биографиях, т.III, вып.1-4, СПб., 1886, с.591.
[4]Потто В.А. Göstərilən əsəri, s.516.
* Naxçıvan azərbaycanlıları dəfələrlə üsyan qaldıraraq ermənilərin Naxçıvanda qərar tutmasına yol vermədilər.

İrandan köçürülən ermənilərin hansı Azərbaycan torpaqlarına istiqamətləndirilməsi barədə konkret göstəriş də vermişdi: köçürülən erməniləri İrəvan və Naxçıvan əyalətlərinə istiqamətləndirmək lazımdır ki, həmin ərazilərdə xristian əhalinin sayı mümkün qədər artırılsın.[1] Beləliklə, 1828-ci il fevralın 26-dan iyunun 11-dək, yəni üç ay yarım ərzində İrandan Şimali Azərbaycana — İrəvan, Naxçıvan və Qarabağ xanlıqlarının ərazisinə 8249 erməni ailəsi, başqa sözlə, ən azı 40 min nəfər erməni köçürüldü.[2] Bundan bir az sonra Şimali Azərbaycan torpaqlarına Osmanlı dövləti ərazisindən daha 90 min nəfərdən artıq erməni köçürülüb gətirildi.[3]

Ermənilərin İrandan və Türkiyədən Şimali Azərbaycan torpaqlarına köçürülüb gətirilməsi inkarolunmaz tarixi faktdır. Bunu çoxsaylı arxiv materialları, xüsusilə ermənilərin köçürülməsi prosesini tənzimləyən rəsmi dövlət sənədləri — təlimatlar çox aydın sübut edir.[4]

Ermənilər Şimali Azərbaycan torpaqlarına xüsusi məqsədlə, yəni onlara daimi vətən yaratmaq niyyəti ilə köçürülürdü. Bu çirkin siyasətin həyata keçirilməsində Rusiya ordusunda xidmət edən erməni zabitləri fəal iştirak edirdilər. Erməni generalları öz məqsədlərini açıq bəyan etməkdən də çəkinmirdilər. Bu qanlı siyasətin tezliklə həyata keçirilməsinə şəxsən rəhbərlik edən erməni mənşəli rus polkovniki Qazaros Lazaryan (Lazaryev) İran ərazisindən Şimali Azərbaycana köçürülən ermənilərə müraciətlə deyirdi: "… Orada (yəni Şimali Azərbaycanda — ***red.***) siz xristianların məskunlaşdırıldığı yeni vətən əldə edəcəksiniz… İranın müxtəlif əyalətlərinə səpələnmiş xristianların (yəni ermənilərin — ***red.***) bir yerə cəmləşdiyini görəcəksiniz. Tələsin! Vaxt qiymətlidir. Tezliklə rus qoşunları İranı tərk edəcək, bundan sonra sizin köçməyiniz çətinləşəcək və biz sizin təhlükəsiz köçməyinizə cavabdeh olmayacağıq. Azca itkiyə məruz qalsanız da, qısa za-

[1]Yenikolopov İ. Göstərilən əsəri, s.129-130.
[2]Глинка С.Н. Описание переселения армян аддербиджанских в пределы России. Москва, 1831. с.131.
[3]AKAK, т.VII, Тифлис, 1878, sənəd 829, c.845.
[4]AKAK, т.VII, sənəd 586, c.619-620; Qlinka S.N. Göstərilən əsəri, s.107.

manda hər şeyə nail olacaqsınız, özü də həmişəlik".[1] Daim köçəri həyat sürməyə, yerdəyişmələrə adət etmiş ermənilərə bu dəfə təlqin edilirdi ki, "İran çörəyi yeməkdənsə rus otu yemək daha yaxşıdır".[2]

Maraqlı və təkzibolunmaz tarixi faktlardan biri də budur ki, tanınmış rus rəssamı V.İ.Maşkov 1828-ci ildə ermənilərin Şimali Azərbaycan torpaqlarına köçürülməsinə ayrıca rəsm əsəri həsr etmişdi.



Ermənilərin İrandan Şimali Azərbaycan torpaqlarına köçürülməsi. 1828-ci il.
(Rus rəssamı V.İ.Maşkovun çəkdiyi şəkil).

Ermənilərin kütləvi surətdə köçürülüb gətirilməsinə baxmayaraq, çar hakimiyyət orqanları İrəvan xanlığı ərazisində demoqrafik vəziyyəti birdən-birə dəyişdirə bilmədi. İrəvan xanlığının işğalını həyata keçirmiş rus generalı Paskeviç, hətta ermənilərin köçürülüb gətirilməsindən sonra belə, İrəvan bölgəsi əhalisinin dörddə üç hissəsinin Azərbaycan türkləri olduğunu etiraf edirdi.[3] Yeri gəlmişkən, işğalçı general bu faktla hesablaşmağa məcbur olmuş, cüzi azlıq təşkil edən

[1]Qlinka S.N. Göstərilən əsəri, s.107-111.
[2]Qlinka S.N. Göstərilən əsəri, s.68-69.
[3]АКАК, t.VII, sənəd 438,s.888-491; bax: bölmə 9, sənəd 1.

gəlmə ermənilərə daha yaxşı şərait yaratmaq üçün canfəşanlıq edən, regionda böyük əksəriyyət təşkil edən yerli Azərbaycan türklərinin haqqını kobudcasına tapdalayan İrəvan Müvəqqəti İdarəsinin üzvü, erməni arxiyepiskopu Nersesi vəzifəsindən kənar edib Bessarbiyaya sürgün etdirmiş, buna şərait yaradan İrəvan Müvəqqəti İdarəsinin rəisi general Krasovskini isə vəzifəsindən kənar edib Rusiyaya qaytarmışdı.[1]

Tanınmış rus tədqiqatçısı N.Şavrov ermənilərin Cənubi Qafqaza köçürülməsi prosesini və köçürülüb gətirilmiş ermənilərin sayını araşdırdıqdan sonra 1911-ci ildə yazırdı: "Hazırda Cənubi Qafqazda yaşayan 1 milyon 300 min erməninin 1 milyondan çoxu bu diyarın yerli əhalisi deyil. Onları bura biz (yəni ruslar — ***red.***) köçürüb gətirmişik".[2]

Çar Rusiyası XIX əsrin 20-30-cu illərindən başlayaraq erməniləri Cənubi Qafqazdakı Azərbaycan torpaqlarına köçürüb gətirməklə bu regionun qədim tarixi dövrlərdən bəri davam edən ənənəvi etnik-siyasi və dini mənzərəsini zorla dəyişdirdi. Şimali Azərbaycanın İran və Türkiyə ilə sərhəd torpaqlarında Cənubi Qafqaz üçün tamamilə yad olan yeni xristian etnosu yerləşdirdi.

Rusiya müstəmləkəçiləri, çox çəkmədən, Azərbaycan xalqının tarixi dövlətçilik ənənələrini və müstəqillik şüurunu məhv etmək üçün inzibati-ərazi islahatları keçirməyə başladı. 1828-ci il martın 21-də — Azərbaycan xalqının Novruz bayramı günlərindən birində imperator I Nikolayın fərmanı ilə Azərbaycanın İrəvan və Naxçıvan xanlıqları ləğv edildi və bu xanlıqların ərazisində İran və Türkiyədən köçürülməkdə olan ermənilər üçün qondarma "Erməni vilayəti" yaradıldı.[3] Bununla Cənubi Qafqazdakı Azərbaycan torpaqlarında, daha

[1] Парсамян В.А. История армянского народа, т.I. Ереван, 1972, с.72.
[2] Шавров Н.Н. Новая угроза русскому делу в Закавказье: предстоящая распродажа Мугани инородцам. СПб., 1911, с.63.
[3] Полное собрание законов Российской империи, (ПСЗРИ) Собр. второе, т.III. 1828, СПб., 1830. с.272-273; АКАК т.VII, д.437.с.487; bax: bölmə 9, sənəd 2.

doğrusu, İrəvan xanlığının ərazisində erməni dövləti yaratmaq üçün ilk addım atıldı. Yeri gəlmişkən, 1828-ci ildə, özü də ermənilərin köçürülmə kampaniyası başa çatdırıldıqdan sonra "Erməni vilayəti"ndə olan 1125 kəndin 1111-də ancaq Azərbaycan türkləri yaşayırdı.

Azərbaycan xalqının qədim dövlətçilik ənənələrini və müstəqillik şüurunu məhv etmək üçün 1840-cı ildə daha bir addım atıldı: "Erməni vilayəti" ləğv edildi və onun ərazisində bir neçə qəza yaradıldı: İrəvan, Yeni Bayazid, Gümrü, Sürməli və s. 1849-cu ildə isə həmin Azərbaycan torpaqlarında yeni inzibati-ərazi vahidi — İrəvan quberniyası yaradıldı. İrəvan quberniyasının yaradılması, əslində, Qərbi Azərbaycan ərazisində ermənilər üçün dövlət yaradılması yolunda növbəti addım idi. Bundan sonra ermənilərin İran və Türkiyədən İrəvan quberniyası ərazisinə, həmçinin digər Azərbaycan torpaqlarına köçürülməsi prosesi daha da sürətləndirildi.

Ermənilərin köçürülməsindən sonra Cənubi Qafqaz qanlı qırğınlar dövrünə qədəm qoydu. Rusiya müstəmləkəçiləri tərəfindən silahlandırılan və hərtərəfli müdafiə olunan erməni quldur dəstələri Azərbaycan xalqına qarşı, ümumiyyətlə Cənubi Qafqazın türk-müsəlman əhalisinə qarşı soyqırımlarına başladılar. Böyük dövlətlər özlərinin Cənubi Qafqazla bağlı geosiyasi planlarını həyata keçirmək üçün ermənilərdən bir alət kimi istifadə etdilər və bunun müqabilində onlara tarixi Azərbaycan torpaqlarında — keçmiş İrəvan və Naxçıvan xanlıqlarının ərazisində dövlət yaratmaqdan ötrü hər cür köməklik göstərdilər.

Nəhayət, 1918-ci il mayın 29-da yenicə elan olunmuş Azərbaycan Xalq Cümhuriyyəti hökuməti, öz xalqının iradəsini nəzərə almadan, böyük dövlətlərin təzyiqi ilə qədim Azərbaycan şəhəri İrəvanı ətrafındakı təqribən 9,5 min kv.km torpaqla birlikdə ermənilərə güzəştə getdi. Başqa sözlə, Vətən torpağından düşmənə pay verildi. Və pay verilmiş həmin Şimali Azərbaycan torpağında — keçmiş İrəvan xanlığının ərazisində erməni dövləti yaradıldı.

**29 may 1918-ci il!** — Bu tarix Şimali Azərbaycan ərazisində, ümumiyyətlə, Cənubi Qafqazda tarixdə ilk dəfə erməni dövlətinin yaradıldığı gündür. Hamıya məlum olan tarixi faktdır ki, bundan əvvəl heç zaman Cənubi Qafqaz ərazisində ümumiyyətlə erməni dövləti olmamışdır.

Çar Rusiyası tərəfindən işğal olunmuş Azərbaycan torpağında — İrəvan və Naxçıvan xanlıqlarının ərazisində erməni vilayətinin yaradılmasından dərhal sonra Azərbaycan tarixinin amansızcasına saxtalaşdırılmasına başlanıldı. Erməni millətçiləri öz havadarları olan Rusiya işğalçılarının yaxından iştirakı və köməyi ilə saxta erməni tarixi yaratmağa başladılar. Bütün arxiv sənədləri, hətta Rusiya imperiyasının Azərbaycan xanlıqları, İran və Türkiyə ilə bağladığı müqavilələrin adları və mətnləri də saxtalaşdırıldı. Rusiya və Sovet İttifaqının ali rəhbərliyində, dövlət və hökumət strukturlarında mühüm mövqelər ələ keçirmiş ermənilər öz məqsədlərinə asanlıqla nail oldular. Nəticədə XIX əsrin 20-30-cu illərindən başlayaraq Rusiya tərəfindən Cənubi Qafqaza kütləvi surətdə köçürülüb gətirilmiş gəlmə ermənilər bu regionun "ən qədim yerli əhalisi", ata-baba torpaqları əllərindən alınıb ermənilərə paylanmış yerli azərbaycanlılar isə "gəlmə", "köçəri yırtıcılar" kimi qələmə verilməyə başlandı. Erməni millətçiləri bütün dünyaya Azərbaycan və azərbaycanlılar haqqında dayanmadan saxta və qəsdən təhrif olunmuş informasiyalar yaydılar.*

Bəzi faktlara müraciət edək.

Tarixi həqiqət belədir ki, 1805-ci ildə Rusiya ilə Azərbaycan dövləti olan Qarabağ xanlığı arasında Kürəkçay sazişi adlanan saziş bağlanmışdı. Sazişin adı belədir: *"Трактат между Карабахским ханом и Российской империей о переходе ханства под власть России от 14 мая 1805 года".*[1] Həmin sazişə görə, Qarabağ xanlığı Rusiyanın himayəsini qəbul edir, Rusiya isə Qarabağ xanlığına daxil olan torpaqların İbrahimxəlil xana, daha doğrusu, Azərbaycana məxsus olduğunu və gələcəkdə də Qarabağ xanının varislərinə məxsus olaraq qalacağını təsdiq edirdi.[2] Erməni tarixçiləri isə real tarixi və Kürəkçay müqaviləsini saxtalaşdıraraq Qarabağ xanlığı ərazisinin guya ermənilərə məxsus olduğunu və Kürəkçay müqaviləsinin

[1] АКАК t.II, sənəd 1436, s.702-705.
[2] Əlavə məlumat üçün bax: Кюрекчайский договор — 200. Баку, 2005.
* Hətta hazırda vaxtı ilə müxtəlif internet saytlarında yerləşdirilən İrəvan xanlığına məxsus maddi-mədəniyyət nümunələrini də saytlardan çıxarırlar.

də guya ermənilərlə Rusiya arasında bağlandığını iddia edirlər. Halbuki ermənilərin İran və Türkiyədən Azərbaycana, o cümlədən Qarabağ xanlığının ərazisinə köçürülməsinə Kürəkçay sazişinin imzalandığı 1805-ci ildən çox sonra — 1828-ci ildə başlanmışdı. Və gəlmə Qarabağ erməniləri 1978-ci ildə özlərinin İrandan bura, yəni Qarabağa köçürülməsinin 150 illiyini bayram etmiş, bu münasibətlə Dağlıq Qarabağda — Ağdərə rayonunun Marquşevan kəndində bir xatirə abidəsi də inşa etmişdilər. 1988-ci ildə erməni separatçı-terrorçu dəstələri "tarixi həqiqətin izini itirmək" məqsədilə ermənilərin Qarabağa gəlmə etnos olduğunu təsdiq edən bu abidəni dağıtmışlar. Hazırda həmin abidənin qalıqları Azərbaycan Respublikasının Ağdərə rayonu ərazisindədir.



Ermənilərin İrandan Şimali Azərbaycan torpaqlarına köçürülməsinin 150 illiyi münasibətilə qoyduqları **“Marağa — 150”** abidəsi. Ağdərə rayonu. Azərbaycan Respublikası, 1978-ci il



Həmin abidənin ermənilərin köçürülməsi tarixini göstərən **“Marağa — 150”** hissəsinin ermənilər tərəfindən 1988-ci ildə söküldükdən sonrakı görünüşü

Digər bir fakt: XIX əsrin əvvəlində Rusiya imperiyası Cənubi Qafqazı işğal etməyə başlayanda burada heç bir erməni dövləti yox idi. Cənubi Qafqazda Azərbaycan xanlıqları hökmranlıq edirdi. Regionda Azərbaycan xanlıqlarından başqa bir də gürcü çarlığı vardı. O zaman indiki Ermənistan Respublikasının yerləşdiyi ərazidə Azərbaycan dövləti olan İrəvan xanlığı yerləşirdi. Və 1826-1828-ci illər Rusiya — İran müharibəsi başa çatdıqdan sonra, Türkmənçay müqaviləsinə (1828) əsasən, Azərbaycanın iki xanlığı — İrəvan xanlığı və Naxçıvan xanlığı Rusiya imperiyasına qatıldı. Bu tarixi fakt 1828-ci il Türkmənçay müqaviləsinin bütün mətnində və məzmununda da öz əksini tapmışdır.[1] Konkret olaraq müqavilənin III maddəsində məhz İrəvan xanlığının və Naxçıvan xanlığının Rusiya imperiyasına ilhaq olunduğu qeyd edilir:


**Ст. III.** Его Величество Шахъ Персидскій отъ своего имени, и отъ имени своихъ Наслѣдниковъ и преемниковъ, уступаетъ Россійской Имперіи въ совершенную собственность Ханство Эриванское по сю и по ту сторону Аракса, и Ханство Нахачиванское. Въ слѣдствіе сей уступки, Его Величество Шахъ обѣщаетъ, не позже 6 мѣсяцевъ, считая отъ подписанія настоящаго договора, сдать Россійскимъ Начальствамъ всѣ архивы и публичные документы, относящіеся до управленія обоими вышеозначенными Ханствами.

Müqavilənin nə bu maddəsində, nə də digər maddələrində — heç yerdə "Ermənistan" sözü yoxdur. Və ola da bilməzdi. Çünki o zaman Cənubi Qafqazda "Ermənistan" adlanan ərazi və ya dövlət yox idi. Erməni "tarixçiləri" bütün bu real tarixi faktları saxtalaşdıraraq

[1]Bax: ПСЗРИ, т.III. 1828, СПб., 1830, s.125-126.

İrəvan və Naxçıvan xanlıqlarının Rusiya tərəfindən işğal olunması faktını bütün dünyaya guya "Ermənistanın Rusiyaya birləşdirilməsi" kimi təqdim edirlər. Buna xüsusi niyyətlə düşünülmüş saxtakarlıqdan başqa nə ad vermək olar?!

Daha bir fakt: erməni alimləri tarix elmini akademik səviyyədə saxtalaşdırırlar. Məsələn, erməni tarixçisi akademik S.P.Ağayan böyük Azərbaycan mütəfəkkiri A.A.Bakıxanova həsr etdiyi əsərdə XVIII əsr Şimali Azərbaycan xanlıqlarının xəritəsini vermişdir.[1]

Lakin erməni akademiki həmin xəritəyə saxtakarlıq edərək Şimali Azərbaycan xanlıqlarından birinin — məhz İrəvan xanlığının ərazisini daxil etməmişdir:




Карта ханств Северного Азербайджана во II половине XVIII века (Из книги проф. П. И. Ковалевского „Завоевание Кавказа Россией", С ПБ, 1811).

[1]Агаян Ц.П. А.Бакиханов. Баку, 1948, с.9.

Ağayan öz əsərində, özü də həmin xəritənin altında verdiyi qeyddə yazır ki, göstərilən xəritəni guya P.İ.Kovalevskinin "Qafqazın Rusiya tərəfindən işğalı"[1] əsərindən olduğu kimi götürüb öz əsərinə daxil etmişdir. Bununla Ağayan oxuculara yalan satır, həm də peşəkar saxtakar olduğunu sübut edir. Çünki, P.İ.Kovalevskinin əsərindəki xəritədə Şimali Azərbaycan xanlıqlarının hamısının əraziləri, o cümlədən İrəvan xanlığının ərazisi də öz əksini tapmışdır.




Erməni tarixçisi akademik S.P.Ağayanın təqdim etdiyi xəritənin əksinə olaraq P.İ.Kovalevskinin "Qafqazın Rusiya tərəfindən işğalı" əsərində Şimali Azərbaycan xanlıqlarının təsvir olunan xəritəsi

Göründüyü kimi, erməni akademiki öz xalqına "xidmət etmək üçün" tarixi həqiqəti təhrif etməklə yanaşı, rus alimi P.İ.Kovalyevskinin xəritəsini saxtalaşdırmaqdan da çəkinməmişdir…

Azərbaycan Milli Elmlər Akademiyası Tarix İnstitutunun müəlliflər heyəti tərəfindən hazırlanmış "İrəvan xanlığı: Rusiya işğalı və ermənilərin Şimali Azərbaycan torpaqlarına köçürülməsi" kitabı bütün bu saxtakarlıqları ifşa etmək, dünyaya elmi həqiqəti, daha doğrusu real tarixi olduğu kimi çatdırmaq məqsədilə yazılmışdır. Beləliklə, kollektiv tədqiqat əsəri olan həmin kitab daha bir erməni saxtakarlığının üstünü açır. Təkzibolunmaz ilk mənbələr, o cümlədən çoxsaylı arxiv sənədləri əsasında yazılmış "İrəvan xanlığı: Rusiya işğalı

[1]Ковалевский П.И. Завоевание Кавказа Россией. (Исторический очерк), СПб., (без выходных данных). с.65, 113.

və ermənilərin Şimali Azərbaycan torpaqlarına köçürülməsi" kitabı sübut edir ki, bu gün Ermənistan Respublikası adlanan dövlətin yerləşdiyi ərazi yaxın keçmişə qədər, bütün tarix boyu həmişə Azərbaycan torpağı olmuşdur. XIX əsrin əvvəllərində həmin ərazidə Azərbaycan dövləti olan İrəvan xanlığı yerləşirdi. Yalnız 1828-ci ildə Rusiya ordusu tərəfindən bu Azərbaycan xanlığı işğal olunduqdan sonra ermənilər Türkiyədən və İrandan Şimali Azərbaycana köçürülüb gətirildilər. Və bu gün Ermənistan Respublikasının yerləşdiyi ərazi 180 il bundan əvvəl Azərbaycan torpağı idi. Bu torpağın aborigen əhalisi azərbaycanlılar idi. Ermənilər isə Cənubi Qafqaza gəlmə, daha doğrusu, gətirilmə etnosdur. Bu etnosun yaşadığı "Ermənistan Respublikası" adlanan ərazi isə Azərbaycan torpağıdır. Azərbaycan xalqı yaşadıqca, bu həqiqət də yaşayacaqdır.

***

*"İrəvan xanlığı: Rusiya işğalı və ermənilərin Şimali Azərbaycan torpaqlarına köçürülməsi"* kitabının işıq üzü görməsi gərgin elmi axtarışlar və böyük zəhmət bahasına başa gəlmişdir. Kitabın müəllifləri tarixi həqiqəti üzə çıxarmaq üçün ilk mənbələr üzərində yorulmadan işləmişlər. Redaksiya heyətinin üzvləri kitabda verilən faktları ilk mənbələr və elmi ədəbiyyatla təkrar-təkrar yoxlamalı olmuşlar. Əsərin işıq üzü görməsində zəhməti olanların və bu gərəkli işdə iştirak edənlərin hamısı ən xoş sözlərə layiqdir. Lakin uzun sürən və çox ağır redaktə prosesində elmi həqiqət axtarışı naminə verilən bütün tapşırıqları xüsusi məsuliyyətlə yerinə yetirən, ilk mənbələri ələk-vələk edib olduqca maraqlı faktlar aşkara çıxaran, elmi şərhlərlə və tərtib etdiyi cədvəllərlə bu qiymətli əsərin yüksək səviyyədə çıxması üçün əlindən gələni əsirgəməyən tarix elmləri namizədi Güntəkin Nəcəflinin zəhmətini ayrıca qeyd etməyi özümə borc bilirəm.

Azərbaycan Milli Elmlər Akademiyasının Tarix İnstitutu kitabın ərsəyə gəlməsi üçün köməyini əsirgəməyən hər kəsə, o cümlədən

institutun əməkdaşları t.e.n. Tofiq Nəcəfliyə, Aynur Əmənovaya, Sərlan Həsənova, Milli Arxiv İdarəsinin rəisi, t.e.d. Ataxan Paşayev başda olmaqla "Elmi məlumat kitabxanası" şöbəsinin əməkdaşlarına, AMEA Mərkəzi elmi kitabxanasının müdiri, fil.e.n. Aybəniz xanım Kəngərli başda olmaqla kitabxananın bütün əməkdaşlarına, BDU-nun elmi kitabxanasının müdiri Sara xanım İbrahimova başda olmaqla "Nadir fond"un və "Şərq bölməsi"nin əməkdaşlarına, M.F.Axundov adına Milli Dövlət kitabxanası "Nadir fond" şöbəsinin əməkdaşlarına, t.e.d. Fəzail Ağamalı, Əvəz Ələkbərov və b. həmvətənlərimizə dərin minnətdarlığını bildirir.

AMEA-nın Tarix İnstitutu *"İrəvan xanlığı: Rusiya işğalı və ermənilərin Şimali Azərbaycan torpaqlarına köçürülməsi"* kitabının çapını öz üzərinə götürən və bu gərəkli əsərin nəfis tərtibatda nəşri üçün əlindən gələni əsirgəməyən Regionların İnkişafı İctimai Birliyinə ayrıca minnətdarlıq etməyi özünə borc sayır.

Yaqub MAHMUDOV,

əməkdar elm xadimi,
AMEA-nın müxbir üzvü,
tarix elmləri doktoru, professor

Böyük Azərbaycan sərkərdəsi Nadir şahın yaratdığı Əfşar* imperatorluğunun dağılmasından sonra tarixi Azərbaycan torpaqlarında yaranmış yerli dövlətlərdən — Azərbaycan xanlıqlarından biri də İrəvan** xanlığı*** idi. İrəvan xanlığı Şimali Azərbaycanın qərbində — keçmiş Səfəvi imperatorluğunun inzibati-ərazi vahidlərindən biri olan Çuxursəd bəylərbəyliyinin ərazisində yaranmışdı.

İrəvan xanlığının ərazisini əhatə edən Çuxursəd**** vilayətinin adı ilə bağlı elmi fikirlərin hamısı həmin bölgənin adının qədim Azərbaycan türk tayfalarının adından götürüldüyünü təsdiqləyir. Bu, inkarolunmaz tarixi faktdır ki, Azərbaycan tayfalarından biri olan Sədli və ya Sədlilər Qaraqoyunlu tayfa birliyinə daxil idi. Dövrə aid mənbədə Əmir Teymurun yürüşlərindən bəhs olunarkən Əmir Səədin Çuxursəd hakimi olduğu qeyd olununur [91, 17-18]. "Sədli" etnoniminin XIV əsrdə yaşamış Qaraqoyunlu tayfa başçısı Əmir Səədin adından götürülməsi faktını erməni mənşəli C.Bornoutyan da təsdiq edir [200, 2].

1411-ci ildə dünyasını dəyişmiş Sədli hakimi Əmir Səəd İrəvan yaxınlığında dəfn olunmuşdur [164,139]. Əmir Səədin ölümündən sonra Çuxursəd vilayətinin hakimi onun oğlu Pirhüseyn oldu [164, 139].

* Əfşarlar Azərbaycan xalqının təşəkkülündə iştirak etmiş qədim türk tayfalarından biridir. Hazırda əfşarların nəsilləri Azərbaycan, Türkiyə və İran ərazisində yaşayır. Nadir şah əfşarların Qırxlı oymağından idi [bax: 196,24,191].

**Qədim Urartu tarixinə şərik çıxmağa çalışan erməni müəllifləri "İrəvan" toponiminin əsassız olaraq Urartu mənbələrində adı çəkilən "Yerebuni" qalasının adından götürülməsi fikrini irəli sürürlər. XIX əsr rus müəllifi İ.Zelinski isə "İrəvan" toponimini həm ermənilərin qondarma "Nuh əfsanəsi" ilə bağlı "yerevum" — "görünən", həm də tatarların (Azərbaycan türkləri — ***red.***) "teçet" "axan", "rəvan" mənasında işlətdiyini qeyd edir [82,1]. Lakin bu fikirlər elmi əsasa söykənmir. "İr" toponiminin erməni dilində izahı yoxdur. İr ("Yer") qədim türk sözü olub "Yerin günəşə baxan üzü"nə deyilir [7,218]. Bəzi tədqiqatçıların fikrincə, "İrəvan" toponimi türk dillərindəki "İr" "dağın gündüşən tərəfi", "dalğavari dağ zirvəsi" və farsca "van" "yer" sözlərindən ibarətdir [bax: 110, 270]. İrəvan toponiminin qədim türk teonimlərindən (ilahi adlar) törənən etnik adlar sırasına daxil edilməsi və onun qədim türklərin İr ("Yer") Tanrısı ilə eyniləşdirilməsi fikri daha düzgündür [bax: 111,28].

***Nadir şah 1747-ci il iyunun 19-dan 20-nə keçən gecə qətlə yetirildikdən sonra tarixi Azərbaycan torpaqlarında 20-dən çox xanlıq və sultanlıq adlanan xırda dövlətlər yarandı. O zaman Azərbaycanın şimalında Dərbənd, Quba, Bakı, Şamaxı, Cavad, Salyan, Lənkəran, Şəki, Gəncə, Qarabağ, qərbində Naxçıvan, İrəvan, cənubunda Ərdəbil, Sərab, Zəncan, Təbriz, Qaradağ, Urmiya, Xoy, Marağa və Maku xanlıqları yaranmışdı.

****Bəzi məlumatlara görə, Çuxursəd vilayətinin adı hələ e.ə. VII yüzillikdə burada məskunlaşmış türk mənşəli Sak tayfalarının adı ilə bağlı olub əvvəllər "Saka Yurdu" — Saka Çuxuru, orta əsrlərdə isə "Çuxursəd ölkəsi" adlanmışdır [bax: 190,19].

Pirhüseynin dövründə də İrəvan (Rəvan) qalası əmirliyin paytaxtı idi [164,139-140].

Əmir Səədin hakimiyyəti altında birləşmiş Azərbaycan-türk tayfaları XIV əsrin sonlarından başlayaraq **Sədli** adlandı. Elə bu dövrdən də Şimal-Qərbi Azərbaycanın Arazyanı **Sürməli** vadisindəki ərazisi (indiki Ermənistan Respublikasının Yerashadzor* kəndi və onun ətrafı) **Çuxursəd** ( چخورسعد ) adlanmağa başladı [164,140]. Çuxursədin tarixi Azərbaycan torpağı olduğunu erməni mənbələri də təsdiq edir. Erməni mənbələri buranı ***"Sahata pos"*** — *"Səhədin çuxuru"*, yaxud da ***"Yerkrin Sahat"*** — ***"Səhədin ölkəsi"*** adlandırırlar [214,26; 164,140].

Çuxursəd toponimi rəsmi sənədlərdə ilk dəfə 1428-ci ildə Üçkilsə (Valarşabad) kəndinə sahibliklə bağlı ərəbdilli sənəddə xatırlanır [164,140]. Arpaçayın Arazla qovuşduğu yerdən Naxçıvan və Arazın sağ sahilində yerləşməklə Ağrıdağa qədər əraziləri əhatə edən Sürməli Sədli tayfasının qədim yurdu idi. XV əsrdə Arazboyu torpaqları əhatə edən və Ağrıdağla Alagöz dağları arasındakı vadi də Sədli oymağına daxil idi. Teymuri tarixçisi Hafiz Ebru Sultan Şahruxun Azərbaycana yürüşlərindən bəhs edərkən Naxçıvan və Sürməli bölgəsinin Səədli oymağının qədim yurdu olduğunu qeyd etmişdir [18,562; 195,22]. Bu vadi böyük bir çuxura bənzədiyinə görə ona el arasında ***"Çuxur"*** da deyirdilər. İrəvan vilayətinin düzənlik bölgəsində yaşayan azərbaycanlılar çox sonralar — XVIII - XIX əsrlərdə də bu vadini ***Səhəd Çuxuru*** adlandırmaqda davam edirdilər [44, 11-12].

1410-cu ildə Azərbaycan sülaləsi Qaraqoyunlular Təbrizdə hakimiyyətə gələrkən Sədlilər sülaləsi İrəvan bölgəsinin sahibi idi. Bunu bölgədən tapılan maddi-mədəniyyət nümunələri də təsdiq edir [bax: bölmənin sonu, şəkil: 1, 2, 3, 4]. 1420-ci ildə Qaraqoyunlu taxtına çıxan İsgəndər onun taxt-tac rəqibi olan qardaşı Əbu Səidin tərəfini saxladıqları üçün Əmir Pirhüseynin xələflərini vilayətin idarəçiliyin-

* Yerashadzor (Երասխաձոր) kəndinin adı Azərbaycan dilindən erməncəyə tərcümə olunub və mənası "Arazyanı çuxur", "Arazyanı dərə" deməkdir.

dən kənarlaşdırmış və Çuxursədin idarəsini birbaşa mərkəzi hakimiyyətə tabe etmişdi [164,142]. Bu zaman Çuxursəd vilayəti şimalda Gürcüstanla (Gürcüstan 1469-cu ildə parçalandıqdan sonra Kartli çarlığı ilə), şərqdə Qarabağ vilayəti ilə, qərbdə Samsxe-Saatabaqo,* Pasin, Ələşgird və Bayazidlə, cənubda isə Naxçıvan, Qapan və Maku ilə həmsərhəd idi.

Tarixi şəraitdən asılı olaraq Çuxursəd vilayətinin sərhədləri dəfələrlə dəyişmişdir.

Qaraqoyunluların hakimiyyəti dövründə Çuxursəd vilayətinin tarixində sonralar bütün Azərbaycan üçün son dərəcə ağır problemlər yaradan bir hadisə də baş verdi: Qaraqoyunlu hökmdarı Cahanşahın icazəsi ilə 1441-ci ildə erməni katolikoslarının fəaliyyət mərkəzi Kilikiyanın Sis şəhərindən Azərbaycana — İrəvan yaxınlığındakı Üçkilsə (Üçmüədzin**) monastırına köçürüldü [51,87;138,255]. Bununla Cənubi Qafqazda qriqorianlığı yayan erməni missionerləri üçün əlverişli şərait yarandı. Qaraqoyunlu hökmdarları erməni katolikoslarını himayə etdilər və onlara sərbəstlik verdilər. Bu vaxtdan Azərbaycanın Çuxursəd diyarında yerləşən Üçkilsə bütün ermənilərin dini mərkəzinə çevrildi.

Qaraqoyunlulardan sonra Ağqoyunlulara sığınan Üçkilsə katolikoslarının mövqeyi daha da möhkəmləndi. Beləliklə, Azərbaycan ərazisində — Çuxursəd diyarında Azərbaycan Qaraqoyunlu, Ağqoyunlu hökmdarlarının icazəsi ilə erməni kilsələri tikildi.

XVI əsrin əvvəlində mərkəzi Təbriz şəhəri olan mərkəzləşdirilmiş Azərbaycan Səfəvi dövləti yarandı. Azərbaycanın başqa bölgələri ki-

* Samsxe-Saatabaqo bölgəsinin adı Azərbaycan dilindən gürcü dilinə tərcümə olunub və mənası "Üçqala-Atabəy yurdu" deməkdir.

** Ermənilər tərəfindən saxtalaşdırılaraq "Eçmiədzin" adlandırılan bu məbədin (sonralar kilsənin) adının erməni dilində heç bir mənası olmadığından erməni müəllifləri uzun-uzadı izahlardan istifadə edirlər [bax: 51, 374]. Üçkilsə və ya Üçmüədzin qədim Azərbaycan-Alban monastırı idi. Sözün tərkibindəki "üç" Azərbaycan türkcəsində say, "müədzin" isə ərərəb dilində "azan verən" deməkdir. Matenadaranda saxlanılan orta əsrlərə aid alqı-satqı sənədlərində də məbədin adı "Üçkilsə" şəklində yazılır [bax: 72; 73].

mi, Çuxursəd də Səfəvi dövlətinin tərkibinə daxil oldu [[bax: bölmənin sonu, şəkil: 6, 7, 8, 9]. XVI əsrin 30-cu illərində Azərbaycan Səfəvi dövlətinin ərazisi inzibati cəhətdən 13 vilayətə — bəylərbəyiliyə bölündü. Bunlardan biri də mərkəzi İrəvan (Rəvan) qalası olan Çuxursəd bəylərbəyiliyi idi.

Çuxursəd bəylərbəyiliyinə Maku, Sədərək, Naxçıvan (XVII əsrin əvvəllərindən) vilayətləri, Zaruzbilə, Bayazid qalası, Şadılı tayfasına məxsus torpaqlar, Osmanlı fəthləri zamanı bu bölgələrə köçürülmüş Dümbuli kürdlərinin yaşadıqları torpaqlar* və Mağazberd daxil idi [174, 14]. Çuxursəd bəylərbəyiliyini Səfəvi şahlarının təyin etdikləri iki Azərbaycan tayfasının — ustaclı və rumlu tayfalarının nümayəndələri idarə edirdi.

Çuxursəd bəylərbəyiliyini Osmanlı imperatorluğu ilə həmsərhəd olduğu üçün həmişə tanınmış Azərbaycan türk sərkərdələri idarə etmişlər. Belə ki, Çuxursəd bəylərbəyiliyinin Həsən bəy Rumlunun "Əhsən-üt təvarix" əsərində 1538-ci ildə xatırlanan ilk bəylərbəyi Bədir xan Ustaclı olmuşdu. Sonra onu Şahqulu Sultan Ustaclı əvəz etmişdi. 1554-cü ildə Sultan Süleyman Qanuni İrəvana yürüş edərkən Çuxursəd bəylərbəyi Hüseyn xan Rumlu idi. Ondan sonra həmin vəzifəyə Şahqulu Sultan Ustaclı təyin olunmuşdu. Daha sonra onu Məhəmməd xan Toxmaq Ustaclı və başqaları əvəz etmişlər [174, 121-122; 170, 52-53].

XVI əsrin əvvəllərindən başlayaraq Səfəvi — Osmanlı sərhədində yerləşən Çuxursəd bəylərbəyiliyinin tarixində ən ağır dövr başlandı. Bəylərbəyiliyin ərazisi və onun mərkəzi olan İrəvan qalası öz aralarında qanlı müharibələr aparan iki qardaş türk imperiyaları olan Səfəvilərlə Osmanlılar arasında müharibə meydanına çevrildi, dəfələrlə

---

*Çuxursəd bəylərbəyliyi ərazisində məskunlaşdırılan kürd tayfaları bu yerlərə Osmanlı sultanları tərəfindən XVI əsrin sonlarında Diyarbəkr və Dəclə çayı sahillərindən köçürülmüşdü. Osmanlı sultanları kürdləri sünni olduqları üçün Səfəvi — Osmanlı müharibələri zamanı buradan ***köçməyə məcbur olmuş şiə məzhəbli Azərbaycan türklərinin — qızılbaşların torpaqlarında yerləşdirdilər.*** "Diyarbəkrdən və s. yerlərdən sünni məzhəbli "Kurmanc" adlanan Dəclə kürdləri … Maku, İrəvan və Naxçıvan bölgələrinə gətirilərək buradan köçmüş Qızılbaş-türkmənlərdən və Oyrat xalqından boşalan kənd və qəsəbələrə yerləşdirildi" [bax: 17; 192, 437-438].

əldən-ələ keçdi. 1590-cı il İstanbul sülh müqaviləsinə əsasən, Çuxursəd bəylərbəyiliyi Osmanlı idarəçiliyinə keçdi, bu zaman bəylərbəyiliyin inzibati-ərazi quruluşu dövrün mənbəsində — 1590-cı il tarixli "Müfəssəl dəftər"ə görə aşağıdakı kimi təqdim olunur: Çuxursəd bəylərbəyliyinin ərazisi iki livaya — İrəvan və Naxçıvan livalarına bölünmüşdü. İrəvan livasına 10 nahiyə daxil idi: İrəvan, Qərbi, Gərni, Vedi, Aralıq, Talın, Ərmus, Abnik, Abaran, Şərabxana. Naxçıvan livası isə 16 nahiyədən (Ağcaqala, Məvaziyi-Xatun, Mülki-Arslanlı, Qarabağ, Dərəşam, Dərəşahbuz, Bazarçayı, Şərur, Zar, Zəbil, Əlincə, Sisyan, Azadciran, Ordubad) və 1 qəzadan — Naxçıvan qəzasından (sancağından) ibarət idi [6; 8-9]. 100 ildən çox davam edən Səfəvi-Osmanlı müharibələri 1639-cu ildə Qəsri-Şirin müqaviləsi ilə başa çatdı. İki imperiya arasında 1723-cü ilə kimi davam edən uzunmüddətli sülh dövrü başlandı. Yaranmış əmin-amanlıq Çuxursəddə sosial-iqtisadi inkişafa müsbət təsir göstərdi.

Çuxursəd bəylərbəyiliyini əvvəlki kimi yenə Səfəvi hökmdarlarının təyin etdikləri hakimlər idarə edirdi. Bölgəni osmanlılardan azad edən I Şah Abbas (1587-1629) bu döyüşlərdə göstərdiyi igidliyə görə "Sarı Aslan" ləqəbini almış Əmirgünə xan Qacarı* Çuxursəd (İrəvan) bəylərbəyi təyin etdi. 1625-ci ildə Əmirgünə xanın ölümündən sonra bu vəzifəyə onun oğlu, I Şah Abbasın ən tanınmış sərkərdəsi Təhmasibqulu bəy Qacar təyin edildi [105,155-156; 174,125]. Bütün XVII əsr ərzində bu bölgənin idarəçiliyi Azərbaycanın qədim tayfası olan Ağcaqoyunlu Qacarların əlində qaldı.

1663-cü ildə II Şah Abbas (1642-1666) keçmiş Çuxursəd hakimi Əmirgünə xanın oğlu Abbasqulu xanı İrəvana hakim təyin etdi. O, Çuxursəd bəylərbəyiliyini XVII əsrin 70-ci illərinin əvvəlinə kimi idarə etdi. Onu bu vəzifədə islamı qəbul etmiş gürcü əsilli Səfi xan əvəz etdi. Səfi xanın ölümündən sonra Çuxursəd bəylərbəyiləri Səfiqulu xan Alxas Mirzə oğlu və Səfiqulu xan Rüstəm oğlu oldular [bax:104,100-101; 105,156; 164,111; bax: bölmənin sonu, əlavə: 1].

*Əmirgünə xan Azərbaycanın qədim Ağcaqoyunlu Qacar tayfasından idi [bax: 174,125; 196,186-187].

Bu iki bəylərbəyinin zamanında əhalinin vəziyyəti xeyli ağırlaşdı. Nəticədə iki il məvacibsiz qalan Qacar və Bayat tayfalarından olan döyüşçülər 1677-ci ildə Səfiqulu xana qarşı üsyana qalxdılar [181,195-196]. Vəziyyəti nəzərə alan Şah II Səfi (Süleyman) (1666-1694) Çuxursəd bəylərbəyiliyinə özünün etibarlı adamlarından biri olan Zal xanı təyin etdi. Onun hakimiyyəti illərində — XVII əsrin son rübündə bütün Yaxın Şərq ölkələri kimi, Səfəvi dövləti də dərin tənəzzül dövrünü yaşayırdı. Bu, Çuxursəd bəylərbəyiliyi üçün də təsirsiz qalmadı. Bununla belə, Azərbaycanın bir çox yerlərində olduğu kimi, Çuxursəddə də ənənəvi iqtisadi həyat davam etməkdə idi. Vilayətin mərkəzi İrəvan şəhəri Osmanlı imperiyasının ticarət mərkəzlərini Tiflis, Gəncə, Şamaxı və İsfahan şəhərləri ilə əlaqələndirən ticarət yollarının qovşağında yerləşirdi [187,28]. İrəvan digər Azərbaycan şəhərləri ilə daha geniş ticarət əlaqəsi saxlayırdı. "İrəvana hər yerdən tacirlər gəlir, istədiklərini alıb aparırdılar…" [187,28].

Səfəvi — Osmanlı müharibələri nəticəsində Çuxursədin tarixi sərhədlərində ciddi dəyişiklik baş verdi. 1635-1639-cu illər Səfəvi — Osmanlı müharibələri nəticəsində Çuxursəd bəylərbəyiliyi öz ərazisinin təqribən yarısını itirdi. XIV-XVI əsrlərdə ona məxsus ərazilərdən yalnız İrəvan və Şərqi Şörəyel bəylərbəyiliyin əlində qaldı. I Şah Abbasın ölümündən sonra da Çuxursədin ərazisində dəyişikliklər baş verdi. Belə ki, I Şah Səfi 1629-1634-cü illər arasında bir sıra vilayətlərin sərhədlərində dəyişikliklər etdi. Bu zaman o, Naxçıvan və Makunu Çuxursədin tərkibinə keçirmiş, Pəmbək və Borçalını isə onun tərkibindən çıxararaq Qarabağ bəylərbəyiliyinin tərkibinə daxil etmişdi [182,53]. E.Çələbinin məlumatına görə, Maku İrəvan (Çuxursəd) bəylərbəyliyinin tərkibində ayrıca sultanlıq idi [96,107].

XVII əsrin 30-cu illərindən XVIII əsrin 20-ci illərinə qədər olan dövrdə Çuxursəd bəylərbəyiliyi **İrəvan, Şərqi Şörəyel, Naxçıvan** və **Maku*** əyalətlərini əhatə etmişdir. XVI əsrdən XVIII əsrin birinci rübü də daxil olmaqla ərzində İrəvan əyaləti sabit sərhədlərə malik ol-

* Bəzi mənbələrdə Maku mahalının İrəvan xanlığı işğal olunan zamanda da onun tərkibində olması haqda məlumat var [bax: 59, 49-50].

muşdur. Bu əyalətin ərazisi Arazın hər iki sahilində (çox hissəsi sol sahilində) yerləşirdi.

XVIII əsrin əvvəllərində Səfəvi dövlətində mərkəzi hakimiyyət çox zəifləmişdi. Artıq dövlətin digər əraziləri kimi, Azərbaycanın da ayrı-ayrı bölgələrini idarə edən hakimlər, o cümlədən Çuxursəd bəylərbəyiləri mərkəzi hakimiyyətdən ayrılıb müstəqil hakimlərə çevrilirdi.

Yerli hakimlər öz məqsədlərinə çatmaq üçün xalq üsyanlarından istifadə edirdilər. Bəhs olunan dövrdə Azərbaycanın şimalında ən güclü üsyan Şirvan bəylərbəyiliyində baş verdi. Üsyançılar Hacı Davudun başçılığı ilə 1721-ci ilin avqustunda Şamaxı şəhərini ələ keçirərək Şirvan bəylərbəyini qətlə yetirdilər. Bununla Azərbaycanın şimalında ilk dəfə olaraq müstəqil dövlət qurumu — xanlıq yarandı [136,28-36]. Bundan təşvişə düşən və mərkəzdən kömək ala bilməyən Çuxursəd bəylərbəyi Mehrəli xanla Qarabağ bəylərbəyi Uğurlu xanın birləşmiş qoşunu Şamaxıya doğru hərəkət etdi. Onlar Bərdə yaxınlığında — Kür sahilində görüşərək 30 min nəfərlik qoşun toplasalar da, şah onlara gömək göndərə bilmədi. Bundan xəbər tutan Hacı Davud Dağıstandan gəlmiş müttəfiqləri ilə birlikdə onları Kür çayını keçməyə qoymadı və qəflətən hücuma keçərək məğlub etdi [52, 28-29].

Səfəvilərin zəifləməsindən istifadə edən əfqanlar 1722-ci ildə dövlətin paytaxtı İsfahan şəhərini ələ keçirdilər. Belə bir vaxtda yaranmış əlverişli şəraitdən istifadə edən erməni din xadimləri I Pyotrla əlaqəyə girərək onu Azərbaycan torpaqlarının, o cümlədən İrəvanın işğalına şirnikləndirdilər [bax: 126,86-93]. Tiflisdəki erməni yeparxiyasının başçısı arxiyepiskop Minas Pərvazyan 1722-ci ilin dekabrında vardapet Minasa yazırdı: "Sənə məlumdur ki, İrəvan İran (Səfəvi — ***red.***) torpaqlarının açarıdır və bizim niyyətimiz İrəvan qalasını ələ keçirməkdir. Əgər o bizim əlimizdə olarsa, nə türklər, nə də iranlılar bizə heç nə edə bilməyəcəklər" [35, XXXI; 126,93]. Rusiya 1722-1723-cü illərdə Səfəvi dövlətinin Xəzərsahili vilayatlərini işğal etdi [169,38-

64]. Bundan narahat olan Osmanlı dövləti Rusiyanı qabaqlamaq üçün 1723-cü ildə öz qoşunlarını Azərbaycana yeritdi.

Rusiya Osmanlı dövləti ilə müharibəyə girməkdən çəkindi. Nəticədə 1724-cü ildə İstanbulda Rusiya və Osmanlı dövlətləri arasında müqavilə imzalandı. Müqavilənin şərtlərinə görə, Rusiya işğal etdiyi Xəzərsahili vilayətləri əlində saxlamaqla kifayətləndi. Osmanlı dövləti isə Cənubi Qafqazın, o cümlədən Azərbaycanın qalan ərazilərini işğal etmək üçün Rusiyanın bitərəfliyini təmin etdi. İstanbul müqaviləsindən sonra hücuma keçən Osmanlı imperatorluğu Ərdəbilədək bütün Azərbaycan torpaqlarını işğal etdi.

***İrəvan qalasının mühasirəsi və qəhrəmancasına müdafiəsi (6 iyul —7 oktyabr 1724-cü il).***

İrəvan bölgəsinin işğalı zamanı osmanlılar ciddi müqavimətlə qarşılaşdılar. Osmanlı ordusunun İrəvan bölgəsini işğal etməsi haqda ən dəqiq məlumat bu əməliyyatların iştirakçısı olan Kəmani Mustafa Ağanın "Rəvan fəthnaməsi"ndə verilir [22].

1724-cü ilin yazında Osmanlı sərkərdəsi Arifi Əhməd paşa 60 min nəfərdən artıq qoşunla Tiflisdən İrəvana doğru hərəkət etdi və mayın 29-da Arpaçay vadisinə yetişərək burada mövqe tutdu [22,33-34]. Dövrün digər mənbəsi sayılan "Anonim erməni xronikası"nda isə İrəvana hücum edən 75 minlik Osmanlı ordusuna Abdulla paşa Köprülünün* başçılıq etdiyi qeyd olunur [38,8]. Osmanlı ordusu İrəvan qalası ətrafında ciddi müqavimətlə qarşılaşdı. Vətən torpağının müdafiəsinə qalxan bütün Çuxursəd əhalisi başda bəylərbəyi Əliqulu xan** olmaqla Osmanlı qoşunlarına şiddətli müqavimət göstərdi.*** İrəvanın müdafiəsi zamanı şəhərin əhalisi bütünlüklə azərbaycanlılardan ibarət idi. İrəvan qalasını mühasirəyə alan Osmanlı qoşununa mərkəzdən dəfələrlə hərbi kömək göndərilməsi**** qalanın qəhrə-

---

*Hadisələrin bilavasitə iştirakçısı olan Kəmani Mustafa Ağanın məlumatları həqiqətə daha uyğundur. Çünki Abdulla paşa Köprülü İrəvana deyil, Təbriz üzərinə yürüşə başçılıq etmişdi.

** Dövrə aid mənbədə Osmanlı qoşunları İrəvan qalasını mühasirəyə alan zaman Çuxursəd bəylərbəyi Əliqulu xanın olduğu göstərilir [bax: 22,50,61 və s.].

*** İrəvan müdafiəçilərinin 2 dəstəyə ayrılaraq hətta qaladan çıxıb osmanlılara zərbə endirməsi haqda maraqlı məlumatlar var [bax: 22,56].

**** İrəvanı mühasirəyə alan Arif Əhməd paşanın müraciətinə cavab olaraq Osmanlı sultanı öncə 35 min nəfərlik [38,11], sonra Kütahya paşasının başçılığı ilə 10 minlik qüvvə [38,12;204,261], daha sonra isə Misirdən 3 min nəfərlik hərbi qüvvə göndərmişdi [38,13].

mancasına müdafiə olunmasına parlaq sübutdur. L.Lokhart Osmanlı ordusunun şiddətli hücumlarına İrəvan müdafiəçilərinin qəhrəmancasına müqaviməti, osmanlıların çoxlu sayda itki verməsi və bununla əlaqədar olaraq "ölüləri dəfn etmək üçün Arif Əhməd paşanın müvəqqəti atəşkəs təklif etməsi" barədə məlumat verir [204,261].

Üçkilsə və onun ətrafında məskunlaşan, əsasən qriqorian missionerlərindən ibarət olan erməniləri öz vətənləri olmadığı üçün Çuxursədin və İrəvan qalasının taleyi əsla maraqlandırmırdı. Əksinə, onlar bu torpaqlarda möhkəmlənmək üçün ölkəyə hücum edən hər hansı xarici qüvvə ilə sövdələşməyə hazır idilər.* Buna görə də nə katolikos, nə də erməni missionerləri İrəvanın müdafiəsində iştirak etdilər. Əksinə, ermənilər Osmanlı hərbi hissələri ilə əlaqə yaratdılar və səbirsizliklə Azərbaycana müdaxilə edən Osmanlı qoşunlarının qələbəsini, İrəvan qalasının təslim olmasını gözlədilər.** Heç şübhəsiz ki, məhz bu "xidmət" müqabilində Sultan III Əhməd ermənilər barədə xüsusi fərman verdi. İrəvan qalasının mühasirəsindən bir həftə sonra, Sultan III Əhmədin Arif Əhməd paşaya göndərdiyi fərmanda ermənilərin dini mərkəzi olan "Üçkilsəyə hücum etmək qadağan olunur, onun dağıntıya və sakinlərinin qarətə məruz qalmasına yol verilməməsi" [38,11] tələb edilirdi. Hətta, Arif Əhməd paşa sultan fərmanına uyğun olaraq Üçkilsənin qorunması üçün xüsusi bir alay da ayırdı [38,11].

Sultan III Əhmədin İrəvanın mühasirəsi zamanı qalanın müdafiəçiləri olan Azərbaycan türklərini qırmağa razılıq verməsi, ermənilərə isə toxunmamaq barədə xüsusi fərman göndərməsi müasir erməni millətçilərinin guya hələ orta əsrlərdən türklərin ermənilərə qarşı soyqırımları həyata keçirmələri barədə böhtançı təbliğatının heç bir əsası olmadığını sübut edir. Əksinə, bu fakt təsdiq edir ki, türklər həmişə erməniləri himayə etmişlər.

---

*Üçkilsə katolikosu Osmanlı paşasına Səfəvi şahı Təhmasib haqqında qeyri-dəqiq məlumatlar çatdırmaqla yanaşı, həm də İrəvan qalasının müdafiəçilərini təslim olmağa çağırırdı [22,54-55].
** "Anonim erməni xronikası"nda ciddi tarixi səhvlərlə yanaşı, İrəvan qalasının müdafiəsində guya ermənilərin də iştirak etdiyi qeyd olunur. Bunu başqa mənbələr təsdiq etmir. Digər tərəfdən, əgər ermənilər Osmanlı qoşununa müqavimət göstərib, İrəvan bəylərbəyinə köməklik göstərmiş olsaydılar, İrəvan qalası alındıqdan dərhal sonra onlar Osmanlı sultanı tərəfindən mükafatlandırılmazdılar [bax: 22, 56; 38,17].

İrəvan qalasının müdafiəçiləri Osmanlıların şiddətli top atəşi altında dəfələrlə qalaya olan hücumları qəhrəmancasına dəf etdilər. Mühasirə uzandı. Osmanlılar İrəvan qalasını ala bilmədilər. Qala müdafiəçilərinin müqavimətini qıra bilməyəcəyini görən Osmanlı komandanı əlavə kömək almaq üçün yenidən Sultan III Əhmədə aşağıdakı məzmunda məktub göndərdi: "Bu şəhərdə külli miqdarda qoşun vardır, biz artıq xeyli əsgər itirmişik. Əmriniz necə olacaqdır? Kömək göndərəcəksiniz, yoxsa geri qayıdaq?" [38, 11].

Sultan müraciətə cavab olaraq İrəvan qalasını mühasirədə saxlayan Osmanlı qoşunlarına kömək üçün əlavə hərbi qüvvələr göndərdi. Kütahya paşasının başçılığı altında yeni qüvvələrin gəlişi də osmanlıların vəziyyətini dəyişdirmədi. Lakin mühasirə uzandıqca qalada ərzaq, sursat çatışmazlığı getdikcə daha çox hiss olunmağa başladı. Şəhərin müdafiəçilərinə köməyə heç bir qüvvə gəlmədiyindən İrəvan komandanlığı Arif Əhməd paşa ilə danışıqlara girməyə məcbur oldu [204,261]. Mərkəzdən aramsız olaraq kömək alan Osmanlı qoşunları 92 gün mühasirədə* saxladığı İrəvan qalasını, nəhayət ki, böyük çətinliklə** ələ keçirə bildi [22,69].

İrəvanı ələ keçirdikdən dərhal sonra Osmanlı paşası ermənilərin dini başçısı, Üçkilsə katolikosu həmədanlı I Astvasaturu yanına dəvət edərək göstərdiyi "xidmət" müqabilində ona xələt və ənam verdi [38,17]. Bununla öz xəyanətkarlıq ənənələrinə sadiq qalan ermənilər növbəti dəfə təcavüzkarın tərəfinə keçərək onları 200 ildən çox himayə edən Səfəvi dövlətinə xəyanət etdilər.

---

* "Anonim erməni xronikası"nın müəllifi qalanın 60 gün mühasirədə saxlandığını qeyd edərək Osmanlı qoşunlarının İrəvan qalasına 1724-cü il iyunun 7-də daxil olduğunu yazır [38,17]. Qərb tarixçiləri qalanın mühasirəsinin 24 iyundan 28 sentyabra qədər davam etdiyini yazırlar [204, 261].

** "Rəvan fəthnaməsi"nin müəllifi İrəvan qalasının mühasirəsinin 1724-cü il iyulun 6-da başlandığını (1136-cı il 13 şəvval) [22, 46] və oktyabrın 7-də (1137-ci il 18 məhərrəm) başa çatdığını [22, 69] yazır.

İrəvan qalası ələ keçdikdən sonra Anadolu valisi Osman paşa İrəvana hakim təyin olundu [22,70].

L.Lokhartın fikrincə, İrəvanın alınması Osmanlı dövləti üçün böyük əhəmiyyətə malik olduğu qədər də baha başa gəlmişdi. Burada osmanlıların itkisi xəstəlikdən ölənlərlə birlikdə 20 min nəfərdən artıq, qala müdafiəçilərinin itkisi isə daha çox idi [204,261]. A.İoannisyan isə İrəvanın mühasirəsində osmanlıların itkisinin xəstəlikdən ölənlərdən savayı 20 min nəfərdən çox olduğunu qeyd edir [34,LXXX]. L.Lokhart isə maraqlı bir faktı — İrəvan qalası təslim olan zaman qala qarnizonunun sağ qalmış müdafiəçilərinə şəhəri şərəflə tərk etməyə icazə verildiyini qeyd edir [204, 261].

İrəvanın itirilməsindən sonra Çuxursəd bəylərbəyliyi 10 ildən çox osmanlıların hakimiyyəti altında qaldı. Osmanlılar işğal etdikləri Azərbaycan ərazilərində öz inzibati idarə sistemlərini tətbiq edərək əyalətləri sancaqlara, onları isə nahiyələrə bölmüşdülər.

1728-ci il tarixli İrəvan əyalətinin "Müfəssəl dəftər"inə görə, bu zaman Maku, İğdır, Sürməli nahiyələri ilə yanaşı Zar, Zəbil və Şərur nahiyələri də Naxçıvan sancağının tərkibindən çıxarılaraq İrəvan əyalətinə birləşdirilir. Eyni zamanda, İrəvan əyalətinin ərazisində Göyçə, Məzrəə, Xınzirək, Qırxbulaq, Dərəçiçək, Sədərək nahiyələri və Şörəyel livası yaradılmışdı. XVI əsrin sonunda mövcud olmuş Talın, Ərmus, Abnik, Şərabxana nahiyələri, eləcə də Naxçıvan sancağının ərazisindəki Bazarçay və Ağcaqala nahiyələri ləğv olunmuşdu [6;9].

Beləliklə, 1728-ci ildə osmanlılar siyahıyaalma keçirərkən İrəvan əyalətinin və Naxçıvan sancağının ərazi-inzibati quruluşu aşağıdakı kimi idi: İrəvan əyaləti — İrəvan şəhəri, Qırxbulaq, Qərbi, Maku, Xınzirək, Gərni, Vedi, Dərəçiçək, Abaran, Göyçə, Məzrəə, Sürməli,

İğdır, Aralıq, Şərur, Sədərək, Zərzəmin nahiyələri və Şörəyel livası; Naxçıvan sancağı — Naxçıvan şəhəri, Naxçıvan, Əlincə, Sair Məvazi, Dərəşahbuz, Mülki-Arslan, Məvaziyi-Xatun, Qarabağ, Qışlağat, Dərəşam, Azadciran, Şorlut, Dərənürgüt, Dərələyəz və Sisyan nahiyələri [6;9].

Səfəvi dövlətinin süqutu yaxınlaşmaqda idi. 1726-cı ildən başlayaraq Əfşar tayfasından olan görkəmli Azərbaycan sərkərdəsi Nadirqulu xan Səfəvi dövlətində nizami qoşunlara başçılığı tədriclə öz əlinə aldı. Yeni sərkərdə İsfahanı ələ keçirmiş əfqanları ölkədən qovdu və 1730-cu ildə şəhəri azad etdi. Bunun ardınca o, rus qoşunlarının Xəzərsahili ərazilərdən çıxarılmasına nail oldu. Nəticədə bir istiqamətdə — osmanlılara qarşı sərbəst müharibə aparmaq üçün əlverişli şərait yaratdı.

Nadirqulu xan Osmanlı imperiyasına qarşı hərbi əməliyyata Azərbaycanın cənubundan başladı. 1731-ci ilin əvvəllərində Marağa, Təbriz və Ərdəbil şəhərləri azad olundu. Lakin Nadirqulu xanın Naxçıvan və İrəvan istiqamətində hücuma hazırlaşdığı bir zamanda Xorasanda mərkəzi hakimiyyətə qarşı qiyam baş verdi. Bununla o, Osmanlı qoşunlarına qarşı apardığı uğurlu hərbi əməliyyatları yarımçıq qoyaraq Xorasana yürüş etdi. Bundan istifadə edən Səfəvi hökmdarı Şah II Təhmasib xalq içərisində, xüsusilə orduda itirilmiş nüfuzunu bərpa etmək məqsədilə özü Səfəvi qoşunlarının başında İrəvan və Naxçıvan istiqamətində hücuma keçdi [219;116;115,19]. Lakin şah Osmanlı qoşunları ilə ilk toqquşmadaca məğlub oldu və geri çəkildi. Osmanlı komandanlığı ilə yenidən ölkə üçün əlverişsiz və ağır sülh müqaviləsi bağlandı. Beləliklə, 1732-ci il yanvarın 16-da Səfəvi dövləti ilə Osmanlı imperiyası arasında imzalanan Kirmanşah sülh müqaviləsinin şərtlərinə görə, Azərbaycanın bir çox cənub bölgələri ilə yanaşı, İrəvan və Naxçıvan da Osmanlı imperiyasının tərkibində qaldı.

Xorasan yürüşündən qələbə ilə qayıdan Nadirqulu xan yeni müqavilənin şərtlərini qəbul etmədi. O, orduya arxalanaraq həmin ildə Şah II Təhmasibi taxtdan salıb onun qundaqda olan oğlunu III Abbas adı ilə şah elan etdi və yeni "şah" üzərində qəyyumluğu öz öhdəsinə götürdü. Bununla, faktiki olaraq, Səfəvi dövlətində bütün hakimiyyət Nadirqulu xanın əlinə keçdi [136, 106].

Nadirqulu xan hakimiyyət başına keçən kimi Osmanlı dövlətindən qoşunlarını 1723-cü ildən bəri işğal etdikləri bütün Səfəvi torpaqlarından geri çəkməsini tələb etdi. Buna rədd cavabı alan Nadirqulu xan Osmanlı qoşunlarına qarşı hərbi əməliyyatı bərpa etdi. Görkəmli sərkərdənin başçılıq etdiyi Səfəvi qoşunlarının zərbələri altında Osmanlı hərbi qüvvələri Azərbaycan ərazisini tərk etməyə başladı. Növbə İrəvana çatdıqda qaladakı Osmanlı qarnizonu döyüşə girməkdənsə müdafiə olunmağı üstün tutdu. Lakin tezliklə Osmanlı qarnizonu bunun da mənasız olduğunu nəzərə alaraq Nadirqulu xanla danışıqlara girdi. Nəticədə İrəvan qalasındakı Osmanlı qarnizonu heç bir itki vermədən 1735-ci il oktyabrın 3-də qalanı tərk etdi [203,89].

Nadirin uğurlarının qaçılmaz olduğunu görən erməni katolikosu bu dəfə osmanlılardan üz döndərərək onun tərəfinə keçdi.

İrəvandan sonra Nadirqulu xan 1735-ci il iyulun 9-da Gəncəni Osmanlı qoşunlarından azad etdi. 1736-cı ildə Nadirqulu xan bu vaxtadək formal olaraq "şah" sayılan Səfəvi sülaləsinin sonuncu nümayəndəsini — 4 yaşlı III Abbası rəsmi surətdə hakimiyyətdən kənar etdi və həmin ilin martında Muğan qurultayında özünü şah "seçdirdi". Yeri gəlmişkən, həmin qurultayda iştirak edən erməni katolikosu Nadirin şah "seçilməsi" mərasimində xüsusi canfəşanlıq nümayiş edirdi!

Nadir şahın dövlət daxilində həyata keçirdiyi ilk tədbirlərdən biri inzibati idarəçilik islahatı oldu. O, tarixi Azərbaycan torpaqlarında bu vaxtadək mövcud olan inzibati-ərazi bölgüsünu — Şirvan, Qarabağ, Azərbaycan və Çuxursəd bəylərbəyiliklərini ləğv etdi. Dörd bəylərbəyiliyin əvəzinə mərkəzi Təbriz şəhəri olmaqla vahid Azərbaycan vilayəti yaradıldı. Beləliklə, Nadir şah bütün Azərbaycan torpaqlarını inzibati cəhətdən vahid vilayətin tərkibində birləşdirdi. Nadir şah yeni vilayətin idarə olunmasını qardaşı İbrahim xana həvalə etdi.

Yuxarıda qeyd olunduğu kimi, Nadirin şah "seçildiyi" Muğan qurultayında iştirak edən və onun namizədliyini canfəşanlıqla müdafiə edən erməni katolikosu Abraham Kretasi bu barədə öz xatirəsində yazırdı ki, Nadir şah qardaşını Azərbaycan adlanan Atrpatakana rəis və sərdar, yəni sərkərdə təyin edərək Naxçıvanın, İrəvanın və bütün Ararat vilayətinin (Çuxursəd bölgəsi — ***red.***), Gürcüstanın idarəsini ona tapşırdı və onu başqa xanlar üzərində bəylərbəyi və hakimimütləq təyin etdi [23, 244].

Maraqlıdır ki, Abraham Kretasi əsərinin bir çox yerində Nadir şah Əfşarla olan danışıqlarını erməni hərflərilə Azərbaycan dilində vermişdir [23, 198, 199-120, 214, 215, 220, 244, 250 və s.]. Bu faktdan aydın olur ki, Nadir şahın yaratdığı böyük imperiyada nəinki xalq danışıq dili, hətta rəsmi danışıqlar və ziyafətlər də Azərbaycan türkcəsində aparılırdı. Abraham Kretasinin Azərbaycan türkcəsində danışması bu dilin imperiya daxilində mühüm ünsiyyət vasitəsi olduğunun parlaq sübutudur.

Muğan qurultayı ərəfəsində Nadirqulu xan özünün etibar etdiyi Pir Mahmud xanı İrəvan xanı və eyni zamanda bu bölgənin bəylərbəyi təyin etdi [23, 245].

Xarici müdaxiləçilərə qarşı müharibədə qazandığı qələbələr Nadir şahın orduda və bütün ölkədə nüfuzunu daha da artırsa da, onun yeni müharibələrə hazırlaşması, bunun üçün şəhər və kənd əhalisindən

alınan vergilərin durmadan artırılması ümumxalq narazılığını son həddə çatdırdı. Bütün ölkəni xalq hərəkatları bürüdü. Azərbaycan isə böyük imperiyanın tərkibindən çıxaraq öz dövlətçilik ənənələrini bərpa etməyə can atırdı. Azadlıq hərəkatı güclənməkdə idi. Xalqın günü-gündən ağırlaşan güzəranı, taxıl qıtlığı və aclıq vəziyyəti daha da ağırlaşdırırdı [115, 24-25, 51].

Elə bu səbəbdən Nadir şah onun hakimiyyətinə qarşı bütün imperiyanı bürümüş üsyanları yatırıb ölkədə sabitliyi bərpa edə bilmədi. 1747-ci il iyunun 19-dan 20-nə keçən gecə o, saray əyanları tərəfindən qətlə yetirildi [203, 261].

Nadir şahın ölüm xəbəri imperiya ərazisində hərc-mərcliyin daha da artmasına səbəb oldu. Azərbaycanda azadlıq hərəkatı daha da gücləndi. Azərbaycan torpaqlarında bir-birinin ardınca müstəqil yerli dövlətlər — xanlıqlar və sultanlıqlar yarandı.

Nadir şahın qətlə yetirilməsindən sonra İrəvan əhalisi Mehdi xanın başçılığı ilə üsyan qaldırdı. Mehdi xan özünü müstəqil hakim elan etdi [115,52]. Lakin yenicə müstəqillik qazanmış İrəvan xanlığının ərazisi keçmiş Çuxursəd bəylərbəyliyinin bütün ərazisini əhatə etmirdi. Onun bir hissəsi əvvəlki inzibati islahatlar zamanı Naxçıvan xanlığının və digər xanlıqların tərkibinə daxil edilmişdi.

İrəvan xanlığı XVIII əsrin ortalarında Azərbaycan ərazisində uzun sürən azadlıq hərəkatından sonra müstəqillik qazanmış 20-dən çox dövlət qurumundan — xanlıqlardan biri idi.

1747-ci ildə Nadir şah Əfşarın öldürülməsindən sonra müstəqil İrəvan xanlığının əsasını qoyan Mehdi xan Qasımlı* (Əfşar) [221,93] digər Azərbaycan xanları kimi, öz xanlığının ərazisini genişləndirmək

*Farsdilli mənbə Mehdi xanı Əfşarların Qasımlı qoluna aid edir və onun hələ Nadir şahın sağlığında İrəvan hakimi olması haqda məlumat verir [bax: 221,93-94].

siyasəti yeridirdi. O, bu məqsədlə 1748-ci ildə Urmiya xanlığına hücum etdi. Urmiya hakimi Fətəli xan Əfşar məğlub olaraq öz xanlığının müəyyən ərazilərini Mehdi xana güzəştə getməyə məcbur oldu [221, 93-94; 112, 111]. Lakin onun hakimiyyəti uzun sürmədi, 1748-ci ildə onu Məhəmməd Hüseyn xan Gəraylı əvəz etdi [221, 94, 97-98].

Çox keçməmiş öz nüfuzunu bərpa etməyə çalışan digər Azərbaycan xanı, urmiyalı Fətəli xan Əfşar əfqanıstanlı Azad xanla ittifaq bağladı və onların birləşmiş qoşunları İrəvan istiqamətində hücuma keçdi. 1751-ci ildə İrəvan qalasını ələ keçirərək güya İrəvan xanını müdafiə etməyə gəlmiş II İraklinin qoşunlarını məğlub etdi. Azad xanın II İraklini məğlub etməsindən sonra İrəvan xanlığına dair rəsmi sənədlərdə Azad xanın nümayəndəsi kimi Xəlil xan Özbəkin* adına rast gəlinir [105,136,194] və onun 1752-ci ildən İrəvan xanlığını idarə etdiyi qeyd olunur [82,5]. Mərhum prof. F.Əliyevin də fikrinə görə, Azad xanın nümayəndəsi olan Xəlil xan Özbək bir müddət İrəvan xanlığını idarə etmişdi [115,55]. Lakin dövrün digər mənbəsində — A.A.Bakıxanovun "Gülüstani-İrəm" əsərində müəllif 1752-ci il hadisələrindən bəhs edən zaman İrəvan xanı kimi yerli Qacar tayfasının nümayəndəsi olan Hüseynəli xanın adını çəkir ** [39, 156]. Ola bilsin ki, Azad xanın nümayəndəsi olan Xəlil xan Özbək yalnız İrəvan xanlığının kargüzarlıq işlərinə nəzarət etmişdi.

---

* Dövrə aid mənbədə — "Cambr"da göstərilir ki, Üçkilsə katolikosları 1750-1751, 1752-1753, 1754-1755-ci illərdə Azad xandan və onun nümayəndəsi Xəlil xandan mülklərinin maaf olması haqda sərəncam almışlar [bax: 105,136,149].
**A.A.Bakıxanovun Həsənəli xan Qacarı Hüseynəli xan Qacarla dəyişik salması ehtimalı böyük olduğu halda, Xəlil xan Özbəklə səhv salınması ehtimalı qeyri-mümkündür. "Cambr"da isə artıq 1755-ci ilə aid rəsmi sənədlərdə də Həsənəli xan Qacarın adı çəkilir [bax: 105,136].

Lakin bu hadisədən çox keçməmiş, 1755-ci ildə artıq yerli qacarlar sülaləsinin nümayəndəsi Həsənəli xan Qacarın* İrəvan xanlığında hakimiyyəti idarə etməsini ilk mənbələr təsdiq edir [105,136; 95,161; 82,5;]. Həsənəli xan Qacar hələ Nadir şah dövründə İrəvan xanı (hakimi — ***red.***) olmuş və şah tərəfindən cəzalandırılaraq hər iki gözü çıxarılmışdı [105,231]. Həsənəli xanın yenidən hakimiyyətə qayıtması İrəvanın qədim yerli tayfası olan Ağcaqoyunlu** Qacarlarının əhali arasında nüfuzunun böyük olduğunu sübut edir. İ.Şopenin qeyd etdiyi kimi, Həsənəli xan Qacarın hakimiyyətə gəlməsi ilə İrəvan xanlığında hakimiyyət irsi xarakter aldı [95,161]. Həsənəli xandan sonra onun qardaşı Hüseynəli xan Qacar [105,137,232; 95,163; 82,5;] hakimiyyətə gəldi. Lakin ilk mənbədə Hüseynəli xan Qacarın İrəvan xanı kimi adı 1759-1760-cı illərdən başlayaraq xatırlanır [105,137]. 1783-cü il noyabrın 9-da Hüseynəli xan Qacar vəfat etdi və onu böyük oğlu, 15 yaşlı Qulaməli xan Qacar əvəz etdi [95,164; 37,267; 150,40]. Lakin Qulaməli xanın hakimiyyəti uzun sürmədi.

* Qədim Azərbaycan türkləri olan qacarlar mənşə etibarilə oğuzların Bayat boyunun Şam Bayatı oymağının bir qoludur. Bu qol Yivə, Ağcalı və Ağcaqoyunlu oymaqları ilə birlikdə Qacar boyunu əmələ gətirmişdi. Bəzi tədqiqatçılar qacarları 465-ci ildə Azərbaycanda məskunlaşan, Bizans qaynaqlarında da adı çəkilən Hun tayfasının hakim zümrələrindən biri olan, xəzərlər və bulqarlarla yaxın olduğu söylənilən Ağacərilərlə bağlayırlar. Azərbaycanda Ağacərilər sonralar Qacar adlanmış və Xalxal bölgəsində məskunlaşmışlar. Z.V.Toğanın fikrincə, Rəşidəddinin "Cami ət-təvarix"inin Peterburq nüsxəsində Ağacərilərdən bəhs edilərkən xüsusi bir qeyd verilmişdi: "Ağacəri adı bu gün türklərin və digərlərinin tələffüzündə Qacar şəklini almışdır. Hülaku xan Ələmut ismaililərinə və Suriyaya hərbi yürüşlərində Azərbaycanın qədim sakinləri olan qacarlardan da istifadə etmişdi". Mirzə Balanın fikrincə, Qacarların Azərbaycandan Anadoluya və Suriyaya, eləcə də Ələmuta yaxın olan Astrabad bölgələrinə yayılması bununla bağlıdır [bax: 209,137-147].

** Çuxursəd vilayətində yaşayan qədim Qacar tayfaları mənbələrdə Ağcaqoyunlu Qacarlar kimi qeyd olunur [196,186-187]; İrəvan xanlarının qacarlar nəslindən olmasını digər tədqiqatçılar da təsdiq edir [82,5; 39,185; 200,8]. Hələ XVII əsrin əvvəllərindən başlayaraq qədim Azərbaycan tayfası olan Ağcaqoyunlu Qacarlar Çuxursəd bəylərbəyliyinin idarə olunmasında mühüm rol oynamışlar. Nadir şahın öldürülməsindən sonra yaranmış digər Azərbaycan xanlıqlarında olduğu kimi, müstəqil İrəvan xanlığını da idarə edənlər məhz Ağcaqoyunlu Qacarların nümayəndələri idi [bax: bölmənin sonu, əlavə: 2].

1784-cü ilin yayında o qətlə yetirildi və taxta Hüseynəli xan Qacarın 12 yaşlı oğlu Məhəmməd Hüseyn xan Qacar* çıxdı [95, 164; 166, 205; 115, 70-71; bax: bölmənin sonu, şəkil 5]. 1797-cı ildə Ağa Məhəmməd şah rus qoşunları ilə əlaqə saxladığına görə İrəvan xanı Məhəmməd Hüseyn xan Qacarı həbs edərək Tehrana göndərdi [95, 164; 115, 84]. Q.P.Butkova görə isə, İrəvan xanı Məhəmməd Hüseyn xan Ağa Məhəmməd şaha itaətini bildirmək üçün onun yanına gəldiyi zaman, qohumu olmasına baxmayaraq, şah onu (İrəvan xanını — ***red.***) həbs edərək ailəsi ilə birlikdə Qəzvinə göndərdi [41, II, 428]. Məhəmməd Hüseyn xanın yerinə Ağa Məhəmməd şah öz qardaşı Əliqulu xan Qacarı İrəvan xanlığında hakimiyyətə gətirdi [95, 164; 41, II, 426; 200, 9]. Lakin Əliqulu xanın vergiləri artırması səbəbindən İrəvan əhalisi üsyan edib onu xanlıqdan qovdu  [41, II, 431; 214, 185]. C.Bornoutyan isə bu hadisəni fərqli təqdim edərək yazır ki, Əliqulu xan Qacar qardaşı Ağa Məhəmməd xanın ölümündən (1797) dərhal sonra Tehrana şah taxt-tacı iddiası üçün tələsdi. Yaranmış vəziyyətdən istifadə edən Həsən xan Makulu İrəvan xanlığında hakimiyyəti ələ keçirdi və xalqdan ağır vergilər tələb etdi [214, 185;  200, 9]. Ağa Məhəmməd şah Qacarın qətlindən sonra hakimiyyəti ələ alan varisi Fətəli şah Qa-

*Mənbədə xanın adı tam şəkildə Məhəmməd Hüseyn xan kimi qeyd olunur [60,6]. Qərb mənbə və ədəbiyyatlarında Məhəmməd Hüseyn xan Qacar haqda maraqlı məlumatlar verilir. H.Busse V.Zubovun 1796-cı ildə Azərbaycana yürüşündən bəhs edilərkən Məhəmməd Hüseyn xanı Ziyadoğlu kimi təqdim edir [99,67]. Mənbənin digər yerində isə Məhəmməd Hüseyn xan Qacar Qoyunlu kimi təqdim edilir [99,107,108,109] və iri dodaqları olduğuna görə onun "Dodaq" ləqəbi daşıdığı qeyd olunur [99,109]. G.Bornoutyan isə Məhəmməd Hüseyn xan Qacarı qacarların Qoyunlu (Ağcaqoyunlu — ***red.***) boyuna aid edir və ana xətti ilə Ağa Məhəmməd xan Qacarın qohumu hesab edir [200,8]. Q.P.Butkov Məhəmməd Hüseyn xan Qacarın hakimiyyətə gəlməsini 1785-ci ildən [41,II,177], digər mənbə isə, hətta, 1779-cu ildən [82,5] götürür. Lakin Məhəmməd Hüseyn xan Qacarın ögey qardaşı Hüseynəli xan öldürüldükdən dərhal sonra hakimiyyətə gəldiyini nəzərə alsaq, 1784-cü il variantı daha dəqiqdir.

car (1797-1836) İrəvan xanı Məhəmməd Hüseyn xan Qacarı həbsdən azad etdi [115, 85]. Üç aylıq hakimiyyətdən uzaqlaşdırılan Məhəmməd Hüseyn xan geri qayıdaraq bölgədə öz hakimiyyətini bərpa etdi [200, 9]. Lakin Fətəli şah Qacarın gözlədiyinin əksinə olaraq, Məhəmməd Hüseyn xan ondan asılı olmaq istəmədi. Buna görə də bir müddət sonra — 1805-ci ilin iyununda şahzadə Abbas Mirzə Məhəmməd Hüseyn xan Qacarı həbs edib İrana göndərdi [26, sənəd 1256, s.626; 188, 113]. Bəzi məlumatlara görə, Məhəmməd Hüseyn xan ikili mövqeyinə görə [95, 167], digər məlumatlara əsasən isə məhz Osmanlı dövləti ilə yaxın münasibətdə olduğu üçün (bu zaman Qacarların Osmanlı dövləti ilə münasibətləri pisləşmişdi) vəzifəsindən kənarlaşdırıldı [200, 14-15]. Əslində, Məhəmməd Hüseyn xan Qacarın müstəqil siyasət yeritməsi (bu haqda V fəsildə ətraflı məlumat verilir — ***red.***) Qacarlar İranının hökmdarı Fətəli şahı və şahzadə Abbas Mirzəni qane etmirdi. Onu hakimiyyətdən uzaqlaşdırmaq üçün daim fürsət axtarırdılar və buna nail oldular.

Bəzi məlumatlara görə Məhəmməd Hüseyn xanı 1805-cü ildə Pirqulu xan Qacar əvəz etdi [95, 167; 200, 14-15]. Lakin, əslində, İrəvan xanlığında Məhəmməd Hüseyn xandan sonra (1805-ci ilin yayında) hakimiyyətə Mehdiqulu xan Qacar* gəlmişdi [26, sənəd 1256, s.626; 82, 5; 200, 14-15]. Pirqulu xan Qacar isə əslində İrəvan xanı deyil, İrəvan şəhərinin hərbi rəisi olmuşdur. "Qarabağnamə" müəllifi Mir Mehdi Xəzani Məhəmməd Hüseyn xan Qacarın Mehdiqulu xan Qacarla əvəz olunmasını təsdiq edir və Pirqulu Qacarı ordu sərkərdəsi

* Bəzi mənbələrdə Mehdiqulu xan qacarların Dəvəli boyuna aid edilir [bax: 98,193]. Mehdiqulu xan Qacar Fətəli şahın seçilən sərkərdələrindən idi. Sonralar Rusiya ilə müharibələrdə böyük şücaətlər göstərmişdi [bax: 127,30].

kimi təqdim edir [8, II, 156]. Hətta, digər bir mənbədə Mehdiqulu xanın daha əvvəl — 1804-cü ildən İrəvan xanlığını idarə etdiyi qeyd edilsə də [98, 222], bu, reallıqdan uzaqdır. Mənbələrdə məhz 1805-ci il iyunun ortalarına kimi İrəvan xanı Məhəmməd Hüseyn xan Qacarın olması təsdiqini tapır.

1806-cı ilin avqustunda irəvanlılar əhali üzərinə ağır vergilər qoyan və xalqı qarət edən Mehdiqulu xana qarşı üsyan qaldırdılar [26, sənəd 1256, s.626-627]. Həmin ilin avqustunda Mehdiqulu xan Qacarı Təbriz və Marağa xanı Əhməd xan əvəz etdi [82, 5; 74, 368-369]. Əhməd xan Təbrizdən çoxsaylı piyada və süvari qoşunla İrəvana gəldi və hakimiyyətdə Mehdiqulu xanı əvəz etdi. O, əhalinin rəğbətini qazansa da, cəmi üç aya yaxın hakimiyyətdə oldu. İrəvanda epidemiya baş qaldırdığı üçün xan ağır xəstələndi və dövlət işlərini lazımi şəkildə icra edə bilmədi. O, şahzadənin (Abbas Mirzə — ***red.***) ən etibarlı və görkəmli nümayəndəsi olduğu üçün bu hadisə onu çox məyus etdi [98, 285-286]. Əhməd xan Marağalı 1806-cı il oktyabrın 17-də vəfat etdi. Fətəli şahın tələbi ilə xanlıqdan uzaqlaşdırılan Məhəmməd Hüseyn xan Qacar yenidən İrəvan xanlığına geri qayıtsa da [bax: 27, sənəd 792, s.421], hakimiyyətini davam etdirə bilmədi.

Çox keçmədən İrəvan xanlığında yerli hakimiyyət* yenidən möhkəmləndi və hakimiyyətə müstəqil İrəvan xanlığının sonuncu xanı Hüseynqulu xan Qacar (Qoyunlu)** gəldi [bax: 27, sənəd 129, s. 69-70; sənəd 424, s.232; 95, 167; 82,5; 200, 16-17]. Fətəli şah İrəvanın yeni xanı Hüseynqulu xan Qacara "sərdar" — yəni, Araz çayının sol sahilindəki bütün hərbi qüvvələrin sərkərdəsi titulunu verdi [200, 17]. İrəvan sərdarı təyin edilən Hüseynqulu xan Qacara vilayətin bütün hərbi və mülki hakimiyyəti verilməklə yanaşı, o, çoxsaylı süvari və pi-

---

*C.Bornoutyan Hüseynqulu xan Qacarın atasının XVIII əsrdə İrəvan xanı olduğunu qeyd edir [bax: 200,17-18]. Bu fakt bir daha yerli Qacarlar sülaləsinin İrəvan xanlığında mühüm rol oynadığını sübut edir.

** Qacarların Qoyunlu (Ağcaqoyunlu — ***red.***) boyundan olan Hüseynqulu xan Qacar Fətəli xanın sarayında əyanların başçısı vəzifəsində çalışmış, Ağa Məhəmməd şah Qacar qətlə yetiriləndən sonra Fətəli şahın hakimiyyətdə möhkəmlənməsinə yaxından kömək etmişdi. 1800-1802-ci illərdə Qəzvində paytaxta gedən yolun mühafizə dəstəsinin rəisi olmuş, şəxsi igidliyinə görə "Qəzvini" təxəllüsü almışdı. 1802-ci ildə əfşarlar arasında yaranan ixtişaşları yatırmaq üçün Xorasana göndərilmiş və beş il Xorasanı idarə etmişdi [bax: 200,17-18].

yada qoşunla da təmin edildi [98, 295]. Məhz buna görə də dövrün mənbələrində sonuncu İrəvan xanı Hüseynqulu xan Qacar "İrəvan sərdarı" kimi qeyd olunur. Hüseynqulu xan Qacarın qardaşı, "Aslanlar başı"* fəxri adını daşıyan Həsən xan Qacar Rusiya işğalçılarına qarşı aparılan mübarizədə İrəvan xanının ən yaxın silahdaşı idi [bax: 8, II, 63; 177, 515; 127, 96; 200, 18].

Beləliklə, ilk mənbələrin məlumatları təsdiq edir ki, 1747-ci ildən 1827-ci ilə qədər mövcud olmuş Azərbaycan dövlətini — İrəvan xanlığını əsasən Azərbaycanın yerli türk Qacar tayfasının nümayəndələri olan xanlar idarə etmişlər və onlar İrəvan xanlığının müstəqilliyi uğrunda qətiyyətlə mübarizə aparmışlar.

* Fars dilində "baş" mənasını bildirən "sər" terminini bəzi müəlliflər "sarı" kimi tərcümə edərək Həsən xan Qacarın "Sarı Aslan" titulu daşıdığını qeyd edirlər [8,II, 63; 127, 96; 200, 18]. Lakin dövrün digər mənbə və ədəbiyyatlarında bu söz düzgün olaraq "Aslanlar başı" kimi təqdim edir [bax: 59, 62; 177, 515].

# ƏLAVƏ №1.

Azərbaycanın Çuxursəd (İrəvan) bölgəsini idarə edən əmirlər və bəylərbəyiləri:

Əmir Səəd (XIV əsrin sonlarından 1410-cu ilə qədər)
Pir Hüseyn (1410-1413)
Pir Yaqub (Pir Hüseyn oğlu) (1420-ci illər)
Əbdül (Pir Hüseyn oğlu) (1440-cı illər)
Yaqub bəy (1440-cı illər)
Həsənəli Qaraqoyunlu (1460-cı illər)
Div Sultan Rumlu (1515-dən)
Hüseyn xan Sultan Rumlu (1550-ci ildən)
Şahqulu Sultan Ustaclı (1550-1575)
Məhəmməd xan Toxmaq Ustaclı (1576-1583)
Xıdır paşa (1583)
Lələ paşa (1577)
Məhəmməd Şərif paşa (1604-cü ilədək)
Əmirgünə xan Qacar (1604/5-1625)
Təhmasibqulu xan Qacar (1625-1635)
Fərhad paşa (1635)
Kalbalı xan (1636-1639)
Çağata Kötük Məhəmməd xan* (1639/40-1648)
Xosrov xan** (1648-1652/53)
Məhəmmədqulu xan Lələ bəy (1652/53-1659/60)
Nəcəfqulu xan (1659/60-1663)
Abbasqulu xan Qacar (Əmirgünə xan Qacarın oğlu) (1663-1666)
Səfi xan (Alxas Mirzə)*** (1666/67-1674)
Sarıxan bəy (1674-1675)

---

* XVIII əsrə aid mənbədə — "Cambr"da Kötük Əhməd xan kimi [105,156], dövrün mənbəsində isə Cağata Kötük Mhəmməd xan kimi təqdim olunur və onun Səfəvilərlə Osmanlılar arasında imzalanmış Qəsri-Şirin sülh müqaviləsi (1639) danışıqlarının ilkin mərhələsində iştirak etdiyi qeyd olunur [66,129].
** Mənbədə mənşəcə gürcü olduğu göstərilir [66,140].
*** Bəzi mənbələrdə ləzgi olduğu göstərilir [105,156; 82,4]. Əylisli Zəkəriyyə onu Səfiqulu xan Teymur Qaybək kimi qeyd edir [104,63], əsərinin digər yerində isə Səfiqulu xan Alxas Mirzə kimi təqdim edir [104,80,84,88].

Səfiqulu xan**** (1675-1679)
Zal xan***** (1679-1688)
Murtuzaqulu xan****** (1688-1691)
Məhəmmədqulu xan (1691-1694)
Zöhrab xan (1694-1699)
Fərzəli (Fətəli) xan Qacar (1699-1705)
Əbdül Məhəmməd xan (1705-1709)
Mehrəli xan (1709-1719)
Allahqulu xan (1719-1725)
Rəcəb paşa (1725-1728)
İbrahim paşa və Mustafa paşa (1728-1734)
Əli paşa dəftərdar (1734)
Hacı Hüseyn paşa (1734)
Məhəmmədqulu xan (1735)
Pir Məhəmməd xan (1736)

---

****"Cambr"da gürcü olduğu qeyd olunsa da [105,156], digər mənbələr bunu təsdiq etmir. Dövrün mənbələrində Təbrizli Rüstəm xanın oğlu olduğu qeyd olunur [66,182; 104,102]. Bu faktı XIX əsr rusdilli mənbə də təsdiq edir [82,4].
***** Mənşəcə gürcü olduğu göstərilir [82,4]. Dövrə aid mənbədə Abbasqulu xan Qacarın kürəkəni olduğu qeyd olunur [66,195].
****** Naxçıvanlı Məhəmmədrza xanın oğludur [66,224; 82,4].

Mənbələr:
Զաքարիա Ագուլեցի, Օրագրութիւն: Երեվան,1938: [Əylisli Zəkəriyyə. Gündəlik. İrəvan, 1938].
Канакерци З. Хроника. Москва, 1969.
Аракел Даврижеци. Книга Историй, (перевод с армянского, предисловие и комментарий Л.А.Ханларян). Москва, 1973.
Սիմէօն Երեւանցիոյ: Ջամբռ: Գիրք, որ կոչի յիշատակարան արձանացուցիչ, հայելի եւ պարունակող բնավից որպիսութեանց Սրբոյ Աթոռոյս, եւ իւրոյ շրջակայից վանօրէիցն: Վաղարշապատ: ՌՅԻԳ: [Simeon İrəvanlı. Cambr. Müqəddəs Üçmüədzin kilsəsinin və ətraf monastırların toplusunun müfəssəl aynası və xatirə kitabı. Vaqarşapad, 1873].
СМОМПК, вып.I. Тифлис, 1881.

## ƏLAVƏ №2.

İrəvan xanları:

Mehdi xan Qasımlı (Əfşar)* (1747-1748)
Məhəmməd Hüseyn xan Gəraylı** (1748-1751)
Xəlil xan Özbək*** (1751-1755)
Həsənəli xan Qacar (1755-1759)
Hüseynəli xan Qacar (Həsənəli xan Qacarın qardaşı)
(1759/60**** - 1783, noyabr)
Qulaməli xan Qacar (Hüseynəli xan Qacarın oğlu)
(1783 -1784, yay*****)
Məhəmməd Hüseyn xan Qacar (Hüseynəli xan Qacarın oğlu)
(1784-1805, iyun******)
Əliqulu xan Qacar (Ağa Məhəmməd şah Qacarın qardaşı)
(1797, iyun)
Həsən xan Makulu (Ağa Məhəmməd şah öldürüləndə qarışıqlıqdan istifadə edərək İrəvan xanlığında hakimiyyətə gəlmişdir) (1797, yay)
Mehdiqulu xan Qacar (1805, yay — 1806, avqust)
Əhməd xan Marağalı (1806, avqust-oktyabr)
Hüseynqulu xan Qacar (Qoyunlu) (atası vaxtilə İrəvan xanı olub)*******
(1806, dekabr******** — 1827, oktyabr)

* Farsdilli qaynaqlar Mehdi xanı Əfşarların Qasımlı qoluna aid edir [bax: 221,93].
** Farsdilli qaynaqlar Mehdi xan Əfşardan sonra hakimiyyətdə yerli nümayəndə Məhəmməd xan Gəraylının olmasını qeyd edir [bax: 221,93].
*** Xəlil xan Özbəkin İrəvan xanı olması haqda məlumatlar yetərli deyil [əlavə məlumat üçün bax: bölmə I, s.51].
**** İrəvan xanı Hüseynəli xan Qacarın hakimiyyətə gəlməsi bir mənbədə 1764-cü ildən göstərilsə də [82, 5], dövrə aid mənbədə — "Cambr"da 1759-1760-cı illərdən başlayaraq xatırlanır [105,137].
***** Hüseynəli xanın oğlu Qulaməli xan Qacar cəmi 8 ay hakimiyyətdə olmuşdur.
****** İrəvan xanı Məhəmməd Hüseyn xan Qacarın hakimiyyəti dövründə 1797-ci ildə üç aylıq fasilə yaranmışdı [əlavə məlumat üçün bax: bölmə I, s.53].
******* C.Bornoutyanın verdiyi məlumata görə Hüseynqulu xan Qacarın atası Məhəmmədxan Qacar XVIII əsrdə İrəvan xanı olub [bax: 200, 17].
******** C.Bornoutyanın Hüseynqulu xan Qacarın hakimiyyətini 1807-ci ildən götürməsi düzgün deyildir. Dövrə aid sənədlərdən birinin 10 dekabr 1806-cı il məlumatından bəlli olur ki, Hüseynqulu xan Qacar artıq İrəvan xanıdır [bax: 27, sənəd 129, s.69-70].

*Mənbələr:*

Qarabağnamələr. I kitab. Bakı, 1989.

Qarabağnamələr, II kitab. Bakı, 1991.

AKAK, т. II. Тифлис, 1868.

AKAK, т. III. Тифлис, 1869.

Бакиханов А.А. Гюлистани-Ирам. Баку, 1991.

СМОМПК, вып.I. Тифлис, 1881.

Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её присоединения к Российской империи. СПб., 1852.

Brydges H.J. The dynasty of the Kajars, translated from original Persian manuscript. New York, Arno Press, 1973.

Bournoutian G.A. The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica.. Costa Mesa, California and New York, 1992.

میرزا رشید. تاریخ افشار. تحران ۱۳۲۹. [Mirzə Rəşid. Tarixe-Əfşar. Tehran, 1329].

Սիմէօնէ Երեւանցիոյ: Ջամբռ: Գիրք, որ կոչի յիշակարան արձանացուցիչ, հայելի եւ պարունակող բնավից որպիսութեանց Սրբոյ Աթոռոյս, եւ իւրոյ շրջակայից վանօրէիցն: Վաղարշապատ: ՌՃԻԳ: [Simeon İrəvanlı. Cambr. Müqəddəs Üçmüədzin kilsəsinin və ətraf monastırların toplusunun müfəssəl aynası və xatirə kitabı. Vağarşapad, 1873].



Şəkil 1.
Səədli Əmir Həsən xarici ölkədən gəlmiş elçini qəbul edir (XIII əsr).
***Mənbə***: Очерки по истории Армении. Сб. статей. М.1939, с. 101



Şəkil 2.
Səədli Əmir Həsən ovda (XIII əsr).*
***Mənbə:*** Очерки по истории Армении. Сб. статей. М.1939, с. 102
* Abidənin üzərindəki erməni hərfləri sonradan qoyulmuşdur



Şəkil 3. Qoç fiquru* (orta əsrlər)
*İrəvan xanlığı (indiki Ermənistan) ərazisindəki Azərbaycan türklərinə məxsus
külli miqdarda qoç fiqurları və qəbiristanlar erməni vandalları tərəfindən məhv edilmişdir



Şəkil 4. Qəbirüstü abidə* (orta əsrlər)
*İrəvan xanlığı (indiki Ermənistan) ərazisindəki Azərbaycan türklərinə məxsus
külli miqdarda qəbirüstü abidələr və qəbiristanlar erməni vandalları tərəfindən məhv edilmişdir



Şəkil 5.
Məhəmməd Hüseyn xan Qacar
(1784-1805)
***Mənbə:*** G.Alişan. Ayrarat (erməni dilində).
Venesiya, 1890, s.308



Şəkil 6.
İrəvan şəhərində zərb olunan Azərbaycan (Səfəvi) pulu
http://ru.wikipedia.org/wiki/Файл:Iravan-copper/jpg



Şəkil 7.
İrəvan şəhərində zərb olunan Azərbaycan (Səfəvi) pulu
***Mənbə:*** Государственный музей изоброзительных исскуств имени А.С.Пушкина Тринадцатая Всероссийская нумизматическая конференция. Москва, 11-15 апреля 2005г. с. 70-71. Тезисы докладов и сообщений. Москва, 2005.
www.nuseum.ru/GMII/tezisi.pdf



http://www.rustypennies.com/catalog/pix/ba044a.jpg



http://www.rustypennies.com/catalog/pix/ba053.jpg



http://www.rustypennies.com/catalog/pix/ba047.jpg



http://www.rustypennies.com/catalog/pix/ba054.jpg



http://www.rustypennies.com/catalog/pix/ba049.jpg



http://www.rustypennies.com/catalog/pix/ba055.jpg



http://www.rustypennies.com/catalog/pix/bi051.jpg



http://www.rustypennies.com/catalog/pix/ba056.jpg



http://www.rustypennies.com/catalog/pix/ba059.jpg



http://www.rustypennies.com/catalog/pix/ba058.jpg

Şəkil 8. İrəvan bölgəsində və İrəvan xanlığında dövriyyədə olan Azərbaycan (Səfəvi) pulları


http://www.rustypennies.com/catalog/pix/ba060.jpg


http://www.rustypennies.com/catalog/pix/ba063.jpg


http://www.rustypennies.com/catalog/pix/ba064.jpg


http://www.rustypennies.com/catalog/pix/ba067.jpg


http://www.rustypennies.com/catalog/pix/ba070.jpg


http://www.rustypennies.com/catalog/pix/ba071.jpg


http://www.rustypennies.com/catalog/pix/bh001.jpg


http://ru.wikipedia.org/wiki/Файл:Iravan_1144_AbbasIII.jpg

Şəkil 9.
İrəvan bölgəsində və İrəvan xanlığında dövriyyədə olan
Azərbaycan (Səfəvi) pulları

***Erməni katolikosluğunun Qərbi Azərbaycana köçürülməsi və ermənilərin Üçkilsə ətrafında məskunlaşmağa başlaması.*** Azərbaycanın ayrılmaz tərkib hissəsi olan İrəvan xanlığının ərazisi ən qədim zamanlardan başlayaraq müxtəlif tarixi dövrlərdə Azərbaycan türklərinin elliklə ən sıx yaşadığı bölgələrdən biri olmuşdur. Azərbaycan xalqı bu diyarda öz tarixinin ən zəngin və ən şanlı səhifələrini yaratmışdır. Qriqorian missionerləri istisna edilməklə, ermənilərin bu Azərbaycan torpaqlarında peyda olması prosesi 1441-ci ildə erməni katolikosluğunun Kilikiyadan Azərbaycan Qaraqoyunlu dövlətinin ərazisinə — Üçkilsəyə köçürülməsindən [34,326-327;105,19] sonra başlamışdır. Bunu Üçkilsə katolikoslarının Azərbaycan hökmdarlarının qılığına girərək onlardan aldıqları kəndlərin, torpaqların və digər əmlakın Matenadaranda saxlanılan alqı-satqı sənədləri tam açıqlığı ilə sübut edir [bax: bölmənin sonu, cədvəl 1].

İrəvan bölgəsindəki Azərbaycan torpaqlarını ermənilərin hansı yollarla ələ keçirmələri ilə bağlı Matenadaranda saxlanılan 1687-ci il tarixli bir sənəd olduqca əhəmiyyətlidir. Həmin sənəddə qeyd olunur ki, biz (yəni ermənilər — ***red.***) Azərbaycan türklərinə məxsus olan torpaqları "…ya satın alır, ya zəbt edir, ya sahibinin əlindən çıxarır, ya rüşvət verib alır, ya bəxşiş kimi əldə edir və yaxud da zorla ələ keçiririk" [51,28]. Erməni müəllifi qeyd edir ki, məhz bu yollarla XV-XVIII əsrlərdə erməni kilsəsinin və dünyəvi feodallarının torpaq mülkiyyəti formalaşmışdı [51,28].

Qeyd etmək lazımdır ki, erməni katolikosluğu mərkəzinin 1441-ci ildə Çuxursəd (İrəvan) bölgəsinə köçürülməsinə qədər burada ermənilərə məxsus heç bir kənd və yaxud torpaq sahəsi olmayıb. Hətta, erməni katolikosluğunun yerləşdiyi Üçkilsə (Valarşabad*) kəndi belə

* Erməni dilində heç bir izahı olmayan "Valarşabad" toponimi Arşakilər (Arsaklılar) sülaləsindən olan Sanatürkün (Sanatrukun) oğlu Valar şahın (194-216) adı ilə bağlıdır. Uzun tarixi dövr ərzində "Valarşabad" kimi işlənmiş bu toponim erməni ədəbiyyatında təhrif olunaraq "Vağarşabad" ("Վաղարշապատ") formasına salınmışdı. Valarşabadın əsası Valar şah tərəfindən qyulmuşdu [bax: 95,116; 190, 29].

1443-cü ildən başlayaraq hissə-hissə müxtəlif vasitələrlə Azərbaycan türklərindən alınmışdı. Məsələn, Azərbaycan Qaraqoyunlu hökmdarı Cahanşahın razılığı ilə Üçkilsə katolikosu təyin olunan (1443) Qriqor Makulu, tanınmış azərbaycanlı nəslinin nümayəndəsi, azyaşlı Səid bəyin mülkü olan Üçkilsə (Valarşabad) kəndinin bir hissəsini 8 min 40 dinara [105,100], 3 il sonra isə qalan hissəsini və əlavə 6 kəndi müsəlman Rüstəmdən 90 min dinara satın ala bilmişdi [105,102; bax: bölmənin sonu, cədvəl: 1].

Qaraqoyunlu, Ağqoyunlu və Səfəvi dövlətlərinin himayəsindən istifadə edən Üçkilsə katolikosları və onların Avropadakı havadarları Azərbaycanın bu hissəsində ermənilərin kök salıb çoxalmasına başçılıq etmişlər. Belə ki, erməni keşiş Q.Kiğamiyans ermənilərin "qurtuluş hərəkatı"nın onların Qriqorian kilsəsi tərəfindən vahid mərkəzdən idarə olunduqları zamandan başlandığını qeyd edərək yazırdı ki, avropalı missionerlər qriqorianlara müraciətlə deyirdilər: "Əgər siz də bizim kimi Papa ilə birlikdə olsanız, siz də bizim kimi əziz olarsınız və onda hətta istiqlaliyyətinizi də ələ alarsınız". Bununla Şərqə əl uzatmağa çalışan avropalılar XVI-XVII yüzilliklərdə Kilikiyadan İrana (Səfəvi dövləti ərazisinə — ***red.***) köç edərək burada məskunlaşan ermənilərin dini duyğularını alovlandırırdılar [117, 3-4; 126, 33]. İlk dövrlərdə ermənilər İrəvan şəhərinin özündə deyil, ələ keçirə bildikləri Üçkilsə katolikosluğunun ərazisində və ona bitişik torpaqlarda məskunlaşmışdılar.

Beləliklə, xaricdəki havadarlarının və xristian missionerlərinin hesabına varlanan erməni kilsəsi Azərbaycan hakimlərindən pulla ermənilərə yeni-yeni torpaqlar və kəndlər alaraq Azərbaycanın tarixi torpaqlarında özlərinə daimi məskənlər yaradırdılar.

***Ermənilərin Çuxursəd (İrəvan) bəylərbəyiliyinin ərazisində məskunlaşmasına təkan verən amillər.*** Qeyd etmək lazımdır ki, ermənilərin Çuxursəd bəylərbəyiliyinin ərazisində məskunlaşmasına təkan verən amillərdən başlıcası XVI-XVII əsrlərdə və XVIII əsrin I yarısında baş vermiş Səfəvi — Osmanlı müharibələri idi.

Çünki qeyd olunan müharibələr zamanı yerli müsəlman əhali — Azərbaycan türkləri ya qırılıb tələf olur, ya da şiə məzhəbindən olduqlarına görə Osmanlı ordusunun hücumları zamanı doğma torpaqlarını tərk etməyə məcbur olurdular. Məsələn, dövrün ilk mənbələri əsasında aparılmış tədqiqatlar təsdiq edir ki, 1583-cü ilin avqustunda Fərhad paşanın başçılıq etdiyi Osmanlı ordusu İrəvan bölgəsinin Şörəyel və Talın mahallarına daxil olan zaman yerli əhali öz torpaqlarını tərk edib Ağrıdağ və onun yaxınlığındakı yaylaqlara çəkilmişdi [192,346]. Belə hallarda yaranmış fürsətdən istifadə edən erməni kilsəsi osmanlıların işğal etdikləri Azərbaycan kəndlərini onlardan əlverişli qiymətə satın alır və Türkiyənin müxtəlif vilayətlərindən buraya axışan erməniləri həmin ərazilərə yerləşdirirdi.

Qeyd etmək lazımdır ki, Üçkilsə və onun ətrafındakı Azərbaycan torpaqlarında məskunlaşan ermənilərin burada daha da möhkəmlənməsinə Səfəvi hökmdarı I Şah Abbas (1587-1629) geniş imkanlar yaratmışdır. Belə ki, onun fərmanı ilə ermənilərə Səfəvi dövlətinin xarici ticarət əlaqələrinin həyata keçirilməsində geniş imtiyazlar verilmiş, dövlətin ərazisində yerləşən erməni kilsələrinə xüsusi güzəştlər* edilmişdi [174, 181-182; 126, 29, 32].

Bunu o zaman Üçkilsədə məskunlaşan ermənilərin özləri də təsdiq edirdilər. Bununla bağlı bir fakta diqqət yetirək. Üçkilsədəki erməni icmasının başçısı Filippos II Şah Abbasa (1642-1667) müraciətində yazırdı: "Hazırda bizim vilayətdə yaşayanların (yəni ermənilərin — ***red.***) əksəriyyəti buraya müxtəlif vilayətlərdən siz Əlahəzrət hökmdarın tükənməz qayğısı və sevgisi nəticəsində köçürülüb. Üçkilsədəki

* Səfəvi şahlarının xristianlara, o cümlədən ermənilərə belə qayğı göstərməsi Avropa dövlətlərinin Şərqin müsəlman ölkələrində yaşayan "xristianları himayə" siyasətinin və I Şah Abbasın Osmanlı imperiyasına qarşı apardığı müharibələrdə qərb dövlətlərindən odlu silahlar almaq siyasətinin nəticəsi idi.

300 mömin gecə-gündüz sizə dua edir ki, onlar burada yaşamaları üçün tamamilə Əlahəzrət hökmdarın mərhəmətinə borcludurlar" [73,368-369; 126,32, bax: bölmənin sonu, sənəd 2].

XVI-XVII əsrlərdə baş vermiş Səfəvi — Osmanlı müharibələrinin Azərbaycan üçün ən acı nəticələrindən biri azərbaycanlıların öz ata-baba torpaqlarını tərk etməsi idi. İrəvan əyalətinin 1590-cı il tarixli "Müfəssəl dəftər"in məlumatına görə, İrəvan əyalətinin türk-müsəlman əhalisinin sayı azalaraq 67,5%-ə [6,13], 1728-ci il tarixli "İcmal dəftər"inin məlumatına əsasən isə 61,2%-ə enmişdir [6,18].

XVIII əsrin I yarısında isə bu proses bir az fərqli şəkildə davam edirdi. Məsələn, 1735-ci ildə Nadir xan İrəvan əyalətini osmanlılardan azad etdikdən sonra bu əyalətdən 300 ailəni Xorasana köçürdü [82,6-7]. Bu hadisələrdən yararlanan Üçkilsə katolikosları isə İrəvanda ermənilərin sayını artırmaq üçün əllərinə düşən hər bir imkandan istifadə edirdilər. Məsələn, Nadir şah Muğanda tacqoyma mərasimindən sonra (1736) Azərbaycan xanlarının hamısına erməni əsirləri payladı. Bu zaman şahın qılığına girən katolikos Kənəkirli Abraham xristian məliklərinin köməyi ilə Azərbaycan torpaqlarında ermənilərin sayını artırmaq üçün Xorasandan və müxtəlif yerlərdən alınmış erməni əsirlərin bir qismini İrəvan bölgəsinə göndərdi [23, 252-255]. Bütün bunların nəticəsində İrəvan bölgəsi əhalisinin demoqrafik tərkibində ermənilərin xeyrinə nəzərəçarpacaq dəyişikliklər baş verirdi.

***İrəvan xanlığının əhalisi.*** Bütün bunlara baxmayaraq, yenə də əhalinin etnik tərkibində mühüm yeri Azərbaycan türkləri tuturdu. Bunu dövrün mənbələri bir daha təsdiq edir. XVIII yüzilliyn əvvəlində missionerlik məqsədilə İrəvana gəlmiş iezuitlər ordeninin üzvü, missioner Monye yazır: "Evlərdən daha çox bağçalar və üzüm bağlarına qərq olmuş şəhər ikiqat qala divarları ilə əhatə olunmuşdur. Əhalinin 1/4-i ermənilərdir" [100,154]. XVIII yüzillikdə İrəvanda olmuş Ma-

mi-Klerak Monyenin faktlarından təkcə faydalanmamış, hətta onu redaktə də etmişdir. Erməni tədqiqatçısı A.Q.İoannisyan da bu faktla razılaşaraq fransız tarixçisi, mühəndis Mami-Kleraka istinad edərək yazır ki, "qaynaqların məlumatına görə, ermənilər İrəvan şəhəri əhalisinin 1/4-ni, azərbaycanlılar isə böyük əksəriyyətini təşkil edirdi" [100,153; 34, LXXVII]. Beləliklə, bəhs olunan dövrdə də Azərbaycanın qədim Çuxursəd (İrəvan) bölgəsində və İrəvan şəhərində yaşayan əhalinin böyük əksəriyyəti Azərbaycan türklərindən ibarət idi. Bunu yuxarıda göstərilən erməni mənbələrinin məlumatları, həm də İrəvanda olmuş Avropa səyyahları və missionerlərinin verdiyi konkret faktlar, dövrün mənbələrindəki toponimlər və azərbaycanlılara məxsus mülklərin siyahısı da təsdiq edir [bax: bölmənin sonu, sənəd 1, əlavə 2].

Bundan əlavə, Nadir şahın dəftərində təsvir olunan İrəvan kəndlərinin siyahısına nəzər saldıqda Şörəyel məntəqəsində yerləşən 109 kəndin, demək olar ki, hamısının Azərbaycan türklərindən ibarət olması həmin kəndlərin adlarından da bəlli olur [58,42,43; bax: bölmənin sonu, əlavə 1]. XVIII əsrin II yarısının mənbəsi sayılan "Cambr"da qeydə alınmış toponimlərimiz də Üçkilsə və onun ətrafındakı torpaqlarda yaşayan ermənilərin yerli deyil, Azərbaycan torpağı olan İrəvan xanlığının ərazisinə gəlmə olduqlarını bir daha təsdiq edir [bax: bölmənin sonu, cədvəl 1, əlavə 2].

1813-cü ildə İrəvanda olmuş ingilis diplomatı Ceyms Moryer İrəvan xanlığı əhalisinin 100 min nəfər olduğunu göstərir və onun 25 min nəfərinin yaylaq-qışlaq (yaylaq-aran) təsərrüfatı ilə bağlı olduğunu qeyd edir [102,256]. Məhəmməd Həsən Vəlili də qeyd olunan dövrdə İrəvan xanlığında 115 min nəfər əhalinin yaşadığını yazırdı [133, 22].

XVIII əsrin sonu, XIX əsrin əvvəllərində İrəvan xanlığında əhalinin sayını və etnik mənsubiyyətini müəyyən etmək üçün başlıca mənbə İrəvan xanlığının işğalından sonra qraf İ.F.Paskeviçin göstərişi ilə

İ.Şopen* tərəfindən (1829-1832- ci illərdə) tərtib olunan Kameral Siyahıyaalmadır [95]. Lakin bu mənbənin məhz İrəvan xanlığının işğalından sonra tərtib olunmasını daim nəzərdən qaçırmamaq lazımdır.

Rusiya işğalı ərəfəsində İrəvan xanlığının bütün xristian** əhalisinin ümumi sayı 20%-dən çox olmamışdır. Bu faktı İ.Şopenin tədqiqatlarına əsaslanan erməni mənşəli qərb tarixçisi G.Bornoutyan da öz tədqiqatlarında etiraf edir [bax: 200, 59; 201,78; 145,121]. Bundan əlavə, müəllif İrəvan xanlığı ərazisindəki ermənilərin sayı ilə bağlı yazır: "Hər bir halda fars hakimiyyəti dövrünün (müstəqil İrəvan xanları dövrü — ***red.***) heç bir vaxtında erməni əhalisi nə çoxluq təşkil etmiş, nə də sayca müsəlmanlara bərabər olmuşdur. Tədqiqat bəzi mahallarda erməni çoxluğunu göstərsə də, bu həmin ərazidən 25.000-dən çox müsəlmanın getməsindən sonra baş vermişdi, buna görə də fars hakimiyyəti dövründə ermənilərin çoxluğu barədə heç bir dəlil yoxdur" [200, 59-60].

İrəvan xanlığının ərazisində yaşayan və əhalinin 80%-dən çoxunu təşkil edən müsəlman əhali*** haqda ilk mənbələrdə zəngin məlumatlar vardır. Qədim dövrdən Çuxursəd vilayətində yaşayan Sədli, Rumlu, Ustaclı, Alpout, Bayat və başqa Azərbaycan tayfaları İrəvan bölgəsinin idarəçiliyində mühüm rol oynayırdı. I Şah Abbasın dövründən isə bölgənin idarəçiliyində aparıcı rol buranın qədim sakinləri olan Ağcaqoyunlu Qacar tayfasına keçdi [173,141].

İ.Şopenin verdiyi məlumata görə, İrəvan xanlığı ərazisində öz saylarına görə bir-birindən fərqlənən aşağıdakı Azərbaycan-türk tayfa-

---

* Şopen İvan İvanoviç (1798-1870) — uzun müddət Qafqazda hərbi xidmətdə olmuş alman mənşəli bu şəxs Qafqazın hərbi hakimi İ.F.Paskeviçin tapşırığı ilə bölgənin siyahıyaalmasını tərtib etmiş və həmin əsərini 1852-ci ildə çap etdirmişdi. Həmin əsər Rusiya işğalı ərəfəsində və işğaldan sonra İrəvan xanlığında demoqrafik vəziyyətin və etnik tərkibin öyrənilməsində əvəzolunmaz mənbədir. Bu haqda IX bölmədə ətraflı məlumat verilir.

** İrəvan xanlığı ərazisində ermənilərin sayını süni şəkildə artırmaq məqsədilə əksər erməni müəlliflərinin əsərlərində burada yaşayan bütün xristianlar (qaraçılar, gürcülər, yəhudilər, aysorlar, xristian kürdləri və s.) erməni kimi qələmə verilir və bununla İrəvan bölgəsinin tarixi bilərəkdən ermənilərin xeyrinə saxtalaşdırılır. Məsələn, İrəvan şəhərində varlı xristian qaraçılardan ibarət 100 ailənin yaşadığı qeyd olunur [38,12].

*** Mənbələrdə çoxsaylı Azərbaycan türkləri və əsasən Səfəvi — Osmanlı müharibələri zamanı osmanlılar tərəfindən bölgəyə köçürülmüş müsəlman kürd tayfaları "müsəlman əhali" adı altında qeydə alınmışdır.

ları yaşayırdı: 5000-ə yaxın Qarapapaq, 3000-ə yaxın Ayrumlı, hər biri min nəfərdən çox olan Böyük Çobanqara, Sədli, Seyidli — Axsaqlı (Ağsaqqallı — ***red.***), Muğanlı, Qacarların Şahdilli* və Sədərəkli oymaqları, Cəlali və b. [95,535-538; Bax: cədvəl 2]. Nəzərə almaq lazımdır ki, bu tayfaların sayı Rusiya işğalından sonrakı dövrdə Qarapapaq və Ayrumlı tayfalarının və həmçinin digər tayfaların xeyli hissəsinin xanlıq ərazisini tərk etməsindən sonra hesablanmışdır.

İ.Şopenin məlumatlarına görə, işğal ərəfəsində İrəvan xanlığında 49.875 nəfər müsəlman (azərbaycan türkü — ***red.***), 324 nəfər kürd, 20.073 nəfər isə erməni yaşayırdı [95,635-642]. İrəvan xanlığında yaşayan müsəlman (azərbaycanlı) əhalinin sayını dəqiq müəyyən etmək üçün bu faktı da nəzərə almaq lazımdır. İrəvan xanlığında mövcud olan 521 kənddən 153-də müsəlman (azərbaycanlı) əhalinin yaşadığı qeydə alınmamışdır [200,38]. Şübhəsiz ki, bu kəndlərin azərbaycanlı əhalisi ya hərbi əməliyyatlar zamanı həlak olmuş, ya da Rusiya işğalından sonra xanlığı tərk etməyə məcbur olmuşdu. Əgər bu kəndlərin hər birində orta hesabla 25 ailənin və hər bir ailənin minimum 5 nəfərdən** ibarət olduğunu nəzərə alsaq, onda həmin kəndlərdə ən azı 19125 nəfərin yaşadığını ehtimal etmək olar.

İ.Şopenin digər məlumatına görə, "İrəvan xanlığında 521 yaşayış məskəni və 310 tərk edilmiş*** kənd var idi" [95,509-517]. Əgər bu kəndlərin hər birində orta hesabla 25 ailə və hər bir ailədə minimum 5 nəfərin olduğunu nəzərə alsaq, onda hər kənddə 125 nəfərin yaşadığını və tərk edilmiş 310 kəndin əhalisini də nəzərə alsaq, təqribən 38750 nəfərin yaşamış olduğunu qeyd etmək olar.****

Beləliklə, İrəvan xanlığının Rusiya tərəfindən işğalı ərəfəsində bu diyarın müsəlman-türk əhalisinin sayı azı 107.750 nəfər olmuşdur. Rusiya işğalı ərəfəsində erməni əhalinin sayı isə ümumi əhali sayının 18%-ə qədərini təşkil etmişdi.

---

* C.Bornoutyan öz əsərində "Şahdəli" kimi təqdim edir [bax: 200, 231].
** Məlumdur ki, müsəlman ailələrində uşaqların sayı çox olurdu və hər bir ailənin minimum 5 nəfər hesablanması şərti olaraq götürülmüşdür.
*** Şübhəsiz, həmin tərk edilmiş 310 kəndin əhalisi Azərbaycan türkləri idi. Onlar öz doğma kəndlərini tərk etməyə ya məcbur olmuş, ya da güclə çıxarılaraq qovulmuşdular.
**** Bu İrəvan xanlığını təkcə 1828-1832-ci illərdə məcburi şəkildə tərk etmiş Azərbaycan türklərinin təqribi hesablanmış sayıdır.

Bundan başqa, erməni mənşəli qərb tədqiqatçısı G.Bornoutyan da qeyd edir ki, İrəvan xanlığında ermənilər heç zaman nəinki üstünlük təşkil etmiş, hətta sayca azərbaycanlılara bərabər belə olmamışlar.* Mənbələrdə bu faktı təkzib edəcək heç bir məlumat yoxdur [200,60]. Çoxsaylı faktlar sübut edir ki, bu əzəli Azərbaycan torpağından minlərlə müsəlman (Azərbaycan türkləri — ***red.***) mühacirət etmiş, ermənilər isə İrandan və Osmanlı imperiyasından bu torpaqlara köçürülmüşdür. Nəticədə xristian əhali əhəmiyyətli sayda artmışdı (bu haqda IX bölmədə ətraflı məlumat verilir).

***İrəvan şəhərinin əhalisi.*** İrəvan bölgəsindən fərqli olaraq, qeyd olunan demoqrafik proseslər İrəvan şəhəri əhalisinin etnik tərkibində ciddi dəyişiklik yaratmadı. İrəvan şəhərində daimi yaşayan əhalinin tamamilə Azərbaycan türklərindən ibarət olmasını ilk mənbələr də təsdiq edir. Məsələn, XVII əsr fransız səyyahı Şardən İrəvanda olarkən (1673) Səfiqulu xan Çuxursəd bəylərbəyi və İrəvan hakimi idi. Şardən onun incəsənəti və elmi sevdiyini, hamının ona hörmət etdiyini göstərir [10,23]. Səyyahın məlumatına görə, "...İrəvan qalası təxminən səkkiz yüz evdən ibarətdir. Orada ancaq təmizqanlı qızılbaşlar (yəni Azərbaycan türkləri — ***red.***) yaşayırlar" [10,21].

Bununla yanaşı, digər avropalı səyyah — 1700-cü ilin yazında İrəvanda olmuş alman səyyahı Kaspari Şillinger də təsdiq edir ki, İrəvan şəhərində sayca və siyasi cəhətdən Azərbaycan türkləri tam üstünlük təşkil edirdi. O yazır: "İrəvan şəhərinin daxilində (yəni şəhərin qala divarları içərisində — ***red.***) yalnız iranlılar** (Azərbaycan türkləri — ***red.***), şəhərin nisbətən iri qəsəbəsində (görünür, Üçkilsədə — ***red.***) və müxtəlif yerlərdə kilsəyə xidmət üçün erməni tacir və sənətkarları yaşayır. Onlar iranlılara (Azərbaycan türklərinə — ***red.***) vergi verirlər"

---

* İrəvan xanlığının bütünlüklə 15 mahalındakı əhalinin sayı 115.155 nəfər olmuşdu [bax: 95,635-638].

** Avropa ölkələrindən Səfəvi dövləti ərazisinə gələn səyyahlar bir qayda olaraq məlumatları Üçkilsə katolikosundan alırdılar. Onların təsiri ilə bu missioner-səyyahlar Səfəvi dövlətini "İran dövləti", Azərbaycan türklərini isə "iranlılar" adlandırırdılar. İrəvan xanlığının real tarixi, təkzibolunmaz ilk mənbələr, xüsusilə bölgədəki bütün yer adlarının məhz Azərbaycan türkcəsində olması sübut edir ki, burada yaşayan qədim əhali məhz Azərbaycan türkləri idi.

[224,118]. "Qədim İrəvan" kitabında İrəvan əhalisindən bəhs edən Y.Şahəziz 1673-cü ildə İrəvanda olan fransız səyyahı Şardənin İrəvan qalasında yaşayan əhali haqda məlumatını bir daha təsdiq edir və daha maraqlı bir məqama toxunur. O yazır ki, ermənilərin orada (İrəvan şəhərində — ***red.***) yalnız dükanları var idi, onlar orada gündüzlər alver edir, axşamlar isə dükanlarını bağlayıb evlərinə gedirdilər [215,34; 116,5-6].

Ermənilər tərəfindən Rusiyaya və Avropanın digər xristian dövlətlərinə çatdırılan məlumatların təhrif olunmasını, ermənilərin sayının həmişə süni şəkildə şişirdilməsini nəzərə alsaq, demək olar ki, İrəvan şəhərinin özündə oturaq erməni əhalisi yaşamamışdır. Hələ, XVIII əsrin əvvəllərində İrəvan şəhərində oturaq erməni əhalinin yaşamadığını həmin dövrdə tərtib olunmuş arxiv sənədləri də təsdiq edir. Erməni-rus əlaqələrinə həsr olunmuş sənədlər toplusunun II cildinin I hissəsinə daxil edilmiş sənədlər içərisində maraqlı bir məlumat verilir. 1701-ci il 25 iyul tarixli "Yaddaş qeydləri" adlanan həmin sənəddə erməni avantüristi İsrail Ori rus qoşunlarını Cənubi Qafqaza yürüşə həvəsləndirmək üçün I Pyotra 18 bənddən ibarət layihə təklif edir. Layihənin 7-ci bəndində Rusiya imperatoruna İrəvan şəhəri haqda kəşfiyyat xarakterli məlumatlar çatdırılır və göstərilir ki, İrəvan şəhərində cəmi 300 nəfərdən bir az artıq erməni yaşayır və onlar da ticarətlə məşğul olurlar [35,213;126,31].

Nəzərə almaq lazımdır ki, İrəvanda olan avropalılar, o cümlədən missionerlər şəhərin xristian əhalisi barədə məlumatı Üçkilsə katolikosundan alırdılar. Buna görə də həmin məlumatlar çox zaman biləRəkdən şişirdilir və həqiqəti əks etdirmirdi. Bununla belə, Avropa səyyahları Şardən, Şillinger, XVIII əsr arxiv sənədləri və hətta erməni müəllifi Şahəziz də İrəvan qalası əhalisinin bütünlüklə, şəhər əhalisinin isə böyük əksəriyyətinin azərbaycanlılardan ibarət olduğunu yazır.

İrəvan şəhərində yaşayan əhalinin sayı haqda digər məlumatlar da var. C.Perri qaynaqların məlumatına əsaslanaraq Kərim xan Zəndin hakimiyyəti dövründə (1759-1779) İrəvan şəhəri əhalisinin 20 min nəfər olduğunu qeyd edir [210,230]. A.Muriel isə İrəvanı Cənubi Qafqazın ən sıx əhalisi olan şəhəri kimi göstərir [197,12].

Göründüyü kimi, İrəvan xanlığında əhalinin əksəriyyətini yerli Azərbaycan türkləri təşkil edirdi. Onlar siyasi hakimiyyətə tam sahib olmaqla xanlığı idarə edirdilər.

Lakin məhz yuxarıda qeyd olunan səbəblər üzündən ermənilər zaman keçdikcə Azərbaycanın qərb torpaqlarında — əvvəlcə Çuxursəd bəylərbəyiliyinin, sonra isə İrəvan xanlığının ərazisində məskunlaşa bildilər.

Ümumiyyətlə, XIX yüzilliyin əvvəlində — Rusiya işğalına qədər ermənilərin Azərbaycan torpaqlarında toplu halında yaşamasını dövrün heç bir qaynağı təsdiq etmir.

Beləliklə, nəzərdən keçirilən rəsmi sənədlərin, müxtəlif dövrlərdə tərtib olunmuş arxiv materiallarının, dövrün xristian missionerlərinin və səyyahlarının, erməni müəlliflərinin, eyni zamanda, elmi ədəbiyyatda toplanmış məlumatların müqayisəli təhlili İrəvan xanlığında yaşayan əhalinin etnik tərkibi barədə aşağıdakıları təsdiq edir:

— XVI əsrin əvvəllərindən başlayaraq davam edən Səfəvi — Osmanlı müharibələri nəticəsində Azərbaycanın qərb bölgəsinin şiə məzhəbli əhalisinin xeyli hissəsi öz doğma yurdunu tərk etməyə məcbur olmuş və bu səbəbdən də həmin bölgələrdə Azərbaycan türklərinin sayı müvəqqəti də olsa azalmışdır;

— hakimiyyət dəyişikliyindən yararlanan erməni kilsəsi boşalmış türk (Azərbaycan — ***red.***) kəndlərini və torpaqlarını rüşvət və hədiyyələrlə ələ keçirərək burada erməniləri yerləşdirmişdir [bax: 126,219];

Yuxarıda göstərilən səbəblər üzündən artıq XVIII əsrin əvvəllərində mərkəzi İrəvan şəhəri olan Çuxursəd bəylərbəyliyinin Üçkilsə

və ona yaxın kəndlərində ermənilərin sayı artmışdı. Bununla belə, göstərilən dövrdə də İrəvan şəhəri və ona yaxın bölgələrdə ermənilər elliklə məskən sala bilməmiş, yalnız müvəqqəti olaraq ticarətlə, habelə missionerlik fəaliyyəti ilə məşğul olmuşlar.

*Cədvəl 1.*

Erməni katolikosluğunun 1441-ci ildə Azərbaycan Qaraqoyunlu dövlətinin ərazisinə — Üçkilsəyə köçürülməsindən sonra erməni kilsəsinin ələ keçirdiyi Azərbaycan torpaqları

| sıra № | erməni kilsəsinin ələ keçirdiyi Azərbaycan torpaqları | erməni kilsəsinin ələ keçirdiyi Azərbaycan torpaqlarının yerləşdiyi ərazi | ilk mənbə səh. | erməni kilsəsinin ələ keçirdiyi Azərbaycan torpaqlarının əsl sahibləri və ermənilərin həmin mülkü hansı yollarla ələ keçirməsi haqda məlumat |
|---|---|---|---|---|
| **1** | **2** | **3** | **4** | **5** |
| 1 | Valarşabad* kəndi və onun mülkləri** | Qərbi mahalı | 99-108 | Kənd ilk dəfə tanınmış azərbaycanlı nəslinin nümayəndəsi, azyaşlı Səid bəyə məxsus idi. 1443-cü ildə Üçkilsə katolikosu Makulu Qriqor (1443-1455) bu kəndin bir hissəsini ondan satın ala bilir. Lakin çox keçməmiş mübahisə yaranır, azərbaycanlı Mələk xatun və 14 nəfər miras sahibi iddia qaldıraraq satılan mülkü geri qaytara bilir. 1445-ci ildə katolikos Qriqor yenidən müsəlman Rüstəmdən bu kəndin bir hissəsini ala bilir.<br>XVII əsrdə Üçkilsə katolikosu Serdpion (1603-1625) İrəvan bəylərbəyi Əmirgünə xan Qacara (1604-1625) kəndin və onun mülklərindən alınan verginin Üçkilsəyə məxsusluğunu təsdiq etdirə bilir.<br>İrəvan bəylərbəyi Təhmasibqulu xan (1625-1635) kəndin mülklərini geri qaytarıb xəzinə torpaqlarına qatır və Valarşabad kəndini şəxsi mülk kimi satıb-bağışlamaq hüququnu yalnız onun ilk sahibləri olan müsəlmanlara (Azərbaycan türklərinə — ***red.***) verir. |

* Erməni dilində heç bir izahı olmayan "Valarşabad" toponimi Arşakilər (Arsaklılar) sülaləsindən olan Sanatürkün (Sanatrukun) oğlu Valar şahın (194-216) adı ilə bağlıdır. Uzun tarixi dövr ərzində "Valarşabad" kimi işlənmiş bu toponim erməni ədəbiyyatında təhrif olunaraq "Vağarşabad" ("Վաղարշապատ") formasına salınmışdır. Valarşabadın əsası Valar şah tərəfindən qoyulmuşdu [bax: 95,116; 190, 29].
** Üçkilsə katolikosunun ələ keçirdiyi Azərbaycan torpaqları olan Masdara, Oşakan, Frankatos, Kirəcli, Dibəkli və Keşişkənd haqqında cədvəlin ayrı-ayrı hissələrində məlumat verilir.

| 1 | 2 | 3 | 4 | 5 |
|---|---|---|---|---|
| | | | | II Şah Abbas (1642-1667) dövründə Üçkilsə katolikosu Flippos (1633-1655) şahın qılığına girərək kəndin guya kilsəyə məxsusluğunu təsdiqlədə bilir.<br>Əmirgünə xanın oğlu Abbasqulu bəy (1663-1666) Valarşabad kəndinin mülklərini yenidən geri qaytarıb xəzinə torpaqlarına qatır. Üçkilsə katolikosu Culfalı Hakop (1655-1682) Süleyman şahın (1667-1694) qılığına girərək kəndi raqam olaraq ala bilir.<br>Üçkilsə katolikosu Naxapet (1691-1709) Şah Sultan Hüseyndən (1694-1722) bu kəndi və onun mülklərini yenidən rəqam alaraq möhkəmləndirə bilir.<br>Osmanlı sərkərdəsi Rəcəb paşanın (1724-1727) qılığına girən Üçkilsə katolikosu Astvasatur (1714-1730) Valarşabad kəndi və kəndin mülklərinin kilsəyə məxsusluğunu təsdiqlədə və digər kəndləri** də ələ keçirə bilir.<br>Nadir şahın (1736-1747) qılığına girən Üçkilsə katolikosu Kənəkirli Abraham (1734-1736) bu kəndlərin guya Üçkilsəyə məxsus olmasını təsdiqlədə bilir. |
| 2 | Oşaqan* kəndi | Qərbi mahalı | 37, 108-112 | Kənd ilk dəfə olaraq Üçkilsə tərəfindən Səədlu tayfasından olan Sultan bəydən alınıb. Kənd muğanlı tayfasından olan Azərbaycan türklərinin irsi mülkiyyəti olub. Yerli Azərbaycan türkləri — Baba, Bəngəli və Bəyim kəndi geri qaytara bilsələr də, yenidən katolikosa satmağa məcbur olurlar. Bu alqı-satqı sənədi türk dilindədir. |

*"Oşaqan" və yaxud "Uşaqan" mənşəcə İrəvan bölgəsində yerləşən eyniadlı dağla [170,197] eyni kökdəndir. Tədqiqatçıların fikrincə, Altay dillərində oşiq — "külək tərəfindən çox aşınmış dağ süxuru" deməkdir [110,351].

| 1 | 2 | 3 | 4 | 5 |
|---|---|---|---|---|
| | | | | Sonra ayrı-ayrı vaxtlarda yerli sakinlər Həsən və Hüseyn, Sultan bəyin nəvəsi İsmayıl bəy, Məclumqulu bəy, Zeynəbşah, Təhmasib bəyin oğlu Məclum bəy, Əmiraslan bəyin oğlu Hüseyn bəy və digərləri bu kəndi və onun mülklərini geri qaytara bilirlər.<br>Lakin Osmanlı sərkərdəsi Rəcəb paşanın (1724-1727) qılığına girən katolikos Astvasatur kəndi ələ keçirərək kilsəyə məxsusluğunu təsdiqlədir. |
| 3 | Franqanos* | Qərbi mahalı | 112-114 | İrəvanlı Əmir bəyin oğlu Abdullanın mülküdür. O, kəndi Hacı Xızır oğlu Hacı İbrahimə və Süleymana satdı. Bundan sonra kənd digər Azərbaycan türklərinə — Aralıq kənd sakini Əli ağaya, onun ölümündən sonra oğlanları İbrahim, Yaqub və Məhəmmədə, qızı Hüri xanıma və ölən qardaşları Teymur xanın arvadına, daha sonra isə Hüseyn xanın qızı Bəyim xanıma məxsus olub. Lakin kəndi Üçkilsə katolikosu Culfalı Hakop ələ keçirə bilir. Katolikos Abrahamın dövründə kənd yenidən öz keçmiş sahiblərindən olan Mustafa bəy tərəfindən geri alınır.<br>Səfəvi — Osmanlı müharibələri nəticəsində kənd xaraba qalır. 1760-cı ildə Üçkilsə katolikosu Şamaxılı Hakop (1759-1763) müxtəlif yerlərdən ermənilərin bu kəndə köçürülməsinə İrəvan xanı Hüseynəli xan Qacardan (1759-1783) icazə alır. Beləliklə, Üçkilsə monastırı yenidən kəndi zəbt edərək öz mülkiyyətinə keçirə bilir. |

* Franqanos — 1728-ci il İrəvan əyalətinin İcmal dəftərində Firəng kimi qeyd olunur. XIV əsrdə İtaliya katolik misssionerləri İrəvan əyalətinə gələrək katolik məzhəbini yaymış, bəzi kəndlərdə bu məzhəbi qəbul etdirmiş və Azərbaycan türklərinin "Firəng" adlandırdığı monastırı tikmişlər. Lakin erməni kilsəsi bu kəndləri tədricən qriqorianlaşdıra bilmişdir [bax: 95, 327; 110, 397].

| 1 | 2 | 3 | 4 | 5 |
|---|---|---|---|---|
| 4 | Məsdərə* | Qərbi mahalı | 114-115 | XVI əsrdə kəndin sakini Müqəddəm Bağır xanın oğlu Məhəmməd ağa kəndi Tərxan Sarkis oğlu adlı bir erməniyə satır. Dəfələrlə əldən-ələ keçən bu kənd XVIII əsrin əvvəlində Üçkilsə katolikosu Culfalı Aleksandr (1707-1714) tərəfindən ələ keçirilir. Alqı-satqı sənədi türk dilindədir. |
| 5 | Kirəşli və ya Piridərviş | Aparan mahalı | 116-117 | Kəndi katolikos Qriqor Əmir Rüstəmdən alıb. Sonralar katolikos Culfalı Hakopun dövründə Qasım adlı müsəlman kəndin ona aid olduğunu bildirən şikayət edir, lakin İrəvan xanı və şeyxülislam bu şikayəti təmin etmir. XVII əsrin sonlarında Hacıbəy Şahgəldinin oğlu Allahverdi bəy Qacar kəndin mülklərini geri qaytara bilir.<br>XVIII əsrin əvvəllərində İrəvanlı Eminin oğlu Əliqulu və Zeynalabdin anasından qalma alqı-satqı sənədlərini məhkəməyə təqdim edərək kəndin onlara məxsusluğu haqda iddia qaldırır. Katolikos Naxapet pul ödəyərək kəndi əlində saxlaya bilir.<br>Nadir xan Əfşarın qılığına kirən katolikos Abraham 1735-ci ildə kəndi yenidən ələ keçirərək Üçkilsəyə məxsusluğunu təsdiqlədə bilir. |
| 6 | Muğni** | Qərbi mahalı | 117-119 | Kəndi ilk dəfə katolikos Qriqor Əmir Rüstəmdən alıb.<br>Lakin Culfalı Hakopun dövründə İrəvanlı Əbdülbaqi və oğlu Əlidostu II Şah Abbasa (1642-1667) kəndin mülklərinin onlara aid olduğunu və katolikosun qeyri-qanuni istifadə etdiyi haqda şikayət edir. |

* "Məsdərə" toponiminin birinci tərəfindəki "məs" sözü türk dillərində "dağın və ya yüksəkliyin cənub, meşəsiz tərəfi" anlamında [165,369], yəni "meşəsiz dərə", "çılpaq dərə" mənasındadır. Gədəbəydə Masxit, Ordubad rayonunda Masnis dağ adları ilə mənaca eyniköklüdür [bax: 110, 332].

** Muğni — İrəvan bölgəsinin qədim əhalisi olan Muğanlı tayfasının adı ilə bağlıdır. Məsələn, XVIII əsrə aid mənbədə — "Cambr"da dəfələrlə Muğanlı tayfasının adı çəkilir [105,37,105 və s.].

| 1 | 2 | 3 | 4 | 5 |
|---|---|---|---|---|
| | | | | II Şah Abbas İrəvan xanı Nəcəfqulu bəyə bu məsələni həll etməyi tapşırır. Ancaq Əbdülbaqinin ölümü şikayətin həll olunmasını yarımçıq qoyur. Əbdülbaqinin arvadı Şəhribanu xanım qardaşı Yusiflə bu məsələni yenidən qaldırır. Lakin müxtəlif vasitələrlə şeyxülislamı ələ alan Üçkilsə xadimləri məsələni kilsənin xeyrinə həll edə bilirlər.<br>1760-cı ildə İrəvanlı Hüseynəli xanın vəziri İbrahim ağa kəndin mülklərini geri qaytara bilsə də 1768-ci ildə Üçkilsə bu kəndi yenidən ələ keçirir. |
| 7 | Dibəkli | Aparan mahalı | 119 | XVI əsrin sonlarında kəndin mülklərini Qoyulhisarlı Vəli ağanın oğlanları Məhəmməd ağa və Əhməd ağa xəlifə Alpout Xəlilin oğlu İbrahim xəlifəyə satır.<br>1682-ci ildə Qacarlar tayfasından olan Hacıbəyli Şahgəldinin oğlu Allahverdi Qacar bu kəndin mülkləri ilə yanaşı Kirəşli və Keşişkəndi də geri qaytara bilir. Lakin XVIII əsrin əvvəllərində Vardapet Stepan İrəvan xanına (Çuxursəd bəyləribəyi — ***red.***) şikayət edərək kəndin mülklərini yenidən satın ala bilir. Nadir şahın (1736-1747) qılığına girən Üçkilsə katolikosu Abraham Kənəkirli (1734-1736) bu kəndin Üçkilsəyə məxsus olmasını təsdiqlədə bilir. |
| 8 | Keşişkənd* və ya Aydındəvriş ya da Çələbikənd | Qırxbulaq mahalı | 120 | Kənd Gülfərhad ağaya məxsus olub. XVII əsrin 70-ci illərində katolikos Hakop onun oğlu Gülismayıl ağadan kəndin mülklərini satın almışdır. Bir müddət sonra Gülismayıl ağa İrəvan xanı Səfi xana şikayət edir. |

* Keşişkəndin əvvəlki adı Aydındəvriş və ya Çələbikənd olmuşdur [105,120].

| 1 | 2 | 3 | 4 | 5 |
|---|---|---|---|---|
| | | | | Kəndin mülklərini satın alan Üçkilsə katolikosları həm də onun qədim alqı-satqı sənədlərini əldə edə bilmişdilər. |
| 9 | Noraq-yuq* | Qırxbulaq mahalı | 121 | Əvvəllər Məhəmmədqulu xanın olub, Sarkisin oğlu Hakopcan (türkcə ona Manşır və ya Sarı xan deyirlər) II Şah Abbasa (1642-1667) şikayətə gedərək kəndi ələ keçirə bilir və 1660-cı ildə Üçkilsəyə satır. |
| 10 | Nork** | Qırxbulaq mahalı | 122 | Təbrizli Əhməd bəyin oğlu Əlidost və İrəvanlı Müslümün oğlu Məhəmməd Sadiq və Məhəmməd Maqsud Əmirgünə xanın oğlu Nəzərgünə xana satmışdır. 1674-cü ildə Üçkilsə katolikosu Culfalı Hakop (1655-1682) bütün mülkü ilə bərabər kəndi Sarıxan adlı bir nəfərdən alan zaman onun qədim sənədlərini də əldə edə bilmişdir. |
| 11 | Eqvard*** | Qırxbulaq mahalı | 122-123 | Kəndin mülkləri ilk öncə Murad bəyə məxsus idi. II Şah Abbasa şikayət edən erməni Hakopcan kəndi əlinə keçirir. Sonralar bu kəndin mülkləri xalisə olaraq dövlətin ixtiyarına keçmişdi. Lakin 1768-ci ildə — Hüseynəli xanın (1759-1783) dövründə yenidən Üçkilsə katolikosları tərəfindən ələ keçirilir. |
| 12 | Yayıcı | Dərəçiçək mahalı | 124-125 | Bu kənd vaxtilə İrəvanlı Xoca Setə (Sarıxana) məxsus olub. 1660-cı ildə Üçkilsə katolikosu Culfalı Hakop kəndi ələ keçirə bilmişdir. |

* Noraqyuq kəndinin adı Azərbaycan türkcəsindən ermənicəyə tərcümə olunub "Yeni kənd" deməkdir.
** Nork — orta əsrlərdə ermənicə mənbələrdə Nork (türkcə Noruq) kimi yazılmışdır. Əhalisi çölməkçiliklə (dulusçuluqla) məşğul olduğundan kəndin əsl adı Çölməkçidir [bax: 110,348].
*** "Eqvard" — qədim türk dillərinə məxsus olan bu toponim dövrün mənbələrində müxtəlif cür, "Eqaverd", [6,36], "Yeqvard" [95,55] kimi təqdim olunur. Sürməli mahalında Aqavard, Qars əyalətinin Oltin dairəsində Zuvard və s. formaları var. Azərbaycanın "Salvartı" (dağ adı) toponimləri ilə sıra təşkil edir [bax: 110,242].

| 1 | 2 | 3 | 4 | 5 |
|---|---|---|---|---|
| 13 | Əmirqyuq* | Dərəçiçək mahalı | 124-125 | Kənd əvvəlcə Məhəmmədqulu xana məxsus olub. Xoca Hakopcan II Şah Abbasın yanına şikayətə gedərək kəndi ələ keçirə bilir və bir az sonra kəndi Üçkilsəyə satır. |
| 14 | Məlik-qyuq** | Aparan mahalı | 125 | Kənd əvvəlcə Alpoutlu İbrahimin oğlu Rzaquluya məxsus olub. Lakin kəndi Üçkilsə katolikosu Culfalı Hakop ələ keçirə bilmişdir. |
| 15 | Bətrinc | Qərbi mahalı | 125-126 | Bətrinc kəndini Üçkilsə katolikosu Makulu Qriqor Əmir Rüstəmdən alıb. Ölkədə vəziyyət gərginləşən kimi müsəlmanlar kəndin mülklərini geri qaytara bilirlər. Qədim alqı-satqı sənədinə görə isə Hüseyn bəyin oğlu Əlican bəy kəndin mülklərini Yaqub bəyin oğlu İbrahim bəyə satmışdı. Lakin Üçkilsə katolikosu Culfalı Hakop kəndi Şahəhmədin oğlu Bayram bəydən alaraq kilsənin mülkiyyətinə qata bilir. |
| 16 | Çaşırlı | Qərbi mahalı | 126-127 | Kənd əhalisi kəndi qədimdən öz razılığı ilə vəqf olaraq kilsəyə verib. Ehtiyacları olduğu dövrdə isə kənd əhalisi mülklərini geri alıb. Üçkilsə katolikosu Culfalı Hakop dövründə isə kənd tamamilə kilsənin mülkiyyətinə keçib. |
| 17 | Çopanis*** | Qərbi mahalı | 127 | Əvvəlcə Babi oğlu Edqar kəndin mülklərini Həmədanlı Mollayusif oğlu Amanallaha satmışdır. XVII əsrdə Üçkilsə katolikosu Yeqiazarın dövründə, 1687-ci ildə Hacıbəyli Yusif ağa kəndin mülklərinin ona məxsus olduğu haqda iddia qaldırır. |

* Əmirqyuq kəndinin adı Azərbaycan türkcəsindən ermənicəyə tərcümə olunub "Əmirkənd" deməkdir.
** Məlikqyuq kəndinin adı Azərbaycan türkcəsindən ermənicəyə tərcümə olunub "Məlikkənd" deməkdir.
*** Çopanis — ümumtürk dillərinə məxsus olub, mənşəcə peçeneqlərin Çopan (Çupan) tayfasının adını əks etdirir [bax: 110,426].

| 1 | 2 | 3 | 4 | 5 |
|---|---|---|---|---|
| | | | | Lakin katolikosun müavini vardapet Petros şeyxülislama buğda və arpa ödəyərək kəndin mülklərini və sənədlərini ələ keçirə bilir. |
| 18 | Qaraqoyunlu və ya Yolkəsən | Qərbi mahalı | 127-128 | Kənd Xoca Sukiaza məxsus idi. XVII əsrdə kəndin mülkləri Üçkilsə katolikosu Filippos tərəfindən satın alınıb. |
| 19 | Əştərək* | Qərbi mahalı | 128-129 | Kəndi ilk dəfə Üçkilsə katolikosu Makulu Qriqor Əmir Rüstəmdən alıb. Müəyyən dövrlərdə müsəlmanlar tərəfindən geri alınıb. Lakin XVII əsrdə Üçkilsə katolikosu Flippos kəndi yenidən ələ keçirə bilir. |
| 20 | Ağavnatun** | Qərbi mahalı | 129 | Bu, Üçkilsə katolikosu Makulu Qriqorun satın aldığı 7 kənddən biridir. 1768-də kilsə onu İrəvanlı Süleyman bəy Qacardan satın ala bilmışdır. |
| 21 | Noraqovit*** | Qırxbulaq mahalı | 129 | Ermənilər tərəfindən ələ keçirilməsinin dəqiq tarixi haqda məlumat əldə etməmişik. |
| 22 | Byurakan | Qərbi mahalı | 129 | Ermənilər tərəfindən ələ keçirilməsinin dəqiq tarixi haqda məlumat əldə etməmişik. |
| 23 | Hacılar | Qərbi mahalı | 129 | Ermənilər tərəfindən ələ keçirilməsinin dəqiq tarixi haqda məlumat əldə etməmişik. |

Mənbə:
Սիմէօնէ Երեւանցիոյ: Ջամբռ: Գիրք, որ կոչի յիշատակարան արձանացուցիչ, հայելի եւ պարունակող բնավից որպիսութեանց Սրբոյ Աթոռոյս, եւ իւրոյ շրջակայից վանօրէիցն: Վաղարշապատ: ՌՀԻԳ:
[Simeon İrəvanlı. Cambr. Müqəddəs Üçmüədzin kilsəsinin və ətraf monastırların toplusunun müfəssəl aynası və xatirə kitabı. Vağarşapad, 1873].

* Əştərək — Azərbaycan türklərinin yaşadığı qədim kənd. Qars əyalətinin Kağızman dairəsindəki Xaş-Terek kəndi, Xaş-tarak qışlağı, Qazax qəzasında Həştərək kəndi Albaniyada erkən orta əsrlərdə Arsaqda Aqterek toponimləri ilə mənşəcə eynidir. Buradan belə nəticəyə gəlmək olur ki, toponimin erkən forması məhz Xaş-Terek olmuş, sonralar Əştərək formasını almışdır. Kəndin adı Xaç Daş və qədim türkcə Terek — "Şam ağacı" sözlərindən ibarətdir [bax: 110, 259].
** "Ağavnatun" və "Ağavyurd" toponimlərindəki Ağav sözünün erməni dilində mənası yoxdur. Ola bilsin ki, bu toponim Azərbaycan albanlarına məxsusdur.
*** Noraqovit — toponim Azərbaycan türkcəsindəki "Yeni oba", "Yeni nəsil" sözünün ermənicəyə təhrif olunmuş tərcüməsidir. "Nor" — yeni, "ovit" — "oba", "nəsil" deməkdir. Ümumiyyətlə, türk dillərinə aid olan "ova", "nəsil" sözü, rus dilinə də tərcümədə "ovit" kimi verilir [bax: 111,6].

| Имена и прозвания | Отметка |
|---|---|
| 1. Гаджи Наджаф Эиив оглы | Куплено место уже тем Гаджи Наджафа имеет купчую крепость на русском языке 1842 года |
| 2. Гаджи Али Эйваз оглы | Имеет купчую с 1830 года на русском и татарском языках, данную Шариатом |
| 3. Гаджи Джафар Таптых оглы | Имеет купчую крепость с 1805 года, данную Шариатом |
| 4. Машади Имам Кули Гарабагли | Имеет купчую с 1812 года, данную Шариатом |
| 5. Калантар бек Улуханлинский | Имеет купчую на татарском языке, он находится ныне в деревне, а купчая еще не представлена. |
| 6. Машади Сафар Калбалай Апкер оглы | Имеет купчую крепость с 1826 года от Шариата |
| 7. Согутлу, занимаемая под огород полковником Клинем | |
| 8. Юзбаши Асатур Челабов | Купчую не имеет. |
| 9. Машади Сафар Келбалай Апкер оглы | Имеет купчую крепость от Шариата. |
| 10. Гаджи Джафар Таптых и Машади Сафар Хафар Калбалай Алапкер оглы | |
| 11. Гаджи Садых Гаджи Ибрагим оглы | Имеет купчую на русском и татарском языках, которая находится в палате главного и гражданского суда. |
| 12. Гаджи Али Усуп оглы | Имеет купчую на русском языке 1837 и 1840 года. |
| 13. Машади Ибрагим Калбалай Иман верды оглы | Имеет купчую с 1805 года от Шариата |
| 14. Гаджи Мамад Кули Пишиаз | Имеет купчую на татарском языке с 1796 года от Шариата. |
| 15. Майор Ахмед Хан | Имеет [купчую] от Шариата, которая у сына его, находящегося теперь в г. Тифлисе... |

| | |
|---|---|
| 15а. Гаджи Кярим Султан | Имеет купчую с 1734 года от Шариата. |
| 16. Имам Мирза Баба оглы | Имеет купчую на русском и татарском языках с 1817 года от Шариата. |
| 17. Казенная земля, называемая Ханлуг | Находится на откупе эриванского жителя Клук бека. |
| 18. Тоже таковая | |
| 19. Калбалай Зейнаб жена Гасан Калбалая | Имеет купчую старую, но неизвестно, где оная находится. |
| 20. Калбалай Каландар Калбалай Гусейн оглы | Имеет купчую на татарском языке с 1826 года от Шариата. |
| 21. Али Мамад Мамад Али оглы | Имеет купчую на татарском языке с 1837 года. |
| 22. Есаул Улухан бек | Купчую не имеет, а владеет местом с 1800 года. |
| 23. Калбалай Каландар Калбалай Гусейн оглы | Имеет купчую на татарском языке с 1826 года от Шариата. |
| 24. Гаджи Мусаджин Али оглы | Купчую не имеет |
| 25. Улухан бек Юнжилук | Купчую не имеет, а владеет местом с 1800 года |
| 26. Казенный Юнжилуг | Находится на откупе у Касум бека |
| 27. Арсентий Подтумянов | Купчих крепостей никаких не имеет на общем положении... пользуется с 1828 года. |
| 28. Калантар бек Улуханлинский | Купчую не имеет |
| 29. Квартальный Челябов | Купчую не имеет, а владеет местом полковник Киль. |

*ЦГИА Арм. ССР, ф. 133, д. 214, л. 12—13*

Sənəd 1.
XIX əsrin I yarısında İrəvan şəhəri sakinlərinə məxsus mülklərin siyahısı
***Mənbə:*** ЦГИА Арм. ССР, ф. 133, д. 214, л. 12-13; В книге: Развитие Еревана после присоединения Восточной Армении к России (сб.документов, 1801-1917 гг.). Составил: Т.Х.Акопян. Ереван, 1978, с.110-111.

*Əlavə 1.*

*"Nadir şahın dəftəri"nə görə İrəvan bölgəsinin*
*Şörəyel distansiyasındakı kəndlərin siyahısı*

Şörəyel distansiyası 109 kənddən ibarətdir. Həmin kəndlər bunlardır: 1) Məliki, 2) Quqarlı, 3) Başkənd, 4) Savucbulaq, 5) Tuləkli, 6) Dərəkənd, 7) Boğazkəsən, 8) Yenikənd, 9) Qulucan, 10) Qaraqışlaq, 11) Qurukənd 12) Yenikənd, 13) Kəndümə, 14) Cöyərçinliülya, 15) Korhəsən, 16) Qaratəpə, 17) Tünkeçi, 18) Şiştəpə, 19) Qaramlı, 20) Sarıqaya, 21) Dərbənd, 22) Əlikli, 23) Qonaqpiran, 24) Yuva, 25) Cəyirli, 26) Üçtəpə, 27) Ortakilsə, 28) Rincame, 29) Duztəpə, 30) Qarakilsə və Tatarlı, 31) Anurdərə, 32) Ağuran-Tatarlı, 33) Gülablı, 34) Hurqala, 35) Qəfəsəli, 36) Qarabulaq-Muğanlı, 37) Bağdacıq, 38) Gümrü, 39) Qapılı, 40) Ərtik, 41) Qıpçaq, 42) Arxvəli, 43) Bəykəndi, 44) Horum, 45) Məscidli, 46) Dəmirdaş, 47) İlanlı, 48) Tağacıq, 49) Yuvamlı, 50) Yeniqalaça, 51) Qabaqtəpə, 52) Gülkəndi, 53) Malkəndi, 54) Günbəzli, 55) Abnus, 56) Xalqverdi, 57) Təpədölək, 58) Duzkəndülya, 59) Şirəli, 60) Yolkeçən, 61) Ağkilsə, 62) Sulukənd, 63) Çiləkli, 64) Şiştəpə, 65) Büzük, 66) Verpilər, 67) Nəcəfbulaq, 68) Mehdiqulu, 69) İsaxanlı, 70) Pukiqıran, 71) Qarahəmzəli, 72) Qarakələ, 73) Ağbulaq, 74) Həsənkəndi, 75) Kürkübulaq, 76) Qoşayataq, 77) Kökörən, 78) Qarakilsə, 79) İlanlı-Muğanlı, 80) Ağcakənd, 81) İshaq, 82) Ərmə, 83) Qat, 84) Porsuxlu 85) Xarçəkəsən, 86) Ağbulaq, 87) Cülkəndi, 88) Çobangirməz, 89) Qaraqotur, 90) Qırxdəgiranlar, 91 Nəzərəlikəndi, 92) Qalaça, 93) Xasmənli, 94) Saf, 95) Muncisli, 96) Əlikiçik, 97) Əsradür, 98) Qızılqoç, 99) Şə - rəbxana, 100) Sərək, 101) Şəkərabad, 102) Əlifəna, 103) Bulaqçox, 104) Xanımkəndi, 105) Göyərçinli, 106) Qaramabad, 107) Başxaraba, 108) Qarabulaq, 109) Çinikənd

*Список Эриванским деревням по журналу Надир-шаха (к рапорту № 358)*

Шурагельская дистанция состоит из 109-ти деревень, а именно: 1) Мелику, 2) Гугерулу, 3) Баш-кент, 4) Савудж-булах, 5) Тулекку, 6) Деректент, 7) Богаз-кесен, 8) Эин-кент, 9) Кулиджан, 10) Кара-кишлак, 11) Кури-кент, 12) Эин-кент, 13) Кендуме, 14) Кукерчинлу-улья, 15) Тун-кечи, 16) Кара-тепе, 17) Кор-Асан, 18) Шиш-тепе, 19) Гарамлу, 20) Серикаи, 21) Дербенд, 22) Аликлу, 23) Кунак-Пиран, 24) Юва, 25) Чаирлу, 26) Уч-тепе, 27) Орта-Килиса, 28) Рин-джаме, 29) Дуз-тепе, 30) Кара-Килиса и Татарлу, 31) Анур-дере, 32) Ак-Уран-Татарлу, 33) Гюлаблу, 34) Хур-кала, 35) Кафас-Али, 36) Карабулаг-Муганлу, 37) Багдаджук, 38) Гумри, 39) Капул-ли, 40) Артик, 41) Кипчак, 42) Арх-вели, 43) Бек-кенти, 44) Горум, 45) Мечетлу, 46) Томар-таш, 47) Иланлу, 48) Тагаджук, 49) Ювамлу, 50) Эин-Калаче, 51) Кабак-тепе, 52) Гюль-кенти, 53) Мал-кенти, 54) Кунбедлу, 55) Абнус, 56) Халкверди, 57) Тепе-долек, 58) Дуз-кент-улья, 59) Ширали, 60) Йол-кечен, 61) Ак-килиса, 62) Суикент, 63) Чилеклу, 64) Шиштепе, 65) Пусик, 66) Верпилер, 67) Неджеф-булак, 68) Мехти-Кули, 69) Исаханлу, 70) Пукикрань, 71) Кара-Гемзелу, 72) Кара-Келе, 73) Ак-булак, 74) Асан-кенти, 75) Курку-булак, 76) Коша-Ятак, 77) Кок-Уран, 78) Кара-Килиса, 79) Иланлу-Муганлу, 80) Агдже-кент, 81) Исаак, 82) Арма, 83) Кат, 84) Порсухлу, 85) Харчекесен, 86) Ак-булак, 87) Гюль-кенти, 88) Чобан-Кирмез, 89) Кара-Кутур, 90) Кирх-Декиранлар, 91) Назарали-кенти, 92) Калаче, 93) Хасманлу, 94) Саф, 95) Мунджислу, 96) Али-Кучек, 97) Асрадур, 98) Кизил-Коч, 99) Шарабхана, 100) Серек, 101) Шекерабад, 102) Али-Фена, 103) Булак-чок, 104) Ханум-кенти, 105) Кукерчинлу, 106) Гарамабад, 107) Баш-хараба, 108) Карабулак, 109) Чиникенти.

***Mənbə:*** Кавказский Сборник, т. XX, (Рапорт князя Северсемидзе ген. Ермолову, 15-го июля 1825 г. № 358. Сел. Большой Караклис). Тифлис, 1900, с.42-43.

*Əlavə 2.*

XVIII əsrin II yarısında İrəvan xanlığı ərazisində qeydə alınmış bəzi Azərbaycan toponimləri

Ağcaqala
Ağpara
Alabər
Alacakilsə
Altuntaxt
Axsaxlı
Armudağacı
Apadar
Aparan
Arpaçay
Arpat
Aydındərviş
Aylakak
Azat
Balaxata
Başaparan
Bazaraşan
Bənd
Bətrinc
Bəzirganyolu
Bicni
Böyük Əncəluq (meydan)
Böyük Dizaq
Böyük Qlan
Buğdatəpə
Buzxana
Büraxan
Bürəkan
Cəfərabad
Canıbəy (dəyirman)
Culud
Çapar
Çaşırlı
Çatqıran
Çayqaytaran (monastır)
Çələbikənd
Çırpılı
Çobanitək
Çubuqlu
Damcılı
Daştağ
Dərəçiçək
Dərəkənd
Dəmirbulaq
Dəliqardaş
Dibəkli
Dəlilər
Dilənçi
Düdəngi
Elar
Eşşəkquduran
Eyvazlı
Ələtli
Əlibəyli

Əlibaba
Əliqucaq
Ərincə
Əmiri
Əmirkənd
Əmirbar
Ərinc
Ərkəcli
Əştərək
Gedərgöl
Gəlişən
Gərnibasar
Gərni (yer və çay)
Goğb
Gölkənd
Göykilsə
Göykümbəz
Gözəldərə
Gözlü
Gülablı
Güləli
Güllücə
Hacılar
Hacıqara
Hacıbəyli
Hacı Niyaz (üzüm bağı)
Həgrigöl
Həcər
Həsənbulaq
Hamamlı
Xəndək (arx)
Xanbağı
Xatunarxı
Xanbağı
Xanlıq (üzüm bağı)
Xarbənd
Xaluc
Xabul
İlxıçı
İmamarx
İlanlı
İmamşarlu
İrişad
İlkəvəng
Kirəşli
Keşişkənd
Kültəpə
Karakit
Kasax (çay)
Kzloran
Köndələn meydan
Kolanı
Kankan
Kamal
Kənəkir
Kiçik Qılan
Kəməndbulaq
Karvansara
Korbel
Kiçik dizaq
Korkotan
Karvansaray

Kümbəzli
Qərbibasar
Qərbi
Qorux
Qırxbulaq
Qaraqoyunlu
Qarakilsə
Qalar
Qaraxaç
Quzuludərə
Qaradaş
Qoyulhissar
Qıpçaq — monastır
Qeçaris — monastır
Qarakit
Qaraçay
Qalar əndi
Qoşatəpə
Qaragöz
Qaratəpə
Qarapaklıq
Qızılvəng kəndi
Qaraörən
Qarakəpənək
Qurdarx
Qışlaq
Qaraörən
Qaradəli
Qarakilsə
Qıpçaq
Qızılvəng
Qızılqala
Qızıloran
Qaranlıqdərə
Qorqoç
Qarabulaq
Qalacıq
Qızılburun
Qurdalı
Qoturbulaq
Məsdərə
Muğni
Molladursun
Mollabəyazid
Meydan
Mülk
Mollaqasım
Noraqyuq
Nork
Noraqavit
Nurməhəmməd
Ozan
Parakərə
Pərəkər
Pətək
Paonbəy
Palçıqlı
Piridərviş
Saatlı
Sürməli
Seyidli-Axsaxlı
Sərdarabad

Sadaxlı
Sarvanlar
Səfiabad — kanal
Sarac-Salman — üzümlük
Salaməlik
Solaq
Sarıbulaq
Şərur
Şirək düzənlik
Şorlu
Şaharxı
Şəhribanlu
Şəfaqat dəyirmanı
Şahab kəndi
Şorlu
Şorakənd — meydan
Şorak
Şirək düzü
Şəhriyar
Şirəkqala
Şərabxana
Talın
Turabıhasarı
Taçarapak
Tülkütəpə
Tərəkəmə kəndii
Təkəlük
Tut
Tezxarab
Talın
Uluxanlı kəndi
Üçkilsə
Üçtəpə
Yayıcı
Yuxarı bağ
Yuxarı Abdal
Yüzbaşlı
Yanşaq
Yelqovan
Yolkəsən
Yastıyolum
Yaycılar
Zəngibasar
Zəngibasar — üzümlük
Zəngi

***Mənbə:***

Սիմէօնէ Երեւանցիոյ: Ջամբռ: Գիրք, որ կոչի յիշատակարան արձանացուցիչ, հայելի եւ պարունակող բնավից որպիսութեանց Սրբոյ Աթոռոյս, եւ իւրոյ շրջակայից վանօրէիցն: Վաղարշապատ: ՌՀԻԳ: [Simeon İrəvanlı. Cambr. Müqəddəs Üçmüədzin kilsəsinin və ətraf monastırların toplusunun müfəssəl aynası və xatirə kitabı. Vaqarşapad, 1873].



Sənəd 2, fars dilində.
***Mənbə:*** Персидские документы Матенадарана. Указы, вып.II, 1601-1650 гг., сост. А.Д.Папазян. Ереван, 1959, с.368-369.

## ДОКУМЕНТ 39

*Прошение католикоса Филиппоса шаху Аббасу II от 1650 г., в котором по поводу поставленных в нем различных вопросов шах выносит свое решение в соответствующих надписях там же или на полях и в кратком указе, написанном в верхней части документа, предписывает привести их в исполнение*

*Папка 1а, документ № 87, оригинал, размер 108×30,5 см, письмо шикастэ*

*Печать шаха Аббаса II*

Пусть поступают согласно ответам, данным на отдельные вопросы, не отклоняются от их содержания и смысла и считают своей обязанностью.

Написан в месяце сафар 1060 г. (3 февраля—3 марта 1650 г.) и благополучно завершен.

Прошение
слуги молящегося, католикоса Учкилисы, Филиппоса.

Сим покорно докладываем Вам, что многие из коренных армян этих мест проживают в престольном Исфахане и многие [из тех], что ныне живут в нашем **вилайете** прибыли сюда по частям из различных **вилайетов** благодаря неисчерпаемой августейшей любви и заботе. И триста богомольцев его святейшества августейшего величества—пусть сто тысяч душ подобных нам богомольцев станут жертвами священных копыт его коня,— в Учкилисе день и ночь проводят в молитвах и прожитием своим обязаны целиком милосердию его святейшества, августейшего величества.

Sənəd 2, rus dilində.
***Mənbə:*** Персидские документы Матенадарана. Указы, вып.II, 1601-1650 гг., сост. А.Д.Папазян. Ереван, 1959, с.368-369.

*Cədvəl 2.*

*İrəvan xanlığında qeydə alınmış əsas Azərbaycan-türk tayfaları*

| № | tayfanın adı | ailə | nəfər |
|---|---|---|---|
| 1 | Qarapapaqlı | 840 | 4.619 |
| 2 | Böyük Çobanqara | 159 | 988 |
| 3 | Saraşlı | 90 | 541 |
| 4 | Dəmirçili | 31 | 228 |
| 5 | Kərimbəyli | 55 | 357 |
| 6 | Qafarlı | 98 | 652 |
| 7 | Şeyxlər | 34 | 232 |
| 8 | Qarabağlı | 12 | 68 |
| 9 | Cəfərli (Qafarlılardan) | 16 | 82 |
| 10 | Əli Şərurlu | 12 | 75 |
| 11 | Gödəkli (Kərimbəyli) | 24 | 158 |
| 12 | Cəmilli | 10 | 65 |
| 13 | Çaxırlı | 57 | 308 |
| 14 | Kürkübaşlı | 13 | 72 |
| 15 | Ayrumlu | 631 | 3.484 |
| 16 | Seyidli-Axsaxlı | 311 | 1.754 |
| 17 | Taşanlı | 124 | 565 |
| 18 | Səədli | 160 | 565 |
| 19 | Muğanlı | 200 | 1.100* |
| 20 | Şahdilli (Qacar) | 164 | 959 |
| 21 | Sədərəkli (Qacar) | 149 | 940 |

***Mənbə:*** Шопен. И. Исторический памятник состояния Армянской области в эпоху ее присоединения к Российской империи. СПб., 1852. с.535-537. Bournoutian G.A. The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica, Costa Mesa. California and New York, 1992, p. 231.

* Muğanlı tayfasının ümumi sayını C.Bornoutyan hesablamışdır.

İrəvan xanlığının sosial-iqtisadi həyatı bütövlükdə Azərbaycanın sosial-iqtisadi münasibətlərinin tərkib hissəsi idi. XVIII əsrdə Azərbaycanın qərbində — Ağrı vadisində, Naxçıvanda, Qapanda və ətraf əyalətlərdə də əmtəə istehsalı kifayət qədər geniş inkişaf etmişdi və ölkənin iqtisadiyyatında mühüm rol oynayırdı. İrəvan xanlığı digər Azərbaycan xanlıqları ilə və xarici ölkələrlə geniş ticarət əlaqələri saxlayırdı.

Hələ XVIII əsrin əvvəlində Rusiya səfiri Volınski İrəvanda olarkən yazmışdır: Bütün İrandan Türkiyə sərhədinədək yerləşən nahiyələr içərisində ən yaxşısı İrəvan və Təbrizdir. Onlarda çörək boldur və ticarətlə İrana (Səfəvi dövlətinə — ***red.***) çoxlu gəlir gətirirlər [155,11]. 1782-ci ildə İrəvanda olan Rusiya agenti Reyneqs də İrəvan xanlığının Qarabağ və Qaradağ kimi çox zəngin olması, burada pambıq parça, ipək, yazlıq buğda, şərab və bol miqdarda keyfiyyətli məhsulların istehsalı haqda məlumat verir [37,215-216].

***Kənd təsərrüfatı və maldarlıq.*** İrəvan xanlığından ixrac olunan mallar əsasən kənd təsərrüfatı* məhsulları idi. Bu məhsullar içərisində buğda və arpa istehsalı başlıca yer tuturdu. İrəvan ətrafındakı bölgələr, Qırxbulaq, Sərdarabad, Şörəyel, Pəmbək taxıl istehsalı ilə məşhur idi. Əkin sahələri əsasən yazlıq və payızlıq olurdu. Taxıl məhsulları dağlıq yerlərdə əsasən payızda, aran yerlərində isə yazda əkilirdi [bax: 95,738-740; 71,IV,278]. Hüseynqulu xan Qacarın zamanında İrəvan

* Maraqlıdır ki, işğal olunmuş Şimali Azərbaycan torpaqlarında ermənilərə dövlət yaratmağa çalışan rus məmuru qraf Paskeviçin tapşırığı və ermənilərin təsiri ilə İ.Şopen qələmə aldığı əsərində belə kənd təsərrüfatı məhsullarının əksəriyyətinin adını yerli əhalinin dilində — Azərbaycan türkcəsində vermişdir. Məsələn: arpa, buğda, küncüt, pambıq, gənəgərçək və s. [bax: 95,738-746]. Bütün bunlar İrəvan bölgəsinin qədim əkinçilik mədəniyyətinə sahib olan yerli əhalisinin məhz Azərbaycan türkləri olmasını bir daha sübut edir.

xanlığında hər il 34.185 xalvar* buğda, 11.500 xalvar arpa istehsal olunurdu [71,IV,280]. Bundan əlavə, kənd təsərrüfatı məhsulları içərisində çəltik istehsalı da mühüm yer tuturdu. Çəltik əsasən aran və çox su tələb edən yerlərdə əkilirdi. Zəngibasar və Şərur mahalları çəltik istehsalına görə xüsusilə fərqlənirdi [71,IV,278]. Saatlı, Qərbibasar, Gərnibasar mahallarının aran yerləri də bu bitkinin istehsalı ilə fərqlənirdi [95,741]. İrəvan xanlığında hər il 18.400 xalvar çəltik istehsal olunurdu [71,IV,280].

İrəvan xanlığında texniki bitkilərdən pambıq əsasən aran yerlərində becərilirdi. Zəngibasar, Sərdarabad və Sürməli mahalları pambıq istehsalına görə fərqlənirdi [95,743;71,c.IV,278-279]. İrəvan xanlığında hər il orta hesabla 2100 xalvar pambıq istehsal olunurdu [71,IV,280]. İrəvan xanlığında əhali tütün istehsalı ilə də məşğul olurdu. Tütün daha çox yerli tələbatı ödəmək üçün istehsal olunurdu [95,745]. Bundan əlavə, İrəvan xanlığının dağlıq və aran bölgələrində kətan, aran bölgələrində isə küncüt istehsal olunurdu. Hər iki bitkidən əldə olunan yağ qida və yanacaq kimi istifadə olunurdu [95,741-742]. Hüseynqulu xan Qacarın zamanında İrəvan xanlığında hər il orta hesabla 12 xalvar kətan toxumu, 24 xalvar küncüt istehsal olunurdu [71,IV,280; bax: bölmənin sonu, cədvəl 6,7].

İrəvan xanlığının kənd təsərrüfatında ipəkçilik də geniş yayılmışdı. İ.Şopen qeyd edir ki, bütün xanlıq ərazisində toxmaçarlıqların çox olması burada vaxtilə ipəkçiliyin böyük rol oynamasından xəbər verir [95,753].

İrəvan xanlığı ərazisində bağçılıq qədim tarixə malik idi. Xanlıq daima zəngin meyvə və üzüm bağlarının olması ilə fərqlənirdi. Lakin müharibələr nəticəsində bu bağların çoxu qırılaraq məhv edilmiş və ya sahibsiz qalmışdı. Rusiya işğalından sonra İrəvan xanlığı ərazisin-

*1 xalvar — 28 pud (1pud —16 kq — ***red.***) 4 funta bərabərdir.

dəki meyvə və üzüm bağlarının sayı, tutduğu sahə, gəlirləri haqda məlumatlar XIX əsrin rusdilli mənbələrində öz əksini tapmışdır (bax: bölmənin sonu, cədvəl 8,9). Lakin Göyçə, Dərəçiçək və Abaran mahallarındakı bağlar siyahıda göstərilməmişdir. Bunun səbəbi isə Rusiya işğalı zamanı bu mahalların daha çox dağıntıya məruz qalması idi [bax: 95,747; 71,IV,281-282].

İrəvan şəhərində və şəhərətrafı kəndlərdə, ölkənin başqa şəhərlərində, mahallarında müxtəlif növ bağ-bostan bitkiləri və tərəvəz məhsulları yetişdirilirdi [bax: 95,745-746]. Dövrün mənbələrində İrəvana bostan bitkilərinin toxumunu əldə etmək üçün hətta qonşu ölkələrdən nümayəndələrin gəlməsi haqda məlumat var. 1782-ci ilin martında bayazidli İsak paşanın xahişi ilə İrəvandan Bayazidə 7000 dinar 2 abbası dəyərində qara qarpız, göy qarpız, mürsəqulu, xiyar, sürahı, reyhan, xına tozu, badımcan və s. toxumları göndərilmişdi. 1784-cü ildə isə II İrakli Arqutlu Zöhrabı Üçkilsə katolikosunun yanına toxum gətirmək üçün göndərmişdi [214,41-42]. Maraqlıdır ki, Üçkilsə monastırının məxaric dəftərində qeyd olunan bu toxumların adlarının hamısı Azərbaycan türkcəsindədir. Dövrün mənbələrində bu toxumların adlarının Azərbaycan türkcəsində yazılması burada qədimdən Azərbaycan türklərinin yaşadığını, oturaq təsərrüfatla, xüsusən əkinçilik və kənd təsərrüfatının digər sahələri ilə məşğul olduğunu, ermənilərin isə bu bölgəyə sonradan gəldiyini bir daha sübut edir.

Ağrı vadisində bütün Azərbaycan üçün səciyyəvi olan yaylaq-qışlaq (aran-yaylaq) maldarlığı inkişaf etmişdi. İrəvan xanlığında maldarlardan alınan vergilər hesabına böyük gəlir əldə edilirdi. Maldarlıqla məşğul olan əhali vergi ödəməkdən əlavə, öz atları və silahlı dəstələri ilə xana hərbi xidmət də göstərirdi. Məsələn, böyük Çobanqara nəsli (300 ailə) 100 tümən vergi ödəyirdi. Bu nəsildən 300 süvari hər-

bi xidmətə getməli idi. Xan öz heyvanlarını saxlamağı da bu nəslə etibar edirdi. Onlar saxlanılan hər baş qoyundan yarım batman yağ və pendir verməli idilər. Saxlanılan qoyunların yunu isə heyvanı saxlayanlara peşkəş verilirdi [141,235;214,43]. Bundan başqa, maldarlar öz ağalarına da vergi ödəməli, onların və qohumlarının işlərini görməli, bayram günlərində öz ağalarına hədiyyələr verməli idilər [141,228-229; 214,43].

XVIII əsrin ikinci yarısında İrəvan xanlığında maldarlıqla məşğul olan əhalinin bir hissəsi bazarda satmaq üçün yağ, pendir və digər süd məhsulları istehsal edirdi. Heyvandarlığın başqa sahələrinə nisbətən qoyunçuluq daha çox inkişaf etmişdi. Qırxbulaq, Göyçə, Abaran, Dərəçiçək, Gərnibasar, Vedibasar, Talın, Sürməli və Dərəkənd-Parçenis mahallarının otlaqları maldarlıq üçün daha əlverişli idi [bax: 95,523-525]. Xanlığın bütün əhalisi öz həyatində iri və xırda buynuzlu mal-qara saxlayırdı [bax: bölmənin sonu, cədvəl 10]. Maldarlıq əsasən yaylaq-qışlaq və qismən köçəri madarlığa bölünmüşdü. Yaylaq-qışlaq maldarlığı ilə məşğul olan ailələrin üzvlərinin bir hissəsi yaylaq-qışlaq maldarlığı ilə məşğul olur, digər ailə üzvləri isə daimi yaşayış yerində qalaraq əkinçiliklə məşğul olurdu. Bunlar əsasən Azərbaycan türkləri idi. Xanlığın az miqdarda əhalisinin daimi yaşayış yeri yox idi və yalnız köçəri maldarlıqla məşğul olurdular. Bunlar əsasən gəlmə kürdlər idilər [bax: 95,519-523].

***Sənətkarlıq və ticarət.*** Zəkəriyyə Kənəkirli yazır ki, Ağrı diyarı məhsuldardır, müxtəlif məhsullarla boldur, həm də ucuzdur; ona görə də hər yerdən İrəvana gəlir, nə lazımdırsa alır və öz yerlərinə qayıdırlar; eynilə də Təbrizdən çoxlu karvanlar gəlir, onlar düyü, pambıq, əridilmiş yağ, pendir, quyruq yağı, piy, bitki yağı, gön-dəri və digər istədikləri malları alıb aparırlar [66,153]. İrəvandan Tiflisə, Ərzuruma,

Axalsıxa, Qarsa pambıq, Təbriz, Xoy, Bayazid və Vana düyü, buğda və arpa, Qarsa, Bayazidə və Gürcüstanın müxtəlif yerlərinə duz aparılırdı. Bütün bu məhsulların ixracı hər il 3000 gümüş rubla çatırdı. Bundan başqa, taxıl — arpa, buğda, darı və s. də ixrac olunurdu [71,IV, 284; 214, 46].

İrəvan xanlığının iqtisadi həyatında mühüm rol oynayan sənətkarlıq müxtəlif sənət sahələrini əhatə edirdi. Azərbaycanın ənənəvi sənətkarlıq sahələri olan toxuculuq və dulusçuluq İrəvan xanlığında da inkişaf etmişdi. Bunların içərisində toxuculuq, o cümlədən xalça-palaz məmulatı istehsalı xüsusilə seçilirdi. Xanlığın əsas əhalisi olan Azərbaycan türkləri ənənəvi olaraq donuz deyil, qoyun saxladıqları üçün gözəl xalçalar, kisə, palaz, çul, qışda geyinmək üçün isti paltarlar, əlcək, corab və s. toxuyurdular [bax: 71, IV, 282-283]. Məhz buna gərə də İ.Şopen hər ailədə toxucu dəzgahının* olması haqda məlumat verirdi [bax: 95,851-853]. Xanlıqda dulusçuluq məmulatı istehsalı yerli xammala əsaslanırdı. Bəzi kəndlər, hətta, bu sahədə ixtisaslaşmışdılar. Məhz buna görə də İ.Şopen İrəvan xanlığının bütün mahallarında dulusçuluq emalatxanalarının fəaliyyət göstərdiyini qeyd edirdi [bax: 95, 862].

Toxuculuqla bağlı digər sənət sahəsi boyaqçılıq idi. Xanlıq ərazisində qırmız ("koşenil")** adlanan boyaq maddəsinin müxtəlif növlərindən geniş istifadə olunurdu. Bu boyaq maddəsi haqda xüsusi tədqiqat aparan Rusiya Elmlər Akademiyasının akademiki Qammel İrəvan qırmızını yararlılığına görə Meksika qırmızı ilə müqayisə edirdi [bax: 71,IV,259-266; 95,859-860].

---

* İ.Şopenin bu məlumatına əsasən demək olar ki, xanlığın əsas əhalisi Azərbaycan türkləri idi. Çünki bir qayda olaraq xristian əhali yalnız donuz saxladığından toxuculuqla məşğul ola bilməzdi.

** Əsasən qırmız böcəyindən alınan bu bitki rusdilli mənbələrdə "koşenil" adlanır.

İrəvan xanlığında gön-dəri məmulatı emalı da tərəqqi etmişdi. Burada təkcə yerli gön-dəri deyil, Bayazid və Makudan gətirilən xammaldan da istifadə edilirdi [95;857-858]. Gön-dəri məmulatları istehsalı süvari ordunun tələblərini də ödəyirdi. Bundan əlavə, İrəvan xanlığında şüşə istehsalı, sabunbişirmə, yağçəkmə və s. sənətkarlıq sahələri var idi [bax: 95,858,856,861-862].

İrəvan xanlığında sənaye istehsalı da inkişafa başlamışdı. İrəvan şəhəri yaxınlığında yerləşən Goğb* (Qoğb) duz mədəni [bax: bölmənin sonu, şəkil 10] Naxçıvanın duz mədəni ilə birlikdə bütün Cənubi Qafqazı duzla təmin edirdi. Goğbdan Gürcüstana, İmeretiyaya, Axalsıxa və digər yerlərə duz göndərilirdi [42,72; 214,43-44]. İ.Şopen yazır ki, duza tələbat çox olduğundan Qulp (Goğb —***red.***) dağının ətəyində bir-birindən 50 sajen məsafədə yerləşən iki mədən fəaliyyət göstərirdi [95,824; bax: şəkil 9]. Bu mədənlərə nəzarət etmək üçün Hüseynqulu xan Qacar özünün yaxın adamlarından üç nəfər ayırmış və onlara yaxşı məvacib təyin etmişdi. İ.Şopen Hüseynqulu xanın dövründə duz istehsalından külli miqdarda — ildə 14.000 gümüş rubl dəyərində gəlir əldə edildiyini yazırdı [bax: 95,827]. Qulp (Goğb — ***red.***) kəndində yerləşən eyni adlı duz mədənindən bir neçə növ duz çıxarılırdı. Bu duz tərkibinə və keyfiyyətinə görə fərqlənirdi. Həmin duzun çox hissəsi Qarabağ, Gürcüstan və Bayazid paşalığına ixrac olunurdu [71,IV,268-269].

* "Goğb" (Qoğb) toponiminin erməni dilində heç bir izahı yoxdur. Goğ qədim türk sözü olub "işıq", "günəş şüaları" mənasındadır [7,148]. Duz dağı günəş şüaları altında parladığı üçün belə adlanmışdı. Bu cür toponimlər məhz qədimdən bu ərazilərin türk torpağı olduğunun sübutudur. (Hazırda həmin duz mədəninin əsas hissəsi Tuzluca adlanır və Türkiyə Respublikasının ərazisindədir. Arazın sol sahilində qalan hissəsini isə ermənilər "Ağverən" adlandırır. "Ağverən" toponimi də Azərbaycan türkcəsindədir. Ermənilər duza Azərbaycan türkcəsindən götürərək "ağ" deyirlər. Məhz buna görə də sonralar bu mədən Ağ verən adlanmışdır). Bu duz mədəninin adı rus mənbələrində Qulp (Kulp) və ya Koxp variantında verilir [60,16; 71,IV,267-268; 95,283,284,824 və b.]. Erməni müəllifi B.R.Qriqoriyan isə mədənin adını Qoğb kimi təqdim etmişdir [214,43]. Mədənin Araz çayının sağ sahilində Sərdarabad qalasından 30, İrəvan qalasından isə 50 verst aralıda dağda yerləşdiyi və ətrafı ilə birlikdə 8 verstdən çox ərazini əhatə etdiyi qeyd olunur [71,IV,268].

Digər Azərbaycan xanlıqlarında olduğu kimi, İrəvan xanlığında da iqtisadiyyatın ən mühüm və gəlirli sahələrindən biri xarici və daxili ticarət idi. İrəvan xanlığında karvan yollarından və onların qorunmasından xeyli gəlir əldə olunurdu. Belə ki, xanlığın ərazisindən Azərbaycanın digər ticarət mərkəzlərinə və xarici ölkələrə bir neçə mühüm karvan yolu keçirdi. Hələ XVII əsrdə tacir Əylisli Zəkəriyyə öz gündəliyində bu yolların bəzilərini təsvir edir, qorunan yollardakı rəhdarxana və gömrük dayanacaqları barədə maraqlı məlumatlar verirdi. O, bu dayanacaqlarda üç pillədən olan məmurların xidmət göstərdiyini qeyd edir: rəhdar, baccı və gömrükçü.* Onlardan birincisi yolu qorumaq üçün böyük və kiçik inzibati məntəqələr və dayanacaqlarda fəaliyyət göstərir, qalanları isə sərhəd gömrüyündə xidmət edirdilər [104,7-8].

İrəvan (Çuxursəd) bölgəsi müxtəlif ölkələrə gedən ticarət yollarının qovuşuğunda yerləşdiyindən Azərbaycanın beynəlxalq ticarət əlaqələrində yaxından iştirak edirdi. Məhz bu səbədən İrəvan xanlığı ərazisində çoxsaylı körpülər, karvansaralar, zəbxanalar və bazarlar var idi [bax: bölmənin sonu, şəkil 1, 2, 3, 4, 5, 8, 9]. Bunlardan birincisi Hindistan, Mərkəzi Asiya və İranı Təbriz və Naxçıvan vasitəsilə İrəvan xanlığına bağlayan karvan yolu idi. Bu yol İrəvan, Valarşabad və Kağızman üzərindən keçib Ərzuruma gedirdi. Bu karvan yolu "Ərzurum yolu" və ya "Bəzirgan yolu" adlanırdı. İrəvandan Ərzuruma gedən digər karvan yolu Abaran və Alagöz dağının şimal ətəyindən keçib Qarsa, oradan da Həsənqalaya yetişir və burada ana xəttə qovuşurdu [104,7-8]. İrəvandan Tiflisə gedən karvan yolu Üçkilsə, Sərdarabad, Hamamlı, Cəlaloğlu və Şulaverdən keçirdi [214,46]. Bu yol barədə hələ XVII əsrdə fransız səyyahı J.Şarden də

* Əylisli Zəkəriyyə öz əsərində "rəhdar, baccı və gömrükçü" terminlərini Azərbaycan dilində işlətdiyi halda [104,7], əsərin rus dilinə tərcümə olunan variantında həmin terminlərin yalnız rus dilinə tərcüməsi təqdim olunmuşdur [bax: Закария Акулисский. Диневник, Ереван, 1939, s.16]. Bu bir daha təsdiq edir ki, ilk mənbələri başqa dillərə tərcümə edən erməni müəllifləri bir qayda olaraq mənbələrdə onlara sərfəli olmayan məlumatları məqsədyönlü şəkildə saxtalaşdırırlar.

məlumat vermişdir. Həmin yolun uzunluğu təxminən İrəvan — Ağstafa yoluna bərabər idi. Şarden bu yol üzərində aşağıdakı yaşayış məntəqələrinin yerləşdiyini qeyd edir: Bjni, Qarakeşiş, Dəlican, Qara Daş, Məlikkənd, Körpükənd [223,141-156]. İrəvan bu yol vasitəsilə Gəncə ilə əlaqə saxlayır, həm də Şamaxıda Azərbaycandan Rusiyaya gedən baş ticarət yoluna bağlanırdı. Karvan yolları üzərində gömrük məntəqələri və rəhdarxanalar həddən artıq çox idi. Təkcə Əylisdən Kağızmana gedən ticarət yolu üzərində altı gömrük məntəqəsi və rəhdarxana vardı [104,7].

XVII əsrə aid olan bu sistem XVIII əsrin ikinci yarısında, xanlıqlar dövründə daha da inkişaf etdi. 1829-1832-ci il kameral təsvirində keçmiş İrəvan xanlığının əsas ticərət yolları bunlardır: 1. Gümrü — Məsdərə — Sərdarabad — Üçkilsə — İrəvan — Naxçıvan — Ordubad; 2. Sərdarabad — Cəfərağa — Bayazid paşalığı; 3. Sərdarabad — Goğb — Arazsahili ilə Kağızman — Ərzurum; 4. İrəvan — keçmiş Qarabağ xanlığının sərhədinə qədər. Bu yolun uzunluğu 161 verstdir; 5. İrəvan — Üçkilsə — Qars. Bu yol Qızılkilsə və Qoşavəng kəndlərindən keçirdi [bax: 95, 718-721]. Xanlıqda başlıca ticarət mərkəzi İrəvan şəhəri idi. Xarici ölkələrdən gətirilən ticarət malları əsasən şəhərin anbarlarında toplanırdı. İrəvan xanlığından ixrac olunan müxtəlif növ məhsullar isə xarici ölkələrə aparılırdı [71,IV,285; 95,883-884].

İrəvan xanlığında xarici ticarətlə bərabər daxili ticarət də inkişaf etmişdi. Daxili ticarətin inkişafında dükanlar, zərbxanalar, meydanlar və karvansaralar mühüm rol oynayırdı [bax: bölmənin sonu, cədvəl 1, 2, 3; şəkil 5]. İrəvan şəhərinin müxtəlif yerlərində yerləşən dükanların [bax: cədvəl 4] ümumilikdə sayı 851-ə çatırdı [bax: cədvəl 1, 2, 3].

İrəvan xanlığında ticarət əməliyyatlarının həyata keçirilməsində müxtəlif çəki və uzunluq vahidlərindən istifadə olunurdu [bax: bölmənin sonu, cədvəl 4].

İrəvan xanlığında həm daxili, həm də xarici ticarət əməliyyatlarının həyata keçirilməsində müxtəlif pullardan istifadə olunurdu. Xanlıqda qarapul adlanan yerli mis pullar mühüm rol* oynayırdı. Bundan əlavə, keçmiş Səfəvilər dövləti (1501-1736) dövründən qalma pullardan, Azərbaycanın digər xanlıqlarında kəsilmiş pullardan və həmçinin xarici pullardan istifadə olunurdu [95,851,888-891]. XVII-XVIII əsrlərdə İrəvan Azərbaycanın ən iri pul zərbi mərkəzlərindən biri idi. İrəvan xanları pul kəsilən zərbxanaları icarəyə verirdilər. İcarədarların kəsdikləri pul keyfiyyətinə görə xarici pullardan üstün idi [bax: 95, 888-889; bax: bölmənin sonu, cədvəl 5].

İrəvan xanlığı ərazisində çoxlu su dəyirmanının olması burada taxılçılığın yüksək inkişafını, İrəvan şəhərində çoxlu yağ zavodlarının olması isə xanlıqda bitki yağı istehsalının genişlənməsini sübut edir. Mənbənin məlumatına görə, İrəvan əyalətində 25 yağçəkən müəssisə, 340 su dəyirmanı, 85 ding və 1 kərpic zavodu vardı [bax: 71, IV, 283-284].

İrəvan xanlığının Göyçə gölünə axan Adıyaman, Qızılvəng, Balıqçay, Toxluca, Əyricə, Zəngi və s. çayları balıqla zəngin idi [71, IV, 283-284].

***Torpaq mülkiyyət fomaları.*** Xanlıqlar dövründə, Azərbaycanın digər xanlıqlarında olduğu kimi, İrəvan xanlığında da ənənəvi torpaq mülkiyyət formasında ciddi dəyişiklik olmamışdı. Torpaq sahələri mülkiyyət formasına görə 5 qrupa bölünürdü: dövlət (divan) və saray (xalisə) torpaqları, mülk, tiyul, vəqf, icma torpaqları.

***Dövlət torpaqları.*** İlk mənbələrdə dövlət torpaqları iki adla xatırlanır — divan və xalisə. Məhsulu xanın məmurları arasında bölünən

*General Velyaminovun 1825-ci il sentyabr tarixli yazısında İrəvan sərdarının qardaşı Həsən xan Qacarın və şahzadə Abbas Mirzənin Dağıstan feodallarını da Rusiya işğalçılarına qarşı qaldırmaq istəyi haqda məlumat verilir. Həsən xan Qacar bu işi həyata keçirmək üçün Qarapapaqlı tayfasından 3 nəfər təyin edir və onlara 1000 rubl İrəvan pulu verir [bax: 58, 60].

torpaqlar xalisə, dövlət torpaqları isə divan adlanırdı [171,14]. Səfəvilər dövründə mövcud olan divan və xalisə torpaqları arasındakı fərq XVIII əsrin ikinci yarısında tədricən aradan qalxdı və hər iki kateqoriyadan olan torpaq birləşərək xan torpağı adlanmağa başladı. Bu torpaqlardan toplanılan bütün məhsul xanın sərəncamına keçirdi. Xanın çox geniş səlahiyyətləri vardı və divan torpaqlarından gələn gəlir bütünlüklə onun sərəncamında idi. İrəvan xanları hər vasitə ilə xalisə və divan torpaqlarını genişləndirməyə çalışırdılar [bax: 95, 989-990; 160, h.1. s.102].

***Mülk torpaqları.*** Xüsusi mülkiyyətə məxsus mülk torpaqları azad şəkildə alqı-satqı obyekti ola bilərdi. Azərbaycanın digər xanlıqlarında olduğu kimi, mülk torpaqları irsən nəsildən-nəslə keçirdi. Mülk sahibləri xana qulluq etməyə borclu deyildi [bax: 95,926-928]. İlk mənbələrdə İrəvanda mülkün 3 formasının olduğu göstərilir: 1) gəlir gətirən və daşınmaz əmlak olan mülklər. Bura təkcə yaşayış məntəqələri deyil, həm də dəyirmanlar, dinglər, üzüm və meyvə bağları, hamamlar daxil idi. Örüşlər də xüsusi mülk hesab edilirdi; 2) renta — vergi olaraq məhsulun 1/10-ni ödəyən kənd; 3) 1/10 renta —vergisinə cəlb olunmuş kəndli torpaqları [bax: 51, 107, 174, 287; 174, 222-248]. İrəvan xanlığında mülk torpaqları əsasən iki qismə ayrılırdı: irsən keçən və bağışlama yolu ilə yaranan — mülk xalisə. İrsən keçən mülklərin qədim tarixi vardı. Mülk xalisə isə bağışlamaq və satılmaq yolu ilə yaranırdı [bax: 160, h.1. s.122].

Mənbələrin məlumatına görə, Üçkilsə monastırının XVII-XVIII əsrlər ərzində, müxtəlif vaxtlarda bir hissəsini satın almaq, digər hissəsini isə bağışlanma yolu ilə 22 kəndin mülkiyyətinə sahiblik hüququ əldə etdiyi qeyd edilir [174,234].

***Tiyul torpaqları.*** XVIII əsrin II yarısında şərti torpaq mülkiyyəti forması olan tiyul geniş yayılmışdı. Xan tərəfindən müəyyən şəxslərə

vəzifəyə və hərbi xidmətə görə divan torpaqlarından bəxşiş olaraq ömürlük tiyul verilirdi. Tiyul sahibi xidmətini başa vurduqda və ya-xud vəfat etdikdə bağışlanmış kəndlər yenidən xəzinəyə qaytarılırdı [bax: 95, 928-929; 160, h.1. s.124].

XVIII əsrin sonunda Azərbaycan xanlıqlarında, o cümlədən İrəvan xanlığında tiyul hüququ bir qədər dəyişikliyə uğramışdı. Belə ki, əvvəllər verginin qalığını xanın vergitoplayanları yığırdısa, indi tiyuldarlar təkcə renta — verginin bir hissəsini deyil, həm də bütün vergiləri toplaya bilərdi. Tiyul qaydası ilə verilmiş kəndlərin sakinləri tiyuldardan tamamilə asılı idilər və bütün öhdəlikləri onun xeyrinə yerinə yetirirdilər. Tiyuldar çox vaxt kənddə yaşayır və kəndin bütün işlərini şəxsən özü idarə ediri [174,218-219].

***Vəqf torpaqları.*** Vəqf torpaqları müxtəlif vaxtlarda həmişəlik dini müəssisələrə — məscidlərə, mədrəsələrə və ya kilsələrə verilmiş torpaqlar idi. İrəvan xanlığının ərazisindəki Azərbaycan məscidlərinə və digər dini idarələrə məxsus vəqf torpaqları ilə yanaşı dini idarələrin digər mülkiyyəti — evlər, dükanlar, karvansaralar, dəyirmanlar, dinglər, yağ zavodları və s. də vəqf ola bilərdi. Onların xidmətçiləri vergilərdən azad idilər.

İrəvan xanlığında mövcud olan vəqf torpaqları hələ Ərəb xilafəti dövründə Azərbaycanda məscid və mədrəsələrə, dini idarələrə məxsus torpaq mülkiyyəti kimi yaranmışdı. Lakin 1441-ci ildə Azərbaycan Qaraqoyunlu hökmdarı Cahanşahın razılığı ilə erməni katolikosluğu mərkəzinin İrəvan (Çuxursəd) bölgəsinə köçrülməsindən sonra burada çoxsaylı məscidlərlə yanaşı, bir neçə qriqorian kilsəsi də fəaliyyətə başladı. Qriqorian kilsəsinə münasibətdə dözümlülük siyasəti yeridən və onu himayə edən Azərbaycan hökmdarları bununla həm də Azərbaycan ərazisində erməni feodal təsərrüfatının inkişafı üçün şərait yaradırdılar [115,29]. Tarixi faktlar bu qüsurlu siyasətin acı nə-

ticələrini çox aydın sübut edir. Kilikiyanın Sis şəhərindən Azərbaycan Qaraqoyunlu dövlətinin ərazisinə köçürüldükdən sonra bölgədə bir qarış belə torpağı olmayan erməni katolikosluğu 1443-cü ildən başlayaraq azərbaycanlılara məxsus kəndləri, əkinə yararlı geniş torpaq sahələri ilə yanaşı meyvə, üzüm bağlarını da ələ keçirməyə və bununla onların əsl sahiblərini ata-baba mülklərindən məhrum etməyə çalışırdı [bax: 51;72;73]. XVII əsrin əvvəlində artıq iri monastır təsərrüfatına çevrilmiş Üçkilsə Azərbaycan türklərinin ata-baba mülklərinin satın alınmasını daha da intensivləşdirdi. XVIII əsrin ikinci yarısında məhz Azərbaycan türklərinin ata-baba mülklərinin satın alınması hesabına monastırın 190 xalvar (təxminən 375 hektar) torpaq sahəsi var idi ki, onun da hər il 103 xalvarı əkilib becərilirdi. Bütün bunların nəticəsində Üçkilsə monastır təsərrüfatı genişlənərək XVIII əsrdə, bir növ, dövlət içərisində dövlətə çevrilmişdi [115,29].

1763-cü ildə katolikos Simeon Üçkilsənin maaflığı üçün Hüseynəli xandan qəbalə almışdı [51,208]. Bu zaman Ecmiədzin kilsəsinin ixtiyarında Valarşabad kəndindən əlavə, Azərbaycan türklərindən nağd pula alınmış Oşaqan, Əştərək, Qamışlıq, Ağunatun, Çiçəkli, Müğni, Kirəcli kimi 7 kənd* vardı. Kilsə bu kəndlərdən ümumi məhsulun onda birini alırdı [139,3].

Üçkilsə monastırı XVII əsrdə olduğu kimi, xanlıqlar dövründə də Azərbaycan türklərinə məxsus torpaqları ya satınalma yolu ilə, ya da zorla zəbt edirdi. Məsələn, 1797-ci ildə Azərbaycan türklərinin torpağına yiyələnmək üçün yerli mülkədarlarla erməni-kilsə təsərrüfatı arasında Oşaqan kəndi yaxınlığındakı Gedər torpaq sahəsi üstündə böyük mübahisə yaranmışdı. Q.Qarnesi bu mübahisə barədə həmin il dekabrın 24-də İstanbul katolikosunun nümayəndəsi Qalust varda-

* 1443-cü ildə Azərbaycan Qaraqoyunlu hökmdarı Cahanşah tərəfindən Üçkilsə katolikosu təyin edilən Qriqor Makulu ilk olaraq Valarşabad, sonra isə digər kəndləri mülkləri ilə birgə ciddi mübahisələrdən sonra, dəfələrlə, hissə-hissə Azərbaycan türklərindən satın ala bilmişdi [bax: bölmə 2, cədvəl 1].

petə yazırdı: "Qonşu Qızıl Teymur kəndinin muğanlı sakinləri Oşaqanın yaxınlığındakı Gedər adlı kəndin mülklərinə yiyələnmək istəyirlər. Mülkün bəyi Hacı Həsənin oğlu buradakı dağıntıları görərək şeyxülislamın yanına gedir və mülkün Məhəmmədabad kəndinə məxsus olduğunu və öz əcdadlarından ona miras qaldığını bildirir. Bundan sonra o, həmin torpaq sahəsini Vəli bəyin oğlu Məhəmməd Həsən bəyə (yaxud Məşədi Sadığa) sata bilir. Şeyxülislam ona qəbalə verir. Lakin katolikos bu işi pozur" [214,51]. Kilsə azərbaycanlıların ata-baba yurdları olmuş Qızıl Teymur, Gedər və digər kəndlərin ona məxsus olmasını müxtəlif yollarla sübut etməyə çalışmış, nəticədə ermənilər azərbaycanlılara məxsus Gedər kəndini zəbt edə bilmişdilər.

***İcma və yaxud camaat torpaqları.*** Bu torpaq sahələri əsasən kənd icmasına məxsus olurdu [173,72;115,28]. İ.Şopenin yazdığına görə, İrəvan xanlığında 8 icma vardı. İcmalara məxsus kəndlər mulk hüququ ilə həmin icmanın üzvü olan rəiyyətə məxsus idi [bax: 95, 967-980]. İcmaların böyük əksəriyyətini Azərbaycan türkləri təşkil edirdi.

***Vergi və mükəlləfiyyətlər.*** Xanlıqlar dövründə Azərbaycanın digər xanlıqlarında olduğu kimi, İrəvan xanlığında da mövcud olan vergilərin sayı və miqdarı müxtəlif idi. Bu vergilər əsasən məhsulla, qismən isə pulla alınırdı. Bir qayda olaraq vergiləri kəndlilər ödəyirdi (bütün feodallar vergi verməkdən azad idi). Kəndli kateqoriyaları əsas etibarilə rəiyyət, rəncbər və elatlardan ibarət idi [95,967; 115,30-31]. Hələ XVII əsrdən buradakı otlaqlar əsasən qızılbaş tayfası olan ağcalı-qacar, Ustaclı və bayatların nəzarətində olmuşdu [174,311]. İrəvan xanlığında mövcud olan vergi və mükəlləfiyyətlər barədə ətraflı məlumatı 1828-ci ilin sonunda Rusiya çar məmurlarının tərtib etdiyi "İrəvan əyalətində pul və məhsul vergisi barədə siyahı"dan əldə etmək mümkündür. 1939-cu ildə N.Q.Boqdanovanın nəşr etdirdiyi bu sənədlərdə İrəvan xanlığındakı köçəri və yarımköçəri tayfaların ödədikləri vergi və mükəlləfiyyətlər öz əksini tapmışdır [141, bax: 174,313-314].

İrəvan xanlığında əsasən bəhrə (malcəhət), çöpbaşı, çobanbəyi, mancanaq pulu, toxucu pulu, bağpulu, bayramlıq və s. adda vergilər mövcud idi.

Digər Azərbaycan xanlıqlarında olduğu kimi, İrəvan xanlığında da iki müxtəlif təsərrüfat forması mövcud idi: oturaq əkinçilik və aran-yaylaq (və ya yaylaq-qışlaq) maldarlıq təsərrüfatı. Bu da kəndlilərdən alınan vergilərin sayca çox olmasına səbəb olurdu.

***Bəhrə (malcəhət).*** Torpaqdan istifadə müqabilində məhsulla alınan əsas vergi — bəhrə (malcəhət) idi. İrəvan xanlığında bu vergi məhsulla ödənildiyi üçün bəhrə adlanırdı [174, 266]. Taxılçılıqla məşğul olan rəiyyətlər üçün bəhrə məcburi vergi idi. Xəzinə torpaqlarından toplanmış məhsulun hər 10 hissəsindən 3,5 hissəsi xanın, qalanı isə torpağı becərənlərin idi. Mülkədar torpaqlarından toplanmış məhsulun isə 1,5 hissəsi mülkədarın, iki hissəsi xəzinənin, qalan hissəsi torpağı becərənin payına düşürdü [115, 37].

*Çöpbaşı.* Maldarlar heyvanlarını dövlətə məxsus otlaqlarda otardıqları üçün bu vergini ödəyirdilər. Onlardan eyni zamanda çobanbəyi vergisi də toplanırdı. Bundan başqa, maldarlar xana yağ, yun və başqa məhsullar da verməli idilər [115, 38].

Şəhərlilərin ödədiyi vergilərə mancanaq pulu, toxucu pulu, bağ pulu, bayramlıq və s. daxil idi [115, 38].

Xanlığın əhalisi göstərilənlərdən başqa örüş pulu, tüstü pulu verir, süvari dəstəsinin xərclərini (arpa, yəhər-yüyən xərcləri) ödəyirdilər. Xanın öz vəzifəli məmurları, demək olar ki, vergidən azad idilər. Xanlığın əhalisi mülkədarlara və xana ödədikləri vergilərdən əlavə müxtəlif mərasimlərlə və bayramlarla əlaqədar "peşkəş", yaxud "bayramlıq" da verirdilər [174,281].

İrəvan sakinləri şəhərin gecə mühafizəsinin təmin olunması üçün ildə 72 tümən xüsusi vergi verirdilər [95,978].

İrəvan xanlığında ermənilərdən dini vergi — cizyə alınmırdı. Çünki xanlığın ərazisində ermənilər olduqca az idi və onlardan alınacaq

cizyənin dövlət üçün ciddi bir iqtisadi əhəmiyyəti yox idi. Digər tərəfdən, Azərbaycan hökmdarları ənənəvi olaraq Üçkilsə katolikoslarını və erməniləri himayə edirdilər.

Onu da qeyd etmək yerinə düşər ki, İrəvan xanlığı Rusiya tərəfindən işğal olunduqdan sonra çar məmurları canfəşanlıq edərək ermənilərin onlara göstərdiyi "xidmət" müqabilində İrəvan xanlığı ərazisindəki ermənilərin "vergidən azad edilməsi" məsələsini qaldırmışdılar. Belə ki, 1828-ci il martın 22-də Rusiya imperatorunun fərmanı ilə yeni yaradılmış qondarma "Erməni vilayəti"nin hakimi knyaz Aleksandr Çavçavadze Nerses Əştərəkliyə məktub yazaraq Qafqazın xüsusi korpusunun komandanı Paskeviçin 1828-ci il 17 mart tarixli 458 saylı əmrinin yerinə yetirilməsi məqsədilə əvvəlki hakimiyyət dövründə İrəvan xanlığında ermənilərdən xüsusi bir vergi alınıb-alınmaması barədə məlumat istəmiş və belə bir verginin mövcud olduğu halda ləğv olunmasını tələb etmişdi [214,54]. Lakin, 1828-ci il martın 29-da Nerses Əştərəkli bu məktuba cavab olaraq bildirirdi ki, "əvvəlki hakimiyyət dövründə İrəvan xanlığında ermənilərdən dini dönüklük üçün heç bir vergi alınmayıb" [214, 54]. Yuxarıda qeyd edildiyi kimi, bu, xanlığın Rusiya tərəfindən işğalına qədər burada yaşayan ermənilərin sayının çox az olması ilə bağlı idi. Buna görə də İrəvan xanları həmin verginin ödənilməsini lüzumsuz saymışlar. Ermənilərin İrəvan xanlığında sayca az olmalarını vergi ilə bağlı belə bir fakt da sübut edir ki, ilk mənbələrdə dövlətə və mülkədarlara vergi verən əhali kateqoriyalarının sırasında ermənilər barədə heç bir məlumata təsadüf olunmur. İ.Şopenin yazdığına görə, ətraf beş mahalda yaşayan ermənilər şərab çəkməklə məşğul olduqlarına görə cəmi-cümlətanı 680 tümən vergi ödəmişlər [95, 975].

Mükəlləfiyyətlər iki şəkildə olurdu: biyar və əvariz (iməcilik). Mülkədarlara məxsus torpaqlar kənd icmaları tərəfindən becərilirdi. Biyar hər bir ailənin ildə 3-6 gün mülkədar təsərrüfatlarında havayı

olaraq işləməsi idi. Bundan əlavə, icma üzvləri ildə 2 gün əvariz (iməcilik) qaydasında torpaq sahibi üçün işləməli idilər [174,278-279].

A.Araratlının məlumatına görə, əkin vaxtı Valarşabad (Vağarşabad) kəndinin sakinlərini mülk sahiblərinin torpaqlarına apararaq, istirahət günləri istisna olmaqla, gecə-gündüz işlədirdilər [53,183]. Maraqlı cəhət odur ki, A.Araratlı Valarşabad kəndliləri içərisində bir nəfər də olsun erməni adı çəkmir. Deməli, buranın sakinləri yalnız azərbaycanlılar idi.

Üçkilsəyə məxsus torpaqlar vəqf torpaqları hesab olunduğundan vergilərdən azad idilər. Bu torpaqların mülkiyyətçiləri, hətta, müxtəlif xidmətləri müqabilində maaflıq hüququ da alırdılar.

***İlk mənbələrdə qeyd olunan XVIII əsrə aid bütün vergi adları, bütün təsərrüfat terminləri göstərir ki, İrəvan xanlığında ümumi sosial-iqtisadi mənzərə əsasən Azərbaycanın başqa xanlıqlarında olduğu kimi idi. Daha doğrusu, Azərbaycanın bundan əvvəlki ənənəvi tarixi inkişafının davamı idi.***

*Cədvəl 1.*

Rusiya işğalından sonra İrəvan şəhərində qeydə alınmış meydanların adları

| № | meydanın adı | əlavə məlumatlar |
|---|---|---|
| 1 | Xan bağı meydanı | |
| 2 | Fəhlə bazar meydanı | Bura əsasən iş axtarmağa gələn qara fəhlələr toplaşırdı. |
| 3 | Zal xan meydanı | Meydanın ətrafında bir neçə dükan və iri çinar ağacları vardı. |
| 4 | Bazar meydanı | Bazarla İrəvan qalası arasında yerləşirdi. Bu meydana əsasən kənd əhalisi satmaq üçün ərzaq və digər məmulatlar gətirirdi. |
| 5 | Hüseynəli xan meydanı | Hüseynəli xan məscidinin qarşısında yerləşdiyi üçün belə adlanır. Dairəvi şəkilli bu meydanın ətrafında dükanlar yerləşirdi. |
| 6 | Tağ meydanı | İçəri şəhərdə yerləşirdi. |
| 7 | Çörəkçi meydanı | İçəri şəhərdə yerləşirdi. |
| 8 | Çölməkçi meydanı | İçəri şəhərdə yerləşirdi. |
| 9 | Ticarətçi meydanı | İçəri şəhərdə yerləşirdi. |
| | Qeyd: | İrəvan şəhərindəki meydanlar əsasən əhalinin söhbət etmək üçün cəmləşdiyi yer olduğundan onlardan ticarət məqsədilə istifadə olunurdu. |

***Mənbələr:***

1. Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её присоединения к Российской империи. СПб., 1852 с.877-878.
2. СМОМПК, вып.I, Тифлис, 1881, (kitabın arxasına əlavə olunmuş xəritə).
3. Bournoutian G.A. The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica. Costa Mesa, California and New York, 1992, p.207.

*Cədvəl 2.*

Rusiya işğalından sonra İrəvan şəhərində qeydə alınmış dükanlar*

| № | dükanların yerləşdiyi ərazi | dükanların sayı |
|---|---|---|
| 1 | Karvansaraların ətrafında | 252 |
| 2 | Bazarların yanında və ya ayrı-ayrı cərgələrdə | 543 |
| 3 | İrəvan qalasında | 32 |
| 4 | Təpəbaşı məhəlləsində | 4 |
| 5 | Şəhər məhəlləsi və məscidin ətrafında | 18 |
| 6 | Dəmirbulaq məhəlləsində | 2 |
|  | Cəmi | 851 |

***Mənbələr:***

1. ОРВЗ ч.IV. СПб., 1836, с.290-291.
2. Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её присоединения к Российской империи. СПб., 1852, с.469, 881.
3. Bournoutian G.A. The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica. Costa Mesa, California and New York, 1992, p.204.

* Erməni müəllifi Şahəziz çox maraqlı məlumat verərək qeyd edir ki, ermənilərin İrəvan şəhərində yalnız dükanları var idi, onlar orada gündüzlər alver edir, axşamlar isə dükanlarını bağlayıb evlərinə gedirdilər [bax: 215,34].

*Cədvəl 3.*

Rusiya işğalından sonra İrəvan şəhərində qeydə alınmış karvansaralar*

| № | karvansaranın adı | əlavə məlumatlar |
|---|---|---|
| 1 | Gürcü karvansarası | Əsasən Rusiyadan və Gürcüstandan gətirilən mallar üçün anbar rolunu oynayırdı və 78 dükanı var idi, bunlardan 24-ü şəxsi dükan idi. |
| 2 | Culfa karvansarası | Əsasən İrandan gətirilən mallar üçün anbar rolunu oynayırdı və 38 dükanı var idi. |
| 3 | Zöhrab xan karvansarası | 38 dükanı var idi. |
| 4 | Tahir karvansarası | 74 dükanı var idi. |
| 5 | Sulu karvansarası | 74 dükanı var idi. |
| 6 | Susuz karvansarası | İrəvan şəhərinin Dəmirbulaq məhəlləsində yerləşir, hamamı yoxdur və 74 dükanı var idi. |
| 7 | Hacı Əli karvansarası | 40 dükanı var idi. |
|  | Qeyd: | İrəvan şəhərindəki karavansaralar əsasən bazar və meydanlarda yerləşirdi. |

***Mənbələr:***

1. ОРВЗ ч.IV. СПб., 1836, с.290-291.
2. Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её присоединения к Российской империи. СПб., 1852, с.468-469, 878-880.
3. Bournoutian G.A. The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica. Costa Mesa, California and New York, 1992, p.207.

---

* C.Bornoutyanın əsərində İrəvan şəhərindən başqa xanlığın digər ərazilərində yerləşən karvansaralar haqqında da məlumat vardır:
— Talın mahalındakı karvansara Gümrü və Sərdarabada gedən yolun üzərində yerləşir;
— Dərəçiçək mahalındakı karvansaralardan üçü Tiflis — İrəvan, Səlim adlı digər karvansara isə Dərəçiçək-Göyçə yolu üzərində yerləşir;
— Göyçə mahalındakı karvansaralardan biri Gil kəndinin yaxınlığında, digəri isə Qarahisar yolunun şimalında yerləşir.

*Cədvəl 4.*

İrəvan xanlığının əsas çəki və ölçü vahidləri

| çəki vahidinin adı | dəyəri | əlavə məlumat |
|---|---|---|
| xalvar* | 100 batman** və ya çanax | |
| batman | 4 çərik | |
| çərik | 5 stil*** | |
| stil | 4 çərik və ya 50 misqal | |
| misqal**** | 89 rus funtu | |
| tilani | 2 batman | |
| Təbriz batmanı | 640 misqal və ya 7 17/89 rus funtu | İpəyin, misin, qalayın, şəkər tozunun, ədviyyatın, həna və s.-nin satışı zamanı istifadə edilirdi. |
| təcri | 6 kod | Taxılın çəkisi üçün istifadə olunurdu. |
| çanax | müxtəlif çəkidə olub, İrəvan batmanından böyük və ya kiçik olurdu | Taxılın çəkisi üçün istifadə olunurdu. |
| kod | | Taxılın çəkisi üçün istifadə olunurdu. |
| buğdanın, noxudun, mərcinin xalvarı | | |
| 10 somar***** | | |
| arpanın xalvarı | 12 somar | |
| gənəgərçək və kətan toxumunun xalvarı | | |
| mizan (böyük tərəzinin adı) | | |
| bu tərəzidə ipək və xaricdən gətirilən mallar çəkilirdi | $12^{1/2}$ somar | |
| Əttar — kiçik əl tərəzisi idi. Bu tərəzidə ətriyyat və əczaçılıq malları çəkilirdi | | |

| ölçü vahidinin adı | uzunluğu | əlavə məlumat |
|---|---|---|
| xan arşını | 24 rus verşokuna bərabər idi | Parça və s. toxucu məmulatlarının ölçüsündə istifadə olunurdu. |
| ağac | 7 km-ə bərabərdir | Uzaq məsafələrin ölçüsündə istifadə olunurdu. |
| xalvar | | Əkin və bağ sahələrinin ölçüsündə istifadə olunurdu. |
| somar | | Əkin sahələrinin ölçüsündə istifadə olunurdu. |
| batman | | Əkin sahələrinin ölçüsündə istifadə olunurdu. |

***Mənbələr:***

1. ОРВЗ (Составил Лекгобытов). ч.IV. СПб., 1836, с.286-288.
2. Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её соединения к Российской империи. СПб., 1852, с.886-888.
3. Զաքարիա Ագուլեցի, Օրագրությին: Երեվան,1938: [Əylisli Zəkəriyyə. Gündəlik. Yerevan, 1938].

* xalvar — 28 pud, (pud — 16 kq. — ***red.***) 4 funta bərabərdir.
** batman - 4500 qrama bərabərdir.
*** stil — 139 qrama bərabərdir. Satıl sözündəndir. 24 stil (satıl) 9 funtluq batmana bərabər idi [bax: Əliyev F. XVIII əsrin I yarısında Azərbaycanda ticarət. Bakı, 1964,53]. XVII əsr mənbəsində "istil" şəklində təqdim olunur [104,114]. İrəvan və Naxçıvan xanlıqlarında işlənən əsas ölçü vahidi olub, 1 stil — 139 qrama, 50 stil — 6,95 kiloqrama bərabər idi [bax: Закария Акулисский. Дневник. Ереван, 1939, s.144].
**** misqal — 5 qrama bərabərdir.
***** somar — 3 puda bərabərdir.

*Cədvəl 5.*

İrəvan xanlığında dövriyyədə olan əsas pul vahidləri

| № | pul vahidinin adı | dəyəri* | əlavə məlumat |
|---|---|---|---|
| 1 | qarapul | 4 qarapul 7 rus gümüş qəpiyinə bərabər idi | İrəvan xanlığında işləyən əsas yerli pul vahidi idi. Misdən hazırlanırdı |
| 2 | tümən | 10 sahibqıran | Səfəvi dövlətindən qalma pul vahidi |
| 3 | pənahabad | 10 şahı və ya 500 dinar | Qarabağ xanlığının pul vahidi |
| 4 | şahı | 2 gümüş qəpik | Səfəvi dövlətindən qalma pul vahidi |
| 5 | mahmudi | 1-ci növ-4, 2-ci növ-2, 3-cü növ-1 gümüş rubl | Səfəvi dövlətindən qalma pul vahidi, 3 növü vardı |
| 6 | bisti | 20 dinar | Səfəvi dövlətindən qalma pul vahidi |
| 7 | sahibqıran və ya minaltun | 35 gümüş qəpik | Qacarlar İranının pul vahidi |
| 8 | quruş | 1 növ-2 gürcü abbasısı; 2 növ-1,5 abbası və 6 rus mis pulu; 3 növ-1 gürcü abbasısı | Osmanlı pul vahidi, 3 növü vardı |
| 9 | real | 50 qəpik | |
| 10 | abbası | | Gürcü pul vahidi |
| 11 | İran sahibqıranı | 2 gürcü abbasısı | Qacarlar İranının pul vahidi |
| 12 | darülxliafi | 1 rubl, 34 qəpik | Osmanlı pul vahidi |
| 13 | Holland çervonu | 16 cürcü abbasısı və ya 8 İran minaltunu | Hollandiya pul vahidi, bəzən bacaqlı da adlanır |
| 14 | imperial | 10 gümüş rubl | Rusiya pul vahidi |

***Mənbələr:***

1. ОРВЗ (Составил Лекгобытов). ч.IV. СПб., 1836, с.287-288.
2. Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её присоединения к Российской империи. СПб., 1852, с.888-890.

* Pulların dəyəri rus gümüş pulu ilə ölçülür.

*Cədvəl 6.*

İrəvan xanlığında becərilən əsas kənd təsərrüfatı bitkiləri

| bitkilərin adı | əkildiyi yerlər | götürülən məhsulun miqdarı | keyfiyyətli məhsulun becərildiyi yerlər |
|---|---|---|---|
| *1* | *2* | *3* | *4* |
| buğda, arpa | dağlıq ərazilərdə, düzənlikdə | 34.185 xalvar buğda | |
| 11.500 xalvar arpa | Zəngibasar mahalının Yağvərə və Əlipara kəndləri | | |
| çəltik | ancaq çökəkliklərdə | 18.400 xalvar | |
| | Saatlı, Qarbi, Şərur və Zəngibasar mahalları | | |
| darı | düzənlikdə | 50-dən 100-dək və daha çox xalvar | |
| pambıq | çökəklik mahallarda | 2100 xalvar | Zəngibasar, Sərdarabad və Sürməli mahalları |
| gənəgərçək | pambıq tarlaları ətrafında | 1 batman gənəgərçəkdən 50 batman alınır, ondan da 12,5 batman yağ alınır | |
| tütün | Sürməli mahalında | 60 xalvar | |
| 1 funt tütün toxumdan 1 xalvar toxum alınır | Sürməli mahalının Ərhacı kəndi | | |

| 1 | 2 | 3 | 4 |
|---|---|---|---|
| küncüt | düzənlikdə | 24 xalvar | |
| 4 batman küncüt toxumundan 1 batman yağ alınır | | | |
| kətan | həm aran, həm də dağlıq ərazilərdə | 12 xalvar | |
| 4 batman kətan toxumundan 1 batman yağ alınır | | | |
| qovun | düzənlikdə | çox əkilir | |
| xaşxaş | ancaq ermənilər əkir | az miqdarda | |

***Mənbələr:***

1. ОРВЗ (Составил Лекгобытов). ч.IV. СПб., 1836, с.278-280.
2. Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её присоединения к Российской империи. СПб., 1852, с.739-741,745-746.

*Cədvəl 7.*

Hüseynqulu xan Qacarın hakimiyyəti dövründə becərilən
kənd təsərrüfatı bitkiləri

| adı | miqdarı (xalvarla2) | illik gəlir |
|---|---|---|
| buğda | 34.185 | 830.000 gümüş rubl |
| arpa | 11.500 | |
| darı | 3.200 | |
| çəltik | 18.400 | |
| gənəgərçək | 40 | |
| küncüt | 24 | |
| kətan toxumu | 12 | |
| tütün | 60 | |
| pambıq | 2.100 | |

***Mənbə:***
1. ОРВЗ (Составил Лекгобытов). ч.IV. СПб., 1836, с.280-281.

*Cədvəl 8.*

İrəvan xanlığında qeydə alınmış bağlar və onların gəliri

| | sayı | ölçü vahidi | Üzüm bağlarının gəliri pul vahidi | meyvə bağlarının gəliri pul vahidi |
|---|---|---|---|---|
| İrəvan şəhəri | 1.473 | 1.233 | 2.608 x34b | 2.982x3b |
| Qırxbulaq | 259 | 172 | 390 - | 150 - |
| Zəngibasar | 199 | 38 | 80 - | 115 - |
| Gərnibasar | 54 | 36 | 1 - | 68 50 |
| Vedibasar | 76 | 15???? | - - | 19 50 |
| Şərur | 284 | 78 | 2 - | 320 - |
| Sürməli | 375 | 110 | 95 - | 279 - |
| Dərəkənd Parçenis | 96 | 21 | 10 - | 76 20 |
| Saatlı | 80 | 16 | 9 50 | 72 60 |
| Talın | 4 | 4 | - - | - - |
| Seyidli-Axsaxlı | 9 | 2 | - - | 3 - |
| Sərdarabad | 62 | 34 | 160 - | 245 - |

***Mənbə:***

1. Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её присоединения к Российской империи. СПб., 1852, с.747.

*Cədvəl 9.*

İrəvan xanlığında bağçılıq

| bağ bitkisinin adı | harada | qiyməti | cəmi |
|---|---|---|---|
| ərik, şaftalı, xurma, heyva, üzüm, nar, tut | | | 5000 bağ |
| ərik — təzəsi | | kisəsi 1 rubla | |
| ərik — qurusu | | batmanı — 40 qəpik gümüşə | |
| buğda ilə mübadilə edilən ərik | | 1 batman quru ərik 4 batman buğdaya | |
| üzüm bağları | Çölməkçi-110<br>Kanakir- 120<br>Əştərək-132;<br>Parakər və Şarabad-46<br>Üçkilsə-107<br>Uşaqan-46 və 34 müxtəlif kiçik bağlar | | |

***Mənbə:***

1. ОРВЗ (Составил Лекгобытов). ч.IV. СПб., 1836, с.281-282.

*Cədvəl 10.*

İrəvan xanlığında maldarlıq

| atçılıq | iri mal-qara | qoyun və keçi | dəvə | uzun-qulaq | donuz |
|---|---|---|---|---|---|
| Ən yaxşısı qarapapaq və kürdlərdə 20 min | 100 minədək | 290 minədək | 400-dək | 5 minədək | cüzi miqdarda (Üçkilsədə) |

***Mənbə:***

1. ОРВЗ, (Составил Лекгобытов). ч.IV. СПб., 1836, с.282-283.



Şəkil 1.
Azərbaycan türklərinə məxsus Səlim karvansarası (XIV əsr)
***Mənbə:*** www.armeniapedia.org/index.php.title=/Rediscov



Şəkil 2.
Azərbaycan türklərinə məxsus Talın karvansarasının xarabalıqları
***Mənbə:*** Якобсон А.Л. Очерки истории зодчества Армении V-XVII веков.
М., 1950, с. 105



Şəkil 3.
Azərbaycan türklərinə məxsus karvansaranın (Gürcü karvansarası) qalıqları
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.69



Şəkil 4.
Köhnə  İrəvan bazarı. 1905-ci ilə aid foto
***Mənbə:*** Luigi Villari. Fire and Sword in the Caucasus. London, 1906, p.220



Şəkil 5.
Zərabxanada ticarət köşkləri. İrəvan şəhəri
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.68



Şəkil 6.
İrəvan şəhərində Dəmirbulaq körpüsü
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.68



Şəkil 7.
Zəngi çayı üzərində körpü və İrəvan xanları sarayının görünüşü
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.66



Şəkil 8.
Zəngi* çayı üzərində Qırmızı körpünün görünüşü. İrəvan.
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.67

* Müəlliflər Azərbaycan türklərinə məxsus "Zəngi" toponimini erməniləşdirərək "Razdan" sözü ilə əvəz etmişlər



Şəkil 9.
Qırxbulaq* çayı üzərində körpü. İrəvan
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.67

* Müəlliflər Azərbaycan türklərinə məxsus "Qırxbulaq" toponimini dəyişərək "Qedar" sözü ilə əvəz etmişlər.



Şəkil 10. İrəvan xanlığının Rusiya tərəfindən işğalından sonra
Goğb (Qoğb) duz dağının və duz mədənlərinin görünüşü
Dübua de Monperenin  çəkdiyi şəkil (XIX əsr)

**Tarixi-coğrafi sərhədləri**

Tarixi Azərbaycan torpaqlarında yaranan müstəqil dövlət qurumlarından biri olan İrəvan xanlığı XVIII əsrin II yarısında Şimali Azərbaycanın cənub-qərb torpaqlarını əhatə edərək Araz çayının hər iki sahilində yerləşirdi.

İrəvan xanlığının tarixi-coğrafi sərhədləri haqda müxtəlif məlumatlar mövcuddur.

N.Dubrovin, qısa da olsa, İrəvan xanlığının sərhədləri haqqında məlumat vermişdir. O, xanlığın şimaldan Pəmbək, Şəmşəddil, Qazax sultanlıqları və Gəncə xanlığı, şərqdən Qarabağ və Naxçıvan xanlıqları, cənub və qərbdən isə İran və Osmanlı əraziləri ilə həmsərhəd olduğunu yazır [149, 327]. S.D.Burnaşev haqlı olaraq Azərbaycan xanlıqlarının siyasi-coğrafi sərhədlərinin fasiləsiz müharibələr nəticəsində daim dəyişdiyini* qeyd edir [40, 25-26]. Lakin müəllif İrəvan xanlığının qonşu dövlətlərlə sərhədlərini təsvir edərkən yanlış olaraq xanlığın yalnız Arazın sol sahilində yerləşdiyini göstərir [40, 17]. Müxtəlif mənbələrin təsvirlərində İrəvan xanlığının Araz çayının əsasən sol sahilində, qismən isə sağ sahilində yerləşdiyini izləmək mümkündür** [95, 351-353; 149, 327; 71, V, 253; bax: bölmənin sonu, xəritə 3,4].

61°-64° şərq uzunluq dairəsi və 41°-39° şimal en dairəsi arasında yerləşən İrəvan xanlığı məhsuldar Ağrı vadisini öz hüdudları daxilinə almaqla şimaldan Şörəyel, Pəmbək, Şəmşəddil, Qazax sultanlıqları, şimal-şərqdən Gəncə, şərqdən Qarabağ və Naxçıvan xanlıqları, cənubdan Xoy xanlığı, Maku xanlığı və Bayazid paşalığı, qərbdən Kağızman və Qars paşalıqları ilə həmsərhəd idi. Ümumilikdə İrəvan

* Şörəyel və Pəmbək ərazisi xanlığın əlindən alınaraq sultanlıq şəklində Rusiya imperiyası tərəfindən Kartli-Kaxetiyə verilmişdi [71, I, 294].
** İrəvan xanlığının Rusiya imperiyası tərəfindən işğalından sonra tərtib olunmuş xəritələrdə belə xanlığın ərazisinin Araz çayının hər iki sahilində yerləşdiyini izləmək mümkündür [bax: xəritə 1, 2, 3].

xanlığının ərazisi 11,000 kv.verstə bərabər idi* [bax: 71, IV, 253; 106, 34].

Xanlığın siyasi-coğrafi sərhədləri qərbdə Arpaçaydan, Qızılkilsə kəndinin yanından şimaldan cənuba doğru uzanır, sonra bir qədər şərqə tərəf dönməklə Arpaçayın aşağı axarı üzərindəki Hacı Bayramlı kəndinə doğru gedir, buradan çayı keçib qərbə doğru uzanır və Qəribdağ silsiləsinə çatırdı. Burada sərhəd Arazı keçir və həmin dağ silsiləsi ilə şimal-qərbə tərəf — Koroğlu dağına qədər uzanırdı. Sonra əvvəlcə şimal-şərqə, daha sonra isə azacıq şimala dönməklə, su paylanan yüksəkliyə — Kiçik Ağrıya, bundan sonra isə şimal-qərbə — Araza qədər uzanırdı [bax: bölmənin sonu, şəkil 12]. Burada Arazın sərhədini kəsərək Naxçıvanı Şərur düzənliyi ilə ayıran dağ silsiləsi ilə uzanır, daha sonra Gözəldərə dağ silsiləsi ilə Zəngəzur dağlarının şimal parçası ilə Göyçə gölünü və onun şərqindəki dağları öz içərisinə alırdı. Bundan sonra isə xanlığın sərhədləri Pəmbək dağlarını və Alagözün şimal yamacını Arpaçayla birləşdirən xətlə Bazarcıq kəndinin üstündən keçərək Qızılkilsə kəndinə qədər gəlib çatırdı** [95, 351-352; 214, 31-32].

Hüseynəli xanın hakimiyyəti illərində (1762***-1783) İrəvan xanlığının sərhədləri daha da genişlənərək Şörəyel bölgəsini də əhatə etmişdi [214, 31-32]. Melikset bəyin "Gürcü mənbələri"nə əsaslanan A.R.Qriqoryan yazır: "1779-cu ildə gürcü knyazı II İrakli İrəvan xanlığına qarşı hücuma keçərək Şörəyeli işğal etdi və onun hakimi Sultan Qəhrəmanı özünə tabe etdi". Bu işğaldan sonra Şörəyelin yenidən azad olunub İrəvana qaytarılması məsələsi xanlığın xarici siyasətində daim diqqət mərkəzində olmuşdur [105, 178; 214, 32].

*Təsvir Dimitri Zubarevə məxsusdur [bax: 71, IV, 253].
**İrəvan xanlığının ərazisi və sərhədlərindən bəhs edən bütün əsərlərdə, bir qayda olaraq, bütün yer adları, toponimlər yalnız Azərbaycan türkcəsindədir, daha doğrusu, Azərbaycan xalqına məxsus adlar və yaşayış məskənləridir. Erməni mənbəsi sayılan "Cambr"da bu cür toponimlər yüzlərlədir [bax: bölmə 2, əlavə № 4]. Erməni müəllifi V.A. Qriqoryan belə öz əsərində bütün toponimlərin əksəriyyətinin əvvəlcə Azərbaycan türkcəsində, sonra isə mötərizə içərisində fars dilindən götürmə sözlərlə erməniləşdirilmiş şəklini vermişdir. Məsələn: Arpaçay (Axuryan), Gözəldərə (Vardenis) və s. [214, 31-32 və s.].
*** İrəvan xanı Hüseynəli xan Qacarın hakimiyyətə gəlməsi dövrün mənbəsində "Cambr"da 1759-1760-cı illərdən başlayaraq xatırlanır [105, 137].

1795-ci ildə Ağa Məhəmməd xan Qacar İrəvan xanlığını özündən asılı hala saldı. Bundan sonra Pəmbək, Qazax və Borçalını xüsusi fərmanla irəvanlı Məhəmməd xana verdi [149, 65]. Lakin az sonra — 1796-cı ildə V.Zubovun başçılığı ilə Rusiya qoşunları Azərbaycana hücum etdi. Ağa Məhəmməd xan Qacar İranın içərilərinə çəkilməyə məcbur oldu. Bunun nəticəsində İrəvan xanı Məhəmməd xan Ağa Məhəmməd xan Qacarın ona verdiyi Azərbaycan torpaqlarını — Pəmbək, Qazax və Borçalını öz hakimiyyəti altında saxlaya bilmədi.

1797-ci ilin yazında Ağa Məhəmməd şah Qacar Azərbaycana ikinci dəfə yürüş edərək Pəmbək və Borçalını yenidən İrəvan xanına verdi, Şəmşəddil və Qazaxı isə gəncəli Cavad xana verməyi İraklidən tələb etdi [149, 207; 214, 33] Ağa Məhəmməd şahın həmin ilin iyul ayında Şuşada qətlə yetirilməsi bu planın reallaşdırılmasına imkan vermədi. Digər tərəfdən, irəvanlı Məhəmməd xan həbs olunaraq İrana aparıldı. İrəvanlı Məhəmməd xan İrandan qayıtdıqdan sonra 1801-ci ilin əvvəlində Şörəyeli tutdu. Şörəyel 1805-ci ilin yazında Rusiya tərəfindən işğal edilənə qədər İrəvan xanlığının tərkibində qaldı.

**İnzibati ərazi bölgüsü**

Azərbaycanın digər xanlıqlarında olduğu kimi, İrəvan xanlığı da inzibati-ərazi quruluşuna görə mahallara, mahallar isə kəndlərə bölünmüşdü [bax: bölmənin sonu, xəritə 3].

***İrəvan şəhəri*** şimaldan Qırxbulaq, qərbdən və cənubdan Zəngibasar mahalları ilə, şərqdən isə onu Qərbibasar (Körpübasar) mahalından ayıran Oxçuberd dağının daşlı pillələri ilə həmsərhəd idi. İrəvan şəhəri onu əhatə edən bağlarla birgə geniş ərazini əhatə edirdi. Onun sahəsi 28 verstə bərabər idi [95, 463-464; Bax: bölmənin sonu, şəkil 5, 6, 7, 8, 11]. İrəvan xanlığının paytaxtı, müstəqil inzibati mərkəz olan İrəvan şəhəri iki hissəyə – içəri şəhər (qala) və bayır şəhər hissəsinə bölünmüşdü [bax: bölmənin sonu, xəritə: 2, 4].

***İçəri şəhər*** əsasən İrəvan qalasından ibarət idi. İrəvan qalası 1583-cü ildə Osmanlı sərkərdəsi Fərhad paşa tərəfindən tikilmiş, sonralar dəfələrlə dağıdılmış, yenidən bərpa edilmiş, XVIII əsrin sonunda isə kifayət qədər möhkəmləndirilmiş və dəfələrlə ağır mühasirələrə tab gətirmişdi. İrəvan qalası Zəngi çayının sol sahilində yerləşirdi. Qala üç tərəfdən dərin xəndəklə, digər tərəfdən isə Zəngi çayının sol sahilində sıldırımda tikilmiş 2 hündür divarla əhatə olunmuşdu. Qalanın iki qapısı vardı: şimalda məşhur Şirvan qapısı, cənubda isə Təbriz qapısı. Mühasirə zamanı sudan istifadə etmək üçün qaladan Zəngi çayına çıxış da var idi [71,IV,290; 200,41].

1813-cü ildə burada olan Qaspar Druvil yazırdı: «İrəvan qalası iki divarla əhatə olunub, şəhərdən yarım top atəşi məsafəsində yerləşir. Qala uzun müddət Türkiyə və İran arasında mübahisəyə səbəb olmuş, nəhayətdə İranın (Səfəvilərin — ***red.***) hakimiyyəti altında qalmışdı. Qalanı xan idarə edir. Xan qalanın içərisində üç nizami tabor, qalanı qoruyan 60 top və süvari artilleriya bölüyünün yarısını saxlayır [49,8]».

İrəvan qalasının içərisində sərdarın sarayı, hərbçilərin evləri, dükanlar və iki məscid vardı.* Qalanın içərisinə 2 yerdən — Zəngi çayından və cənub-şərq tərəfdən — Qırxbulaq çayından yeraltı yolla su çəkilmişdi [bax: bölmənin sonu, şəkil 3, 4]. Rusiya işğalına qədər İrəvan qalasında 800 ev vardı. Lakin işğaldan sonra bu evlərin çoxu dağıdılmışdı [71, IV. 290].

***Bayır şəhər*** əsasən üç böyük məhəllədən ibarət idi. Həmin məhəllələr bunlar idi:

***Şəhri (Əski şəhər)*** məhəlləsi — şəhərin şimal-şərq hissəsini əhatə edərək Qırxbulaq çayının sağ sahili ilə İrəvan qalasına kimi uzanırdı. Şəhərin mərkəzi bazarı və bütün meydanları, bir çox karvansaraları

* İrəvan şəhərində qeydə alınan məscidlər bölmənin sonundakı cədvəldə verilmişdir [bax: cədvəl 2; şəkil 1, 2, 15].

və hamamları bu hissədə yerləşirdi [95, 464; 200, 46; Bax: bölmənin sonu, cədvəl 3; şəkil 9, 10, 14].

***Təpəbaşı*** məhəlləsi — Zəngi çayı ilə Şəhri məhəlləsinin arasındakı təpəlikdə yerləşirdi. Bu məhəllə şəhərin qərb hissəsini əhatə edirdi. Təpəbaşı məhəlləsini Şəhri məhəlləsindən İrəvanın adlı-sanlı adamlarının çoxsaylı bağları ayırırdı. Hüseynqulu xana məxsus məşhur Xan bağı da burada yerləşirdi [95, 464-465; 200, 46].

***Dəmirbulaq*** məhəlləsi — Şəhri məhəlləsindən cənub-şərqdə, İrəvan qalasının şərqində yerləşirdi. Cəfər bəy məscidi və hamamı, həmçinin Həsənəli hamamı və Susuz karvansarası burada yerləşirdi [95, 465; 214, 40; 200, 47]. Yuxarıda göstərilən məhəllələrin sakinləri Azərbaycan türkləri idi [200, 47].

XVI əsrdə osmanlı yürüşləri zamanı sultanın katibi olmuş İbrahim Rəhimizadə İrəvan şəhərini “Azərbaycan mülkünün gözü” adlandırmışdı [9, 169]. XIX əsrin I qərinəsində Rusiya tərəfindən işğal olunmasına baxmayaraq, sonrakı dövrlərdə də İrəvan şəhəri öz gözəlliyini və Azərbaycan türklərinə məxsusluğunu saxlayırdı. B.Jelixovskaya bu haqda yazır: "İrəvan görünüşünə görə bütünlüklə tatar (Azərbaycan — ***red.***) şəhəridir, uzaqdan çox gözəldir. Şəhərin yerləşdiyi düzənlik nəhəng çiçək səbətinə bənzəyir. Ağ evlər, qüllələr, qalanın xarabalıqları, rəngbərəng kaşılarla üzlənmiş məsçid və təmtəraqlı minarələr: bunların hamısı bağların içərisində itir, piramidaşəkilli sərvlərin xiyabanı ilə dövrələnir, hər şey üzüm tənəkləri, sarmaşıq xalçaları ilə əhatə olunmuş, hamısı qızılgül və nar kolları ilə bəzədilmişdi. Zəngi çayı yüksək dağdan şəlalə kimi düzənliyə tökülür və qayalarda dərin yataq açaraq şəhərə doğru yönəlir və hər cür yaşıllığın keçilməz cəngəlliyində itir" [154, 40-42]. 1836-cı ildə Leqkobıtov tərəfindən tərtib olunmuş mənbənin məlumatına görə, İrəvan qalasının

ətrafında — bayır şəhərdə 1736 ev, 5 meydan, 8 məscid, 5 kilsə,* 6 karvansara, 1670 dükan, 9 ictimai hamam, 1470 üzüm və meyvə bağı, 40 dəyirman, 6 ding vardı [71, IV. 291]. Leqkobıtovdan fərqli olaraq, İ.Şopen İrəvan şəhərində 1730 ev olduğunu göstərir. Bu evlərdən 792-si Şəhri (Əski şəhər), 622-si Təpəbaşı, 322-si isə Dəmirbulaq məhəlləsində yerləşirdi [95,468].

***Sərdarabad qalası*** İrəvan qalasından sonra ikinci ən böyük qala-şəhər olmaqla bərabər Azərbaycanın ən möhtəşəm orta əsr qalalarından biri idi. İ.Şopenin məlumatına görə, bu qalanın əsası İrəvan xanı Hüseyn xan (Hüseynqulu xan Qacar — ***red.***) tərəfindən təqribən 1810- cu ildə qoyulub [95,255]. Araz çayının sol sahilində yerləşən Sərdarabad qalasının ikiqat hörgülü, hündür divarları uzunsov dördbucaqlı formasında idi. Top yerləşdirmək üçün uzun (yan) divarlarda 6, qısa divarlarda isə 4 bürcü var idi. Dərin xəndəklə əhatə olunan qalanın dövrəsi 4 verstə yaxın idi. Burada sərdarın sarayından başqa 700-dək ev, 1 məscid, 33 dükan, 16 dəyirman, 1 ding, 4 yağçəkən zavod, 1 boyaqxana və sərdara məxsus geniş bağ vardı. Əhalisi əkinçilik, maldarlıq, xırda ticarət, bez toxuculuğu, dəmirçilik, dərzilik və digər sənət sahələri ilə məşğul olurdu [71,IV.291-292].

Digər mənbənin məlumatında Sərdarabad qalası dairəvi qülləsi olan çiy kərpicdən tikilmiş divarlarla əhatə olunmuşdu. Keçmiş Sərdarabad kəndi qalanın içərisində yerləşirdi [59,28]. Sərdarabad qalası üç tərəfdən ikiqat divarlarla əhatə olunmuşdu, yalnız cənub tərəfdən təkqat divara malik idi [32,564].

Xanlıq inzibati cəhətdən mahallara bölünürdü [bax: 95,442-446; 50,31]. Mahalları mahal bəyləri və ya naiblər idarə edirdi. Mahal bəyi və ya naib vəzifəsi irsi idi. Lakin yeni mahal bəyi və ya naib hər də-

* Bu kilsələr İrəvan xanlığının Rusiya tərəfindən işğalından sonra, ermənilərin xüsusi məqsədlə Osmanlı imperiyası və Qacarlar İranından köçürülərək İrəvan şəhərində yerləşdirilməsindən sonra inşa edilmişdi.

fə xan tərəfindən təsdiq edilirdi. Naiblər mahalın inzibati, mühafizə və bəzən məhkəmə işlərinə də cavabdeh idilər.

Kəndlər ***yüzbaşı*** və ***kəndxudalar*** tərəfindən idarə olunurdu. Xanlığın idarəetmə sistemində çalışanlar, demək olar ki, aylıq məvacib almırdılar. Onlara xidmətləri müqabilində məvacib xəzinə üçün toplanan vergi hesabına ödənilirdi.

İrəvan xanlığının ərazisi əvvəllər inzibati cəhətdən 12 mahala bölünmüşdü. Sonralar Hüseynqulu xan Qacar daha 3 yeni mahal yaradaraq mahalların sayını 15-ə çatdırdı [200,33]. Xanlıq mahallara bölünərkən xanlıq ərazisindəki suvarma sistemindən bütün mahalların istifadə edə bilməsi nəzərə alınmışdı. Bu da xanlıq ərazisində kənd təsərrüfatının inkişafı üçün həlledici əhəmiyyətə malik idi.

İrəvan xanlığına aşağıdakı mahallar daxil idi [bax: bölmənin sonu, cədvəl 2].

***Qırxbulaq mahalı.*** Bu mahal İrəvan şəhərinin şimal və cənubunu əhatə edirdi. Cənubdan Araz çayı, şimaldan Dərəçiçək, qərbdən Gərnibasar, şərqdən Gərni — Vedibasar mahalları ilə həmsərhəd idi. XVIII əsrin sonunda bu mahal ayrı-ayrılıqda Qırxbulaq və Zəngibasar mahalları kimi verilir. İrəvan xanı Məhəmməd Hüseyn xan Qacara məxsux mülklərin siyahısından da məlum olur ki, Zəngibasar kəndlərinin çoxu Qırxbulaq mahalının içərisində verilmişdir [214,33]. XIX əsrin birinci rübünə aid mənbədə Qırxbulaq mahalı artıq iki adla təqdim olunur: Qırxbulaq mahalı və Zəngibasar mahalı [95, 442 ]. İ.Şopen Qırxbulaq mahalına məxsus 48 kənd qeydə almışdır və bu kəndlərdən 26-nın artıq dağıldığını qeyd edir [bax: 95, 509-510, 543-544]. Məhz bu məlumata əsaslanan C.Bornoutyan mərkəzi ***Kənəkir*** olmaqla bu mahala 22 kəndin daxil olduğunu qeyd edir [200, 38].

XVIII əsrdə Qırxbulaq mahalının tərkibində olan ***Zəngibasar*** mahalı da, artıq, XIX əsrin əvvəlində tamamilə ondan ayrılmışdı. İ.Şo-

pen Zəngibasar mahalına məxsus 33 kənd qeydə almışdır və bu kəndlərdən 7-nin artıq dağıldığını qeyd edir [bax: 95, 510, 547-548]. Məhz buna görə C.Bornoutyan Zəngibasar mahalına mərkəzi ***Uluxanlı*** olmaqla 26 kəndin daxil olduğunu yazır [200, 35].

***Gərni — Vedibasar mahalı.*** Matenadaranda saxlanılan sənədlər siyahısına əsasən, bəhs edilən dövrdə bu mahal birləşmiş mahal olub Azad (Gərniçay) çayından suvarılan və Arazdan şimala tərəf olan torpaqları, həmçinin Vediçay və Qapançay hövzəsindən suvarılan vadiləri əhatə edirdi. Şimaldan Göyçə, şərqdən Şərurla həmsərhəd idi [214,34]. Bu mahal da sonralar iki yerə — ***Gərnibasar*** və ***Vedibasar****** mahallarına bölünmüşdü [95, 442-443].

Araz çayının sol sahilində yerləşən ***Gərnibasar*** mahalı şimaldan Qırxbulaq, qərbdən Zəngibasar, cənubdan qismən Araz çayı və Vedibasar mahalı, şərqdən isə Göyçə mahalını ondan ayıran yüsək dağlarla həmsərhəd idi. İ.Şopen Gərnibasar mahalına məxsus 95 kənd qeydə almışdır və bu kəndlərdən 43-nün artıq dağıldığını qeyd edir [Bax: 95,442,510-511,547-555]. C.Bornoutyan isə dağılmayan kəndləri nəzərdə tutaraq Gərnibasar mahalına mərkəzi ***Qəmərli*** olmaqla 52 kəndin daxil olduğunu yazır. Ərazisindən axan Gərni çayı bütün mahalı su ilə təmin edirdi [200, 35].

Araz çayının sol sahilində yerləşən ***Vedibasar*** mahalı şimaldan Gərnibasar, qərbdən Araz çayı, cənub və cənub-şərqdən Şərur mahalı və Naxçıvan xanlığı, şərqdən Göyçə mahalı ilə həmsərhəd idi. Vediçay və Qapan çayı mahalı su ilə təmin edirdi [95,442-443]. İ.Şopen Vedibasar mahalına məxsus 54 kənd qeydə almışdır və bu kəndlərdən 33-nün artıq dağıldığını qeyd edir [95,511-512,555-556]. Məhz buna

---

****Vedibasar*** toponimi iki komponentdən — "vedi" — ərəbcə vadi, "basar" — Azərbaycan türkcəsində basmaq (çayın daşaraq ətrafları basması) felindən düzəlmişdir. İrəvan bölgəsində Vedi adlı kiçik çayın olması məlumdur [171,50]. Bundan əlavə, İrəvan bölgəsində Böyük Vedi adlı kənd olmuşdur. Rusdilli mənbədə kəndin adı ərəbcə Vedi Ulya formasında verilir [95,537]. Kəndin aborigen əhalisi — Azərbaycan türkləri 1918-ci ildə ermənilər tərəfindən zorla qovulmuş, əvəzində 1915-1918-ci illərdə Türkiyədən gəlmə ermənilər yerləşdirilmişdi [bax: 110, 162, 169-170].

görə də C.Bornoutyan mərkəzi ***Dəvəli*** olan Vedibasar mahalına 21 kəndin daxil olduğunu yazır [200,35].

***Şərur mahalı.*** İrəvan xanlığının cənub-şərqində yerləşən bu mahal şimaldan Vedibasar mahalı, qərbdən Araz çayı, cənubdan və cənub-şərqdən Naxçıvan xanlığına aid ərazilərlə həmsərhəd idi. Şərq hissəsi Arpaçay vasitəsilə iki yerə bölünürdü [95,443,]. İ.Şopenin siyahıyaalmasında 61 kənddən ibarət olan bu mahalın 11 kəndi tamamilə dağıdılmışdı [95, 512,555-563]. C.Bornoutyana görə, mərkəzi ***Əngiçə*** olan bu mahal 50 kəndə nəzarət edə bilirdi. Arpaçay mahalın bütün suvarma sistemini təmin edirdi [200,35].

***Sürməli mahalı.*** İrəvan xanlığının cənub-qərb ərazilərini əhatə edən bu mahal Araz çayının sağ sahilində yerləşirdi. Mahal şimal və şimal-şərqdən Araz çayı ilə, qərbdən Dərəkənd — Parçenis mahalı, cənubdan onu Bayazid paşalığından ayıran Ağrıdağ silsiləsi ilə həmsərhəd idi. Əsas suvarma mənbəyi Araz çayından çəkilən arxlar olan bu mahalın, İ.Şopenin təsvirinə görə, 78 kəndindən 28-i tamamilə dağıdılmışdı [95, 443, 512-513, 563-567]. Sürməli İrəvan xanlığının ən sıx əhalisi olan mahalı idi. Əhalisi əsasən qoyunçuluqla məşğul idi. C.Bornoutyan mərkəzi ***İğdır*** olan bu mahalın 49 kəndi əhatə etdiyini qeyd edir [200,35]. Lakin İ.Şopen ***Sürməli*** mahalında 50 kəndin yararlı olduğunu göstərir [Bax: 95,563-567].

***Dərəkənd — Parçenis mahalını*** Hüseynəli xan Qacar Sürməli mahalından ayıraraq təşkil etmişdi. Bu mahal İrəvan xanlığının cənub-qərb qutaracağında, Araz çayının sağ sahilində yerləşirdi. Dərəkənd — Parçenis mahalı şimaldan Səədli mahalı, cənub-qərbdən Osmanlı dövləti, şərqdən isə Sürməli mahalı ilə həmsərhəd idi. Yeni mahal Bayazid sərhədindən Araz çayına doğru uzanan Parçeniş, Dərəkənd, Parnaud dərə vadilərini əhatə edirdi. Dağıdılmış 8 kənddən savayı, Parçeniş dərəsində 26, Dərəkənd dərəsində isə 54 yararlı kənd qeydə alınmışdı [95, 443, 513, 571-574]. Məşhur ***Goğb*** (Qulp) kəndi və eyni

adlı duz mədəni burada yerləşirdi. Bu kənd artıq mahal mərkəzinə çevrilmişdi [200, 35-36].

***Səədli mahalı.**** İrəvan xanlığının ən kiçik mahalı sayılan Səədli xanlığın qərb qurtaracağında yerlşirdi. Arpaçay mahalı iki hissəyə ayıraraq Araz çayına qovuşurdu. Səədli mahalı şimadan Talın, qərbdən Osmanlı dövləti, cənubdan Dərəkənd — Parçenis, şərqdən isə Sərdarabad mahalı ilə həmsərhəd idi. İ.Şopen Səədli mahalına məxsus 14 kənd qeydə almışdır və bu kəndlərdən 5-nin artıq dağıldığını qeyd edir [95, 444, 513, 575-576]. Məz buna görə də C.Bornoutyan, əsasən, Səədli tayfasının yaşadığı Səədli mahalının mərkəzi ***Xeyribəyli*** olmaqla 9 kəndi əhatə etdiyini qeyd edir [200, 36].

***Talın mahalı.*** İrəvan əyalətinin şimal-qərbində Alagöz dağı ilə Arpaçay arasında yerləşirdi. Bu mahal şimaldan Şörəyel, qərbdən onu Qars paşalığından ayıran *Arpaçayl*a, cənubdan *Sərdarabad* və *Səədli* mahalları ilə, şərqdən isə *Seyidli-Axsaxlı* mahalı ilə həmsərhəd idi. İ.Şopen Talın mahalına məxsus 47 kənd qeydə almışdır və bu kəndlərdən 27-nin artıq dağıldığını qeyd edir [95, 444, 513-514, 575-576]. C.Bornoutyan Talın mahalı əhalisinin çox olmadığını və yararlı 20 kəndin olduğunu qeyd edir. Mahalın mərkəzi ***Talından*** keçən ticarət yolu Tiflis vasitəsilə Qara dənizə və Rusiyaya gedirdi [200, 36]. Məşhur Talın karvansarası burada yerləşirdi [Bax: şəkil 9].

***Seyidli-Axsaxlı mahalı.*** ** İki tayfanın adından götürülmüş mahal Talın mahalı sərhədlərindən başlayaraq Alagöz dağının cənub və şərq ətəkləri ilə Abaran mahalına qədər əraziləri əhatə edirdi. Şimal-

*"Səədli" qədim türk tayfalarından birinin adıdır. Azərbaycan, Türkiyə, Gürcüstan ərazisində onlarca "Səədli" adlı yaşayış məntəqələri var. Bütün bu yaşayış məntəqələri eyni adlı türk tayfasının yadigarlarıdır. XVII əsrə aid mənbədə Səədin ölkəsi kimi qeyd olunur [34, 90, 193, 485 və s.].

**Seyidli — Arsaxlı mahalının adının birinci hissəsi — "Seyidli" sözü qədim Səədlu tayfasının adı ilə bağlıdır. Hətta erməni mənşəli Qərb tarixçisi C.Bornoutyan da öz əsərində bu sözü Səidli şəklində yazmışdır [bax: 200, 36]. Mahalın adının ikinci hissəsindəki "Axsaxlı" sözü "axsaq", "topal" mənasında deyil. Bu ad Azərbaycanın digər yaşayış məntəqələri və yer adlarında qorunub saxlanılan qədim Sak tayfalarının adı ilə bağlıdır və əvvəllər "Ağsaklı" kimi işlənmişdir. Məsələn: Şəki — Saki, Zakatala — Sak talası, Axsaxlı — Ağ Saklı, Ərsak (Arsak) — ər Sak və s. Bundan əlavə, həmin söz Axcalı-Ağacəri qədim Azərbaycan Qacar tayfalarının adı ilə də bağlı ola bilər. İrəvan bölgəsinin qədimdən Ağcaqoyunlu Qacarların vətəni olmasını mənbələrin məlumatları təsdiq edir.

dan Abaran, qərbdən Talın, cənub-qərbdən az bir hissəsi Sərdar-abad, cənub-şərqdən isə tamamilə Qərbibasar mahalı ilə həmsərhəd idi [95, 444]. Mərkəzi ***Uşi (Üşü)*** olan bu mahal cəmi 20 kənddən ibarət idi. Bunlardan 11 kənd Seyidli tayfasına, 9 kənd isə Axsaxlı tayfasına məxsus idi. Burada dağıdılmış kənd qeydə alınmayıb [95, 575-580; 200, 36].

***Sərdarabad mahalı***. Bu mahal İrəvan xanlığının ən böyük mahallarından biri idi. Sərdarabad mahalı Araz çayının şimal sahillərində, Sürməli mahalının qarşısında yerləşirdi. Mahal şimaldan Talın, qərbdən Səədli, cənubdan onu Sürməli mahalından ayıran Araz çayı, şərqdən isə Zəngibasar və Qərbibasar mahalları ilə həmsərhəd idi. İrəvan xanı Hüseynəli xan Qacarın göstərişi ilə yaradılan bu mahalda Hüseynqulu xan Qacarın göstərişi ilə 1810-cu ilə yaxın məşhur ***Sərdarabad qalası*** tikildi. Hüseynqulu xan Qacar burada yaşayırdı [95, 255]. Mərkəzi Sərdarabad şəhər-qalası olan bu mahalda 30 kənd qeydə alınmışdır. Bu kəndlərdən 8-i dağıdılmışdı. Qeyd etmək lazımdır ki, sonralar bu mahalda yaşayan ermənilər məhz Rusiya işğalından sonra buraya əsasən Bayazid paşalığından köçürülənlər idi [95, 444, 514, 579-584].

***Qərbibasar (Körpübasar) mahalı.*** Bu mahal şimaldan Seyidli-Axsaxlı mahalı, qərbdən Sərdarabad, cənubdan Zəngibasar, şərqdən onu Qırxbulaq mahalından ayıran Zəngi çayı ilə, şimal-şərqdən isə qismən Dərəçiçək mahalı ilə həmsərhəd idi. Gərni çayı ilə suvarılan bütün torpaqlar bu mahala daxil idi. Qərbibasar mahalında 49 kənd qeydə alınmışdır. Bu kəndlərdən 9-u dağıdılmışdı. [95,445,514,583-588]. Abaran-su, Qərbi çayı və Araz çaylarının qolu mərkəzi ***Əştərək*** olan Qərbibasar mahalını su ilə təmin edirdi. C.Bornoutyana görə, xanlığın mərkəzi İrəvan şəhəri və erməni katolikosluğunun dini mərkəzi Üçkilsə bu mahalda yerləşirdi. [200,37]. Lakin mənbələrin təsvirlərində İrəvan şəhəri heç bir mahala tabe olmayan müstəqil inzibati ərazi kimi təqdim olunur [bax: bölmənin sonu, xəritə 1, 3].

***Abaran* mahalı.*** İrəvan xanlığının şimal qurtaracağında yerləşən Abaran mahalına böyük Alagöz dağlarından şimala və şimal-şərqə doğru uzanan torpaqlar, Alagöz və Pəmbək dağları arasındakı ərazilər daxil idi. Mahal yüksəklikdə yerləşən torpaqları əhatə edərək Abaran-su çayının sahilində yerləşirdi. Abaran mahalı şimaldan Pəmbək, şimal-qərbdən Şörəyel, cənubdan Seyidli-Axsaxlı, şərqdən isə Dərəçiçək mahalları ilə həmsərhəd idi. İ.Şopen Abaran mahalına məxsus 61 kənd qeydə almışdır və bu kəndlərdən 22-nin artıq dağıldığını qeyd edir [95, 445, 514-515, 587-591]. Mahalın ərazisinin, demək olar ki, daimi sakinləri az idi. Bura Gürcüstanla sərhəddə yerləşdiyindən zaman-zaman işğalçılara qarşı hərbi əməliyyatlar meydanına çevrilirdi. Mahalın 39 kəndində Böyük Çobanqara tayfası yaşayırdı. Mərkəzi ***Baş Abaran*** idi [200, 37].

***Dərəçiçək mahalı.*** Dərəçiçək mahalı gözəl iqliminə görə digər mahallardan seçilirdi. Mahal Göyçə gölündən başlayaraq Zəngi çayı və Misgənsu** mənsəbindən Alapars kəndinə qədər uzanan dərədən ibarət idi. Dərəçiçək mahalı şimaldan Pəmbək, qərbdən Abaran, cənubdan Qırxbulaq, şərqdən Göyçə gölünün qərbində yerləşən torpaqlarla həmsərhəd idi. İ.Şopen burada qeydə aldığı 53 kənddən 16-nın dağıdılmış olduğunu yazır [95,445,515-116,591-596]. Mülayim iqlimə malik olan bu mahal İrəvan xanlığı əyanlarının yayda dincəldiyi yer idi. 37 kəndi əhatə edən Dərəçiçək mahalının mərkəzi Dərəçiçək və ***Bijni*** idi. Mahalın suya olan tələbatını Misgənsu və Zəngi çayları ödəyirdi [200,37].

---

*Abaran, Aparan və ya Avaran — hər üç toponim Azərbaycan türkcəsindədir. Abaran forması daha qədimdir və ümumtürk dillərinə məxsusdur. Şimali Qafqazın Kuban əyalətində Abaran adlı çayın olması məlumdur [bax: 171, 1]. Abaran qədim türk mənşəi tayfanın adıdır. İrəvan xanlığında Baş Abaran kəndi və Abaran-su adlı çay da vardı. Avaran isə erkən orta əsr hun mənşəli avarların adı ilə bağlıdır [bax: 110, 96-97].

** Misgənsu çayının adı XIX əsrə aid rusdilli mənbədə Misxana çayı kimi təqdim olunur [bax: 95, 445].

***Göyçə* mahalı***. İrəvan xanlığının şimal-şərq hissəsində yerləşən ən böyük mahalı Göyçə idi. Bu mahal Göyçə gölü hövzəsindəki Azərbaycan torpaqlarının əksər hissəsini (qərb torpaqları Dərəçiçək mahalının ərazisinə düşürdü — ***red.***) əhatə edirdi. Mahal şimaldan Şəmşəddil sultanlığı, Gəncə xanlığı, şimal-qərbdən Dərəçiçək mahalı, qərbdən Qırxbulaq və Gərnibasar mahalları, cənub-qərbdən Vedibasar mahalı, cənubdan Naxçıvan xanlığı, şərqdən isə Qarabağ xanlığı ilə həmsərhəd idi. Ərazisinin böyük olmasına baxmayaraq, müharibə meydanı olduğu üçün əhalisi az idi. İ.Şopen Göyçə mahalına məxsus 126 kənd qeydə almışdır və bu kəndlərdən 67-nin dağıldığını və onların çoxunun adlarının artıq unudulduğunu qeyd edir. Mahalın yalnız 59 kəndində yaşayış qeydə alınmışdı [95, 446, 515-517, 595-600]. Əhalisi əsasən maldarlıqla məşğul olan bu mahalın mərkəzi ***Kəvər***** idi [200, 37].

Hər bir mahal ayrılıqda bir inzibati vahid idi. Mahalların idarəsi ilə iri torpaq sahiblərindən təyin olunan mahal bəyləri və ya naibləri məşğul olurdu. Qeyd olunduğu kimi, bu vəzifə irsi olsa da, hər dəfə xan tərəfindən yenidən təsdiq edilirdi.

İrəvan xanları mahal bəylərini adətən qeyri-müəyyən müddətə təyin edirdi. Lakin onlar əlverişli şəraitdən və xanlıqda mərkəzi hakimiyyətin zəifləməsindən istifadə edərək zaman keçdikcə idarə etdikləri mahalları öz irsi mülklərinə çevirirdilər [50, 81; 214, 35].

Mahal bəyləri üzərinə əsasən inzibati və polis vəzifələri qoyulurdu. Onlar mahallarda qayda-qanunun qorunmasına və yolların abad vəziyyətdə saxlanmasına nəzarət edirdilər. Mahal bəyləri tabeliklərində olan kəndlərdə mübahisəli məsələləri və münaqişələri həll edir,

* Göyçə, Göyçə gölü — 1918-ci ildə Qərbibasarda — keçmiş İrəvan xanlığının ərazisində erməni dövləti yaradıldıqdan sonra Göyçə gölünün adı 1930-cu ildə ermənilər tərəfindən dəyişdirilib "Sevan" adlandırılmışdır.

** C.Bornoutyan digər erməni tədqiqatçıları kimi, "***Kəvər***" toponimini saxtalaşdıraraq ermənicə "Avan" (qəsəbə) sözü ilə eyniləşdirsə də, bu kəndin 1829-cu ildə Bayaziddən köçürülən ermənilərlə məskunlaşdırıldığını və Nor Bayazid adlandırıldığını gizlədə bilmir [200,37-38].

bu barədə müvafiq qərarlar qəbul edirdilər. Bundan əlavə, mahal bəyləri yüngül cəzalarla bağlı məhkəmə hökmü də verə bilərdilər [50, 82; 214, 35-36].

Gürcü knyazı II İraklinin İrəvan xanlığına qarşı apardığı müharibələr nəticəsində xanlığın kəndlərinin çoxu dağılmış vəziyyətdə idi. İ.Şopenin hesablamalarına görə, XIX əsrin birinci rübündə İrəvan xanlığında olan 831 kənddən 310-u talan olunmuş və sakinləri tərəfindən tərk edilmişdi [95,510-517].

İrəvan xanlığının idarə olunmasında məhkəmə sistemi mühüm yer tuturdu. Bu sahədə şəriət məhkəməsi başlıca rol oynayırdı. Bununla yanaşı, xanın özünün də müstəsna məhkəmə hüquqları vardı. Bəzi məhkəmə funksiyalarını mahal bəyləri və naiblər yerinə yetirirdilər.

Bütün mülki və cinayət işlərinə ya xan məhkəməsi, ya da şəriət məhkəməsi baxırdı. Cinayətkarlar "Quran"ın prinsipləri və ya hədislər əsasında mühakimə olunurdular. Xırda münaqişələrin çoxuna icma münsifləri baxırdı. Kənd ağsaqqallarından ibarət icma məhkəmələri yerli adətlər əsasında hərəkət edir, mübahisə edən tərəfləri barışdırmağa çalışırdılar. İcma məhkəməsinin qərarından razı qalmayan tərəf mahal hakiminə müraciət edə bilərdi. Mahal hakiminin qərarı qəti idi [50,82].

**İdarəçilik sistemi**

Azərbaycanın başqa xanlıqlarında olduğu kimi, İrəvan xanlığında da idarəçilik monarxiya sistemi əsasında həyata keçirilirdi. Xanlığın başında qeyri-məhdud hakimiyyətə malik ***xan*** dururdu. Bütün hakimiyyət-qanunverici, icraedici və məhkəmə hakimiyyəti xanın əlində cəmlənmişdi [bax: bölmənin sonu, şəkil 13].

Xan ölkənin bütün inzibati, hərbi və hüquqi idarəetmə sahələrini öz əlində saxlayırdı. Onun ölkənin taleyi ilə bağlı olan ən mühüm məsələlər barədə təkbaşına qərar çıxarmaq hüququ vardı. Xan ittiham edilən bütün şəxsləri mühakimə etmək, cərimələmək, fiziki cəza ver-

mək və hətta ölüm hökmü çıxarmaq hüququna da malik idi. Və bu hökm dərhal yerinə yetirilirdi.

İrəvan xanlığının idarəçilik sistemi, demək olar ki, digər Azərbaycan xanlıqlarındakı kimi idi. Belə ki, İrəvan xanının yanında da ***divan*** və ya ***xan şurası*** fəaliyyət göstərirdi. Divan və xan şurasının üzvləri mühüm dövlət vəzifələrində olan şəxslər idi. Hər iki orqan məşvərətçi rol oynayırdı. İrəvan xanlığının idarə olunmasında ***saray məmurları*** mühüm rol oynayırdı. ***Vəzir*** böyük səlahiyyətlərə malik idi. Xan sarayında vəzirdən başqa ***sərkərəli*** (maliyyə işlərinə baxan), ***eşikağası*** (xanın şəxsi təsərrüfatını idarə edən), ***sandıq ağası*** (xəzinədar), ***anbar ağası***, ***qalabəyi***, ***mühasib bəy*** və digər vəzifələr* də var idi. Hərbi işə isə xanın özü rəhbərlik edirdi [95, 451-452; 214, 38].

Maliyyə fəaliyyətinin əsasını pul sisteminin yaradılması, onun tənzimlənməsi, vergilərin toplanması təşkil edirdi. Bu sahədə naib, yasovul, kəndxudalar, xüsusi olaraq xan tərəfindən təyin olunan sərkərlər əsas rol oynayırdılar. Məhsulla alınan vergilərin yığılması ilə ***darğalar*** məşğul olurdu. Mühafizə xidməti xanın buyruqlarının vaxtında yerinə yetirilməsini təmin edir, ölkədə qayda-qanun yaradılmasında mühüm rol oynayırdı.

Xan hakimiyyətinin əsas dayağı ordu idi. Qoşunun əsas hissəsi qeyri-nizami olub ***maaflar*** və ***elatlardan*** təşkil olunurdu. Bununla yanaşı, digər Azərbaycan xanlıqları kimi, İrəvan xanlığının da daimi hərbi qüvvəsi vardı. Müharibələr zamanı qoşunun daimi hissəsi yerli silahlı qüvvələr hesabına artırılırdı.

İrəvan xanlığı qoşunlarının sayı barədə müxtəlif məlumatlar vardır. Mənbələrin məlumatlarında İrəvan xanlığının hərbi əməliyyatlar zamanı 2000 əsgər çıxara bilməsi qeyd olunur [69, 122, 127]. İrəvan

* Maraqlıdır ki, erməni müəllifi A.R.Qriqoryan İrəvan xanlığının idarəçilik sistemindəki bütün bu vəzifələrin adlarını erməni dilinə tərcümə etməmiş, Azərbaycan dilində olduğu kimi vermişdir.

xanlığının hərbi imkanları ilə daha yaxından məlumatı olan rus polkovniki S.Burnaşev isə yazır ki, xan döyüş meydanına 5000 nəfərdən ibarət qoşun çıxara bilərdi [214, 38-39].

XVIII əsrin ikinci yarısında İrəvan şəhəri Azərbaycanın ən iri şəhərlərindən və mədəniyyət mərkəzlərindən biri idi. Xan öz ailəsi və xidmətçiləri ilə birlikdə burada yaşayırdı. İrəvan şəhərini xan tərəfindən təyin olunan kələntər və qalabəyi idarə edirdi. Yasovullar, onbaşılar, fərraşlar onlara tabe idi.

Beləliklə, Azərbaycanın digər xanlıqlarında olduğu kimi, İrəvan xanlığında da idarə sistemi bütövlükdə xanın qeyri-məhdud hakimiyyətinin qorunmasına, onun iradəsinin sözsüz yerinə yetirilməsinə xidmət edirdi.

*Cədvəl 1*

Rusiya işğalından əvvəlki dövrdə İrəvan xanlığının mahalları

| № | Mahalların adı | Mahalların mərkəzi |
|---|---|---|
| 1 | Qırxbulaq | Kənəkir |
| 2 | Zəngibasar | Uluxanlı |
| 3 | Gərnibasar | Qəmərli |
| 4 | Vedibasar | Dəvəli |
| 5 | Şərur | Əngicə |
| 6 | Sürməli | İğdır |
| 7 | Dərakənd — Parçenis | Goğb (Qulp) |
| 8 | Səədli | Xeyribəyli |
| 9 | Talın | Talın |
| 10 | Seyidli-Axsaxli (Səidli) | Uşi (Üşü) |
| 11 | Sərdarabad | Sərdarabad |
| 12 | Qərbibasar (Körpübasar) | Əştərək |
| 13 | Abaran | Baş Abaran |
| 14 | Dərəçiçək | Dərəçiçək |
| 15 | Göyçə | Kəvər* |

***Mənbələr:***

Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её присоединения к Российской империи. СПб., 1852, с.441-446.

Bournoutian C.A. The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica, Costa Mesa, California and New York, 1992. p.35-38.

* Erməni müəllifləri "Kəvər" toponimini erməniləşdirərək "Avan" (mahal, dairə, nahiyə) və "Qavar" kimi təqdim edirlər. "Kəvər" toponimi Xəzərlərin "Kəbər" tayfasının adından götürülmüşdür [bax: 110,292]. 1829-cu ildə bura Türkiyənin Bayazid bölgəsindən köçürülən ermənilər yerləşdirildikdən sonra ermənicə Nor Bayazid (1850-ci ildən isə Novo Bayazid) adlandırılmışdır. 1959-cu ildə isə ermənilər tərəfindən tamamilə dəyişdirilərək Kamo adlandırılmışdır.

*Cədvəl 2*

Rusiya işğalından sonra İrəvan şəhərində qeydə alınmış məscidlər*

| № | məscidin adı | yerləşdiyi ərazi | əlavə məlumatlar |
|---|---|---|---|
| 1 | 2 | 3 | 4 |
| 1 | Məhəmməd xan məscidi | İçəri şəhər | |
| 2 | Abbas Mirzə məscidi | İçəri şəhər | |
| 3 | Zal xan məscidi | Bayır şəhər | Məscid XVII əsrdə İrəvan (Çuxursəd) bəylərbəyi olmuş Zal xanın (1679-1688) adı ilə bağlıdır. |
| 4 | Hacı Novruzəli bəy məscidi | Bayır şəhər | |
| 5 | Hacı Hüseynəli xan məscidi və ya Göy məscid | Bayır şəhər | Göy məscid adı ilə məşhur olması onun kərpicinin göy rəngli kaşı ilə üzlənməsi ilə bağlıdır. 1760-1768-ci illədə İrəvan xanı Hacı Hüseynəli xan Qacar (1759-1783) tərəfindən inşa edilən bu məscid həyətində fəvvarəli daş çarhovuzun və ətrafında sıx kölgəli ağacların olması ilə seçilirdi. |
| 6 | Hacı İmamverdi məscidi | Bayır şəhər | |
| 7 | Hacı Cəfər bəy və ya Hacı Nəsrulla bəy məscidi | Bayır şəhər, Dəmirbulaq məhəlləsində | |

*Dövrün mənbələrində İrəvan şəhərində məscidlərin daha çox olması və Rusiya işğalından sonra dağılması haqda məlumat vardır. Erməni mənşəli Amerika tədqiqatçısı C.Bornoutyan İrəvan şəhərində cəmi 4 dağıdılmış məscid olduğunu, İ.Şopen isə məscidlərin çoxunun dağıdıldığını qeyd edir.

| 1 | 2 | 3 | 4 |
|---|---|---|---|
| 8 | Sərtib xan məscidi | Bayır şəhər | |
| 9 | Şəhər məscidi | Bayır şəhər | |
| 10 | Təpəbaşı məscidi | Bayır şəhər | |
| 11 | Körpübulaq məscidi | Bayır şəhər | Körpübulaq məscidinin adı rusdilli mənbədə (Kerpi Kulaq) şəklində verilmişdir [bax: SMOMPK, vıp.I, xəritə]. |

***Mənbələr:***

1. ОРВЗ, ч.IV. СПб., 1836. с.290-291.

2. Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её присоединения к Российской империи. СПб., 1852, с.468, 687.

3. СМОМПК, вып.I, Тифлис, 1881, (kitabın arxasına əlavə olunmuş xəritə).

4. Lynch H.F.B., Armenia, Travels and Studies, 2 vol. 1901, s.280.

5. Bournoutian G.A. The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica, Costa Mesa, California and New York, 1992, p.205.

*Cədvəl 3*

Rusiya işğalından sonra İrəvan şəhərində qeydə alınmış hamamlar*

| № | hamamın adı | yerləşdiyi ərazi | əlavə məlumatlar |
|---|---|---|---|
| *1* | Şəhər (Marbl) hamamı | İçəri şəhərdə (qalada) | Bu hamam xüsusi günlərdə qadınlar üçün işləyirdi |
| *2* | Şeyxülislam hamamı | Şəhri (Əski şəhər) məhəlləsində | |
| *3* | Zalı xan hamamı | Şəhri (Əski şəhər) məhəlləsində | |
| *4* | Mehdi bəy hamamı | Şəhri (Əski şəhər) məhəlləsində | |
| *5* | Hacı Bəyim hamamı | Təpəbaşı məhəlləsində | |
| *6* | Şeyxülislam hamamı | Təpəbaşı məhəlləsində | |
| *7* | Hacıəli hamamı | Təpəbaşı məhəlləsində | |
| *8* | Hacı Fətəli (Cəfər və ya Qafar) hamamı | Təpəbaşı məhəlləsində | |
| *9* | Kərim bəy hamamı | Təpəbaşı məhəlləsində | |
| *10* | Həsənəli (və yaxud Cəfər bəy) hamamı | Dəmirbulaq məhəlləsində | |

***Mənbələr:***

1. ОРВЗ ч.IV. СПб., 1836, с.290-291.
2. Шопен И.И. Исторический памятник состояния армянской области в эпоху её присоединения к Российской империи. СПб., 1852, с.469.
3. Bournoutian C.A. The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica, Costa Mesa, California and New York, 1992, p.206.

* Bütün hamamlar məscidlərə və karvansaralara məxsus idi. 1836-cı il məlumatına görə, bu hamamlardan 9-u ictimai idi.



Şəkil 1.
Göy məscidin minarəsi. İrəvan şəhəri
***Mənbə:*** Lynch H.F.B., Armenia, Travels and Studies, vol. 2, 1901, p. 213



Şəkil 2.
 Göy məscid. İrəvan şəhəri
***Mənbə:*** Alişan G. Ayrarat (erməni dilində). Venesiya, 1980, s.318




Şəkil 3.
İrəvan qalasının planı
***Mənbə:*** Bournoutian C.A. The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica, Costa Mesa, California and New York, 1992, p. 41
*Rusiya işğalından sonra İrəvan qalasında ruslar tərəfindən tikilmiş provaslav kilsəsini [bax: 95, 686], C.Bornoutyan saxtalaşdıraraq "erməni kilsəsi" kimi təqdim edir



Şəkil 4.
İrəvan qalasının Zəngi çayından görünüşü
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.66



Şəkil 5.
İrəvan şəhərinin Dərəkənd məhəlləsinin ümumi görünüşü
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.75



Şəkil 6.
Fransız səyyahı Tavernyeyə görə İrəvan şəhərinin görünüşü. 1655-ci il
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.62



Şəkil 7.
Fransız səyyahı Şardənə görə İrəvan şəhərinin görünüşü. 1672-ci il
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.62



Şəkil 8.
İrəvan şəhərinin planı. 1837-ci il
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.76



Şəkil 9.
İrəvan şəhərində Azərbaycan türklərinə məxsus hamam. Giriş portalı
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с.71



Şəkil 10.
Azərbaycan türklərinə məxsus Talın karvansarası
***Mənbə:*** Кириллова Ю. Армения открытый музей. М., 1969 с.143



Şəkil 11.
İrəvan şəhərinin Zəngi çayından görünüşü
***Mənbə:*** Покоренный Кавказ (очерки исторического прошлого и современного положения Кавказа с иллюстрациями) Книга I-V, СПб., 1904




Xəritə 1. İrəvan xanlığının sxem-xəritəsi

***Mənbə:*** Григорян З.Т. Присоединение Восточной Армении к России в начале XIX в. Москва, 1959, с.143




Xəritə 2. İrəvan şəhərinin planı.
***Mənbə:*** СМОМПК, вып.I, Тифлис, 1881



ОРИВАНИ
ШТАБЪ
350
525 саж.
ЧОАМАКЧИ.
Р. Кирхъ-булагъ чай (Котаюкъ)
ДАМРЪ БУЛАГЪ
Названіе улицъ и переулковъ
1 Царская
2 Бебутовская
3 Тифлисская
4 Назаровская
5 Мечетская
6 Банная
7 Тархановская
8 Докторская
9 Церковная
10 Астафьевская
11 Сулейманъ ханск
12 Губернская
13 Почтовая
14 Кирхъ-Булахѣк
15 Чолмакчинская
16 Татарская
17 Училищная
18 Нахичеванская
19 Базарная
20 Кирпичная
21 Огородная
22 Полевая
23 Садовая
24 Шаріатская
25 Аптечная
26 Малярная
27 Караванъ-сарайская
28 Армянская
29 Султанская
30 Маруковская
ПЛОЩАДИ
А. Училищная
Б. Новая
В. Сѣнная
Г. Торговая
Д. Хлѣбная
Е. Чолмакчинская
Полиц. участк: Чолмакчинск., Тапабашинск., Шагарскій, Дамръ-булахск. и Дараклязскій
Церкви Армяно-Григоріанскія.
(Показаны на планѣ буквою А съ №.)
А №1 Соборъ Св. Сергія
А - 2 Св. Петра и Павла
А - 3 Катугике
А - 4 Зоравар̆ъ
А - 5 Св. Іоанна
А - 6 Св. Самсона
А - 7 Св. Богородицы (строится)
МЕЧЕТИ
(Показаны на планѣ буквою Б съ №.)
Б №1 Гусейнъ-Али-Ханъ
- - 2 Шагарская
- - 3 Тапабашинская
Б №4 Гаджи-Наврузъ-Али-бекъ
- - 5 Гаджи-Джафаръ-бекъ
- - 6 Керим-Кулагъ




Xəritə 3. İrəvan xanlığının inzibati xəritəsi. 1820-ci il

***Mənbə:*** Bournoutian C.A. The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica, Costa Mesa, California and New York, 1992, p. 34



Şəkil 13. İrəvan xanı ovda
Rəssam, general-mayor Qriqori Qaqarinin (1811-1893) çəkdiyi şəkil



Şəkil 14. İrəvan şəhərində Azərbaycan türklərinə məxsus karvansara
Rəssam, general-mayor Qriqori Qaqarinin (1811-1893) çəkdiyi şəkil




Xəritə 4. İrəvan xanlığı XVIII əsrin ikinci yarısında
***Mənbə:*** Azərbaycan tarixi atlası. Bakı, 2007, s.34



Şəkil 15. Zəngi çayı sahilindən İrəvan qalasının görünüşü
Uzaqdan Ağrı dağı görünür.
Dübua de Monperenin çəkdiyi şəkil (XIX əsr)

İrəvan xanlığının ərazisində, xüsusən də xanlığın mərkəzi İrəvan şəhərində kiçik fasilələrlə dağıdıcı müharibələr baş versə də, elm və mədəniyyət daim inkişaf etmişdir. İrəvan xanlığının ərazisində tarixin yaddaşına çevrilmiş yüzlərlə maddi-mədəniyyət, memarlıq və incəsənət abidələri — məscidlər, türbələr, epiqrafik abidələr, qoç heykəlləri, təsviri və dekorativ tətbiqi sənət nümunələri olmuşdur. İrəvandakı Əlyazmalar İnstitutunda — Matenadaranda saxlanılan yüzlərlə əlyazma İrəvan xanlığının mövcud olduğu dövrə aiddir.

İrəvan xanlığının ərazisindəki maddi-mədəniyyət və memarlıq abidələri, o dövrün mədəniyyəti və incəsənəti, habelə təhsil sistemi barədə fransız səyyahlarından Jan Tavernye və Jan Şardənin, Rusiyanın həmin ərazini işğalından sonra isə İ.Şopenin, ingilis səyyahı H.Linçin əsərlərində kifayət qədər məlumat verilmişdir. XIX əsrin əvvəllərinədək sırf türk — azərbaycanlı yurdu olan İrəvan xanlığının ərazisində maddi-mədəniyyət abidələrinin hamısı Rusiya imperiyası tərəfindən XIX əsrin əvvəllərindən etibarən İrəvan xanlığının ərazisinə kütləvi surətdə köçürülən ermənilər tərəfindən vəhşicəsinə dağıdılmış və yer üzündən silinmişdir [bax: bölmənin sonu, şəkil 35, 36, 37, 38, 39, 40]. Bununla belə, ilk mənbələr və ayrı-ayrı tədqiqat əsərləri İrəvan xanlığının ərazisində mövcud olmuş maddi-mədəniyyət abidələri, habelə incəsənət, maarif və ədəbi mühit haqqında kifayət qədər məlumat əldə etməyə imkan verir.

**Elm və təhsil.** İrəvan xanlığının ərazisində təhsil sistemi haqqında ən dolğun məlumat xanlığın Rusiya tərəfindən işğalından sonra həmin ərazidə kameral siyahıyaalma keçirən rus tarixçi-statistiki İ.Şopenin "Erməni vilayətinin Rusiyaya birləşdirilməsi dövrünün tarixi yaddaşı" əsərində verilmişdir. Həmin məlumatlardan aydın olur ki, İrəvan xanlığının ərazisindəki təhsil sistemi Azərbaycanın digər xanlıqlarındakı təhsil sisteminin analoqu olmuşdur [95, 901-911].

İ.Şopenin yazdığına görə, İrəvan xanlığının ərazisində təhsillə əsasən din xadimləri məşğul olurdu. Hər bir məscidin nəzdində böyük və yaxud kiçik mədrəsə fəaliyyət göstərirdi. Aşağı siniflərdə müəllimlər müdərris, yuxarı siniflərdə isə vaiz adlandırılırdılar. Mədrəsələrdə geniş dərs otaqları ilə yanaşı, tələbələrin yaşadıqları kiçik otaqlar — hücrələr olurdu. Bəzi məscidlərdə adlı-sanlı müctəhidlər dərs deyirdilər ki, onları dinləmək üçün ölkənin hər yerindən dinləyicilər gəlirdi. İrəvan xanlığının süqutu ərəfəsində təkcə İrəvan şəhərində 200 şagird təhsil alırdı [95,901-911].

İ.Şopenin məlumatına görə, müsəlman alimləri bütün elmləri üç əsas sahəyə bölürdülər: Əl-ərəbiət, Əl-şəruə və Əl-hakimə. Birinci sahəyə əsasən ərəb dilinin qaydaları, tarix və "Quran"ın oxunması daxil idi. İkinci sahəyə "Quran"ın təfsiri, hadisələrin öyrənilməsi, dini hüququn əsaslarının öyrənilməsi daxil idi. Üçüncü sahəyə isə məntiqin, riyaziyyatın, həndəsə və astronomiyanın, tibbin və nəzəri fəlsəfənin öyrənilməsi daxil idi. İrəvanda gənclərin əksəriyyəti Şərqin böyük şairləri Nizaminin, Rudəkinin, Firdovsinin, Caminin, Hafizin, Sədinin və digərlərinin şeirlərini əzbərdən söyləyərdilər. İrəvan şairlərindən biri öz şeirlərini elə avazla oxuyarmış ki, onu Mirzə Əndəlif (Mirzə Bülbül) deyə çağırırmışlar [95, 903]. İstər məktəblərdə, istərsə də mədrəsələrdə hüsn-xəttə xüsusi diqqət yetirilirdi.

İrəvan xanlığının ərazisində məktəb və mədrəsələrdən başqa fərdi tədris növü də mövcud idi. Xanın və yaxud sərdarın, əyanların və tacir uşaqlarının təhsili ilə onların evində ayrıca müəllimlər məşğul olurdu.

İ.Şopenin verdiyi məlumata görə, məktəblərdə tədris olunan fənlərə, xüsusən də "Quran"a və şəriətə aid kitabların nüsxələrinə hər bir müsəlmanın evində, özü də hərəsindən bir neçə nüsxə rast gəlmək olar. Onun yazdığına görə, ermənilər kitab sarıdan kasıbdırlar. Yal-

nız bəzi varlı ermənilərin evlərində "İncil"ə və yaxud hansısa kitaba nadir halda rast gəlmək olar [95,917]. Bütün bunlar ona dəlalət edir ki, İrəvan şəhəri xanlıqlar dövründə Azərbaycanın inkişaf etmiş elm və mədəniyyət mərkəzlərindən biri olmuşdur. Müsəlmanlardan fərqli olaraq, gəlmə ermənilərdə elm və təhsil inkişaf etməmişdi.

**Epiqrafik abidələr.** XVIII əsr epiqrafik abidələrinə memarlıq abidələri, məzar daşları, saxsı, metal, taxta və s. bərk materialdan düzəldilmiş məişət əşyaları üzərində rast gəlinir. Həmin kitabələr İrəvan xanlığı ərazisində mövcud olmuş müxtəlif formalı sənduqə, başdaşı, sinədaşı, at və qoç heykəlli məzar daşları, karvansara, hamam, mədrəsə, qala divarları və s. üzərində qoyulmuş lövhələrdə əks olunmuşdur. İlk mənbələrdən və epiqrafik abidələrdən məlum olur ki, İrəvan xanlığı ərazisində bir sıra tikinti işləri aparılmış, İrəvanda Sərdar (xan) sarayı, imarətlər, İrəvan və Sərdarabad qalaları tikilmişdir. Həmin qalalarda karvansaralar, məscidlər, hamamlar, bazarlar və s. inşa edilmişdir [bax: bölmənin sonu, şəkil 24,25].

İrəvan xanlığının ərazisində mövcud olmuş Azərbaycan-türk memarlıq abidələrindən bugünümüzə gəlib çatanı İrəvan yaxınlığındakı Cəfərabad (Ermənistan SSR Ali Sovetinin 04.04.1946-cı il tarixli fərmanı ilə Arqavand adlandırılmışdır) kəndindəki türbədir. Həmin türbənin üzərindəki kitabəni tədqiq edən görkəmli alim Məşədixanım Nemət bu barədə yazır ki, Cəfərabad türbəsi buraların keçmişindən söhbət açan yeganə tarixi abidə və sənət əsəridir [Nemətova M. Əsrlərin daş yaddaşı Bakı, Elm, 1987, s.40-41 [95,917]. Yerli tuf daşdan inşa edilmiş onikiüzlü, hündürlüyü 12 metr, içəridən diametri 5 metr olan məqbərə orta əsrlər Şərq memarlıq üslubu ilə bəzədilmişdir [bax: bölmənin sonu, şəkil 1,2]. Məqbərə Qaraqoyunlu əmiri Əmir Səədin oğlu, İrəvan çuxurunun hakimi Pir Hüseyn tərəfindən atasının qəbri üzərində 1414-cü ildə ucaldılmışdır. Məqbərənin günbəzinin altında 50 *sm* enində friz üzərində nəsx xətti ilə məq - bərənin kim tərəfindən inşa etdirildiyi qeyd edilmiş və "Quran"dan

ayələr həkk olunmuşdur. Erməni tarixçisi A.Papazyanın yazdığına görə, yerli sakinlər məlumat vermişlər ki, Əmir Səəd sülaləsinə məxsus məqbərədən başqa, həmin ərazidə nisbətən kiçik həcmdə günbəzvari daha iki məqbərə olmuşdur ki, sonradan ermənilər tərəfindən sökülən həmin məqbərələrin daşlarından yaxınlıqdakı tikililərdə istifadə edilmişdir [Папазян А. Арабская надпись на гробнице туркменских Эмиров в селе Аргаванд. Журнал «Ближний и средний Восток». Сб. статей памяти Б.И.Заходера, Москва, 1961, с. 68-75].

Epiqrafik abidələrə həmçinin məzar daşlarına həkk olunmuş yazılar — epitafiyalar da daxildir. Epitafiyalarda dəfn olunmuş şəxsin adı, ölüm tarixi və ictimai vəziyyəti haqqında məlumat verilirdi. Mərhumun başdaşında və sinədaşında adətən onun peşəsi və yaxud məşğuliyyəti ilə bağlı təsvirlər həkk olunurdu. Gözəl nəsx xətti, qabartma üsulu ilə həkk olunmuş kitabələrin əksəriyyəti nəbati ornament motivləri ilə əhatələnirdi. Bütün kitabələrdə islami naxışlar həkk olunurdu. Məsələn, Gümrü yaxınlığındakı bir azərbaycanlı-türk qəbiristanlığındakı başdaşlarının yuxarı hissəsi üçkünc və yaxud qövsvari düzəldilmişdir. Şəkildə göründüyü kimi, öndəki başdaşı üzərində iki dairəvi altıləçəkli ulduz həkk olunmuş, onların üstündə isə aypara çəkilmişdir. Dairələrin altındakı üfüqi çərçivədə Quran ayəsi həkk olunmuşdur. Həmin çərçivənin altında düzbucaqlı zolaq qabardılmışdır ki, həm qılınca bənzəyir, həm də "həyat ağacı" simvolunu ifadə edir. Həmin qəbiristanlıqda dairəvi günbəzli məqbərə də mövcud olmuşdur [Ахундов Д.А. Архитектура древного и раннесредневекового Азербайджана, Баку, 1986, s. 250-251; bax: bölmənin sonu, şəkil 4]. Lakin İrəvan xanlığının qədim ərazisində, eləcə də müasir Ermənistan Respublikasının ərazisində bütün qəbiristanlıqlar erməni vandalları tərəfindən dağıdılmış və yerlə yeksan edilmişdir. Müsəlman qəbiristanlıqlarının üzərində evlər tikilmiş və yaxud onlar əkin sahələrinə çevrilmişdir.

**Memarlıq və incəsənət.** Bir sıra yazılı qaynaqlar İrəvan xanlığının ərazisində, xüsusən də İrəvan şəhərində yüzlərlə memarlıq abidəsinin mövcudluğunu və xalq - dekorativ sənətinin geniş rəvac tapdığını təsdiq edir. Xanlıqlar dövrünün əsas cəhətlərindən biri iqamətgahların və onun müvafiq istehkamı kimi saray komplekslərinin yaradılması zərurəti olmuşdur. Şəhər ətrafında və xanlıq ərazisində müdafiə sistemlərinin inşası da mühüm idi. İbadət yerlərinin inşasında məscidlərin tikilməsi əsas yer tuturdu [107,481] İrəvan şəhərində şəxsi yaşayış evlərinin xüsusi memarlıq üsulu ilə tikilməsinə xüsusi önəm verilirdi [bax: bölmənin sonu, şəkil 27, 28].

İrəvan xanlığının ərazisində müdafiə məqsədilə tikilmiş, lakin memarlıq kompleksi kimi tarixə daxil olan İrəvan və Sərdarabad qalalarından bu gün əsər-əlamət qalmamışdır. Şah İsmayılın göstərişi ilə 1510-1517-ci illərdə tikilən İrəvan qalası aramsız müharibələr nəticəsində dəfələrlə dağıdılsa da, sərdarlar və xanlar tərəfindən yenidən bərpa olunmuşdur. XIX əsrin əvvəllərində İrəvan qalasının ruslar tərəfindən işğalından sonra, tərtib edilən plana görə, qala təxminən kvadrat formasında (790 x 850 m) olmuş, 7 hektar sahəni əhatə etmişdir. İkicərgəli qala divarlarının uzunluğu 4,5 km olmuşdur. Xarici divarının hündürlüyü 10,5-12 m olan qala divarları ərazini şimal-şərq, cənub-şərq və cənub-qərb tərəfdən əhatə edirmiş. Ərazinin digər tərəfi isə sıldırımlı Zəngi çayına söykənirmiş. Qala divarlarının bir-biri ilə məsafəsi 36-42 m təşkil etmişdir.

Həm xarici, həm də daxili müdafiə divarları kifayət qədər qalın olan qala divarlarında yarımdairəvi *qüllələr* tikilmişdir. Qüllələrdə atəş üçün təqribən 2450 mazğal olmuşdur. Müdafiə divarları boyunca 53 top yerləşdirilirmiş İrəvan qalasının Təbriz və Şirvan darvazaları olmuşdur. Qala divarlarının xarici konturu boyunca torpaq səngər qazılmışdır və həmin çuxur Gedər çayının suyu ilə doldurulurmuş [bax: bölmənin sonu, şəkil 5,6].

1672-1673-cü illərdə İrəvanda olmuş Jan Şardən qeyd etmişdir ki, ancaq təmizqanlı səfəvilərin yaşadığı İrəvan qalasında daha 2 məscid və hamam olmuşdur [10,21-22]. Dövrünün möhtəşəm tikilisi olan İrəvan qalası və qalanın içərisindəki memarlıq abidələri hazırda yer üzündən silinmişdir. Şardən İrəvan qalasından bir top qülləsi məsafədə qədim bir türbə olduğunu, lakin onun nə vaxt tikildiyini öyrənə bilmədiyini qeyd etmişdir [10,21-22]. Erməni tədqiqatçıları həmin türbənin Atabəylərin Naxçıvandakı memarlıq abidəsinə bənzədiyini qeyd edirlər. Türbənin Şardən tərəfindən çəkilmiş rəsmində abidənin arxasında minarələri göylərə ucalan iki əzəmətli məscid təsvir olunmuşdur. Təsvir olunan memarlıq abidəsi də XIX əsrin əvvəllərində yer üzündən silinmişdir [bax: bölmənin sonu, şəkil 3].

İrəvan xanlığının ərazisində mövcud olan memarlıq tikililərindən biri də ***Sərdarabad qalası*** idi. 1815-1817-ci illərdə İrəvan xanı Hüseynqulu xan tərəfindən inşa etdirilən bu möhtəşəm qala kvadrat şəklində idi. Fransız mühəndislərinin iştirakı ilə tikilən Sərdarabad qalasının ikiqat divarı, möhkəm qüllələri və darvazası var idi. Rus rəssamı Qriqori Qaqarin 1840-cı ildə yağlı boya ilə çəkdiyi şəkildə Sərdarabad qalasının önündə döyüş mənzərəsini əks etdirmişdir [bax: bölmə 8, şəkil 4].

Bu möhtəşəm qalanı da erməni vandalları yer üzündən silmişlər.

Avropa səyyahları Kerr-Porter, Ceyms Morier, Monpere, Kameron, Linç və başqaları müxtəlif vaxtlarda İrəvanda olmuş, Xan sarayını, onun Güzgülü salonunu, qaladakı və şəhərdəki məscidləri, hovuz və hamamları, Zəngi çayından enib keçən yeraltı mərmər pilləkənli yolu öz əsərlərində təsvir etmişlər.

Mülki memarlıq nümunələrindən ən diqqətçəkəni ***Sərdar sarayı,*** yaxud ***Xan sarayı*** olmuşdur. Şardən Sərdar sarayının qalada, Zəngi

çayının sahilindəki uçurumun kənarında tikildiyini və yay aylarında çox xoş təəssürat bağışladığını yazır. Yeni Xan sarayı Hüseynəli xanın hakimiyyəti dövründə (1764-1783) görkəmli Azərbaycan memarı Mirzə Cəfər Xoylu tərəfindən inşa edilmişdir. Sarayın əsas hissəsi olan ***Güzgülü salon*** və ***Yay köşkü*** 1791-ci ildə Hüseynəli xanın oğlu Məhəmməd xan tərəfindən əlavə etdirilmiş və beləliklə, bina memarlıq baxımından monumental saray binası kimi təkmilləşmiş və tamamlanmışdır [Kərimov Kərim. "İrəvan sərdarının sarayı", "Yeni fikir" qəzeti, 18 oktyabr 1995-ci il, № 5].

1837-ci ildə Sərdar sarayının tərtib edilmiş mükəmməl planına əsasən, sarayın 1 hektar ərazini tutduğu aydın olur. Saray qala kompleksinin şimal-qərb hissəsində yerləşirmiş və qaladan saraya qapı açılırmış. Bir-birinə bitişik olan və uzun fasada malik saray və hərəmxana vahid memarlıq kompozisiyası təşkil edirmiş. Hərəmxana sarayla kiçik dəhlizlə birləşirdi [bax: bölmənin sonu, şəkil 7, 8, 9, 10, 11].

Saray kompleksinin özü bir neçə saraydan ibarət olmuşdur. Rəsmi tədbirlər üçün nəzərdə tutulmuş ən böyük ikimərtəbəli saray trapesiya (ölçüləri 36 x 35 x 31 x 25 m) formasında olmuşdur. Sarayın ortasında şahın təntənəli qarşılanması üçün böyük eyvan olmuşdur. Eyvanın qurtaracağında Zəngi çayına açılan və rəngli şüşələrlə bəzədilmiş, şəbəkələrlə ayrılan yataq yerləri — taxçalar düzəldilmişdi. Hazırda İrəvandakı tarix muzeyində saxlanılan taxçanın döşəməsində müalicəvi xüsusiyyətli damarlı əqiq daşlarından (oniks) ulduzvari hovuz düzəldilibmiş. Bundan əlavə, həmin saraya bitişik daha iki saray — biri yaşayış hissəsi, digəri yardımçı bina olmuşdur.

İkimərtəbəli düzbucaqlı formada tikilən hərəmxana cənub-qərb tərəfdən saraya bitişik olmuşdur və tikilinin ortasında çimmək üçün böyük hovuz düzəldilibmiş.

Saray kompleksinə həmçinin məscid və hamam da daxil idi. Mozaika və mərmər plitələrlə bəzədilmiş hamamın içində böyük hovuz olmuşdur. Şərq memarlığının bu möhtəşəm incisi XX əsrin əvvəllərində erməni vandalları tərəfindən yer üzündən silinmişdir.

1880-ci ildə İrəvana gələn rus arxeoloqu Praskovya Uvarova yazırdı: "Möhtəşəm qaladan qalan yalnız sərdarın Şərq üslubunda tikilmiş güzgüsü, bəzəyi, zövqü, səriştəsi ilə insanı valeh edən salondur. Bu salon bəzəkli-düzəkli çay qutusuna bənzəyir. İlahi, sini — xonça kimi bəzəkli imarətləri necə yerlə yeksan ediblər! Əsrlər boyu ucaldılmış abidələri yer üzündən silmək, yox etmək üçün gör nə qədər səy sərf etməli olmuşlar?!" [121, 571].

Həmin dövrdə təsviri incəsənətin ən geniş yayılmış və inkişaf etmiş sahəsi memarlıq abidələrində öz əksini tapmış divarüstü boyakarlıq olmuşdur. Avropa səyyahlarını və rəssamlarını valeh edən, tərif dolu təəssüratlarını yazmağa vadar edən də sərdar sarayının memarlığından daha çox onun zəngin bədii tərtibatı, divarları bəzəyən portret və süjetli kompozisiyalardan ibarət monumental boyakarlıq əsərləri olmuşdur.

İrəvan Xan sarayının daxili tərtibatı haqqındakı yazılar, 1828-ci ildə rus rəssamı akademik V.Maşkovun, 1840-cı illərdə arxeoloq alim və rəssam Q.Qaqarinin, XIX əsrin 60-cı illərində fotoqraf D.Yermakovun, əsrin sonunda ingilis səyyahı H.Linçin bilavasitə naturadan çəkdikləri rəsm əsərləri və fotolar sarayın bədii tərtibatı, divar rəsmlərinin məzmunu, forma və üslubu, professional sənətkarlıq və estetik xüsusiyyətləri haqqında fikir söyləməyə imkan verir.

Sarayın *Güzgülü salonu* və Yay köşkünün divarlarını bəzəyən ilkin rəsmlərin müəllifi bəlli deyil. Dekorativ və süjetli divar rəsmləri həmin dövrdə mövcud olmuş kanonlara və ənənəyə əsaslanır. Bir qayda olaraq, divarların paneldən yuxarı səthində tağlarda və tağlar - arası pannolarda həndəsi və stilizə edilmiş nəbati motivlərdən ibarət

dekorativ kompozisiyalar, gül və çiçəklərin, heyvan və quşların canlı, real təsvirləri verilmişdir [Bax: Kərim Kərimov. Göstərilən məqalə].

Sarayın bədii tərtibatının əsasını portret təsvirləri və çoxfiqurlu süjetli kompozisiyalar təşkil edirdi [Bax: Kərim Kərimov. Göstərilən məqalə].

H.Linc İrəvan xan sarayının *Güzgülü salonunu* belə təsvir edir: "Şəbəkəli tağların saysız-hesabsız güzgüləri ətrafa büllur kimi şölə saçır. Salonun tavanı başdan-başa bəzəyə qərq olmuşdur. Tavanın aşağısı bolluca nəbati naxışlarla bəzənib ki, bunlar da əsasən süsən və qızılgüllərdən ibarətdir" [101,216].

*Güzgülü salonu* dərin çatma tağlı formada olan ön divarında ornamental pannolarla tavan arasında qalan zolaqda oxşar və eynibiçimli çərçivə daxilində Fətəli şahın, onun oğlu Abbas Mirzənin, İrəvan xanı Hüseynqulu xanın və qardaşı Həsən xanın, qəhrəman Fərəməzin, Rüstəm Zalın, onun oğlu Zöhrabın, habelə bir qadının portretləri təsvir olunmuşdur [101, 217; 215,181].

1827-1828-ci illərdə rus ordusunun İrəvana hücumunda iştirak edən V.Maşkovun çəkdiyi rəsmdə Fətəli şahla Abbas Mirzənin portretləri arasında izdihamlı ov səhnəsi təsvir olunmuşdur [Bax: Kərim Kərimov. Göstərilən məqalə].

XIX əsrin 50-ci illərində baxımsızlıq üzündən yararsız hala düşən, nəmişlikdən divar rəsmləri korlanan, karniz və tavanın güzgüləri qopub tökülən Xan sarayında qismən də olsa bərpa işləri aparılmışdır. Bərpa işlərini Azərbaycan dəzgah boyakarlığının banisi Mirzə Qədim İrəvani (1825-1875) həyata keçirmişdir. Xüsusi rəssamlıq təhsili almayan M.Q.İrəvani bu sənəti bədii oyma ustası olan atasından öyrənmişdi. Yaradıcılığının ilk dövrlərində dekorativ sənətlə məşğul olmuş, bir sıra portretlər — "Süvari", "Rəqqasə", "Dərviş" (Azərbay-

can İncəsənət Muzeyi) və s. yaratmışdır. İrəvan sərdarının sarayındakı pannoları və süjetli kompozisiyaları bərpa etmiş, sarayın *Güzgülü salonunda* yağlı boya ilə bir neçə monumental portret (Fətəli şah, Abbas Mirzə və s.) çəkmişdir. Onun 1860-70-ci illərdə yaratdığı "Vəcihulla Mirzə", "Molla", "Ayaq üstə dayanmış qadın", "Oturmuş qadın", "Gənc oğlan" rəsmləri Azərbaycan İncəsənət Muzeyində, "Mah Tələt" Gürcüstan Dövlət İncəsənət Muzeyində, "Çiçəklər və quşlar" Sankt-Peterburqda Ermitajda saxlanılır [ASE VI, Bakı, 1980, s. 517-518; bax: bölmənin sonu, şəkil 12, 13].

Sarayın bərpadan əvvəlki və sonrakı tərtibatına aid əyani materialın müqayisəli təhlili göstərir ki, divar rəsmlərinin ancaq bir hissəsi — portretlər və dekorativ pannolar bərpa edilmişdi. Ov, döyüş və məhəbbət səhnələrini bərpa etmək mümkün olmadığından, onların yerində yeni ornamental-dekorativ pannolar çəkilmişdi. Portretləri bərpa edərkən M.Q.İrəvani işə mexaniki yanaşmamış, yeni texniki vasitələrlə, əvvəlkilərdən fərqlənən yeni əsərlər yaratmışdır. Böyük ölçülü kətan üzərində yağlı boyalarla işlənilib sonradan divara yapışdırılmış bu əsərlər, əslində, realist monumental boyakarlığın ilkin nümunələri idi. Məhz buna görədir ki, bu əsərlər yüksək qiymətləndirilir və "Asiya boyakarlığının ən yüksək nümunəsi" hesab edilir [Bax: Kərim Kərimov. Göstərilən məqalə].

Özlərini dünyanın “mədəni xalqı” kimi qələmə verməyə çalışan ermənilər Şərqin nadir sənət incisi olan *Sərdar sarayını* da 1918-ci ildə yerlə - yeksan etmişlər.

İrəvan xanlığının ərazisində mövcud olmuş məscidlərin hər biri nadir memarlıq nümunəsi idi. Tədqiqatlar göstərir ki, islami dəyərlərin həyat normasına çevrildiyi İrəvan şəhərində Şah İsmayılın əmri ilə 1510-cu ildə möhtəşəm məscid ucaldılmışdır. Məscidin geniş həyəti, çarhovuzu, hündür minarəsi olmuşdur. Şah İsmayıl məscidi kimi tanınan bu məscidin içərisinə ermənilər 1918-ci ildə azərbaycanlıları doldurmuş, üstlərinə neft tökərək yandırmışlar [113,449].

İrəvanda müsəlman abidələrini tədqiq edən Azərbaycan arxeoloqu İsa Əzimbəyov 1929-cu ildə dərc etdirdiyi məqaləsində qeyd edir ki, o, Sərdar sarayının yaxınlığında Şah Abbasın fərmanı ilə tikilən məscidi görmüşdür. Yarıuçuq vəziyyətdə olan məscidin həyətindəki mədrəsədə bir neçə qaçqın ailəsi yaşayırdı. O, məscidin üzərindəki aşağıdakı misranı çətinliklə oxuduğunu yazır:

***"Zəmane Şah Abbas cənnətməkan,***

***Əz u kəşt abad mulke-cahan"*** [Известия Азкомистариса, выпуск 4, 1929, səh. 299].

M.Əzimbəyov həmin ərazidə Şah Abbas məscidindən daha qədim bir məscidin olduğunu da yazır. Şah Xudabəndə tərəfindən inşa etdirilən həmin məscid onun adı ilə adlandırılmışdır. Bişmiş qırmızı kərpicdən tikilən həmin məscidin üzərindəki kitabədə onun 1685-ci ildə Şah Süleyman Səfəvi dövründə təmir edildiyi göstərilmişdir [Известия Азкомистариса, выпуск 4, 1929, səh. 299].

Rusiya imperiyasının İrəvan xanlığını işğal etməsi ərəfəsində təkcə İrəvan şəhərində 8 məscid mövcud olmuşdur. Şopenin verdiyi məlumata görə, həmin məscidlərdən 2-si qalanın içərisində, 6-sı — Zal xan, Novruzəli xan, Sərtip xan, Hüseynəli xan, Hacı İnamverdi, Hacı Cəfər bəy məscidləri isə qaladan bayırda yerləşirdi [95,468]. Məscidlərin içərisində ən möhtəşəmi və Azərbaycan memarlığının nadir incisi olan Hüseynəli xan məscidi, yaxud Göy məscid idi. Divarları göy rəngli kaşı ilə üzləndiyi üçün bu məscid Göy məscid adlanırdı. İrəvandakı mərkəzi örtülü bazarla üzbəüz yerləşən həmin məscid 1760-1768-ci illərdə Hüseynəli xanın hakimiyyəti dövründə inşa edilmişdir. Göy məscid öz kompozisiyası və əsas ibadətxanasının formasına görə 1616-cı ildə Şah Abbas dövründə Gəncədə inşa edilən Cümə məscidinə bənzəyirdi. Onun ölçüləri 97,2x66 m idi. Məscidin həyətində fəvvarəli daş hovuz tikilmiş, ətrafına sıx kölgəli ağaclar əkilmişdi. Həmin məscidi ermənilər 1988-ci ildə yandırmışlar. Son vaxt-

lar onun yerində miqyasca on dəfə kiçik bir məscid inşa etmiş, adını da "Fars məscidi" qoymuşlar.

Qədim İrəvandakı Zal xan, yaxud şəhər məscidi (inşa edildiyi tarix məlum deyil) və Novruzəli xan məscidi bir-birinə bənzəyirdi və Göy məsciddən kiçik idi. Digər üç məscid isə XVII-XVIII əsrlərdə inşa edilmişdi [bax: bölmənin sonu, şəkil 13,14,15,16,17, 18, 19, 20, 21].

Rəcəb paşa məscidi 1725-ci ildə, Abbas Mirzə məscidi isə Hüseynqulu xanın dövründə — XIX əsrin əvvəllərində inşa edilmişdi. İkimərtəbəli binası və çoxlu hücrələri olan Zal xan məscidi indiki İrəvan mehmanxanasının yaxınlığında yerləşirdi. İkinci dünya müharibəsindən sonra məscidin təyinatı dəyişdirilmişdir. Hazırda həmin binada Rəssamlar evinin sərgi salonu yerləşir.

XX əsrin birinci yarısınadək İrəvanda bir neçə məscid fəaliyyət göstərmişdir. Abbasqulu xanın tikdirdiyi Təpəbaşı məscidi, İrəvan qadınlar klubunun yaxınlığında yerləşən Əsəd ağanın tikdirdiyi məscid, Körpübulaq məscidi ermənilər tərəfindən dağıdılaraq yer üzündən silinmişdir. Hacı Müzəffər ağanın tikdirdiyi Çətirli məscid isə 1988-ci ildə yandırılaraq məhv edilmişdir [113, 452; bax: bölmənin sonu, şəkil 23].

Əvvəllər yəhudi sinaqoqu olmuş, XIX əsrin sonlarında ermənilər tərəfindən pulla alınmış və "erməni kilsəsi"nə çevrilmiş memarlıq abidəsi bu gün də Bakının mərkəzində qorunub saxlanıldığı halda, XX əsrin əvvəllərində İrəvanda mövcud olmuş 8 Azərbaycan məscidinin hamısı erməni vandalları tərəfindən yerlə - yeksan edilmişdir.

İrəvan şəhərində hər biri nadir memarlıq abidəsi olan 8 hamam mövcud olmuşdur. Erməni müəlliflərin yazdıqlarına görə, bu hamamların hamısının salonları Şərq üslubunda tikilmiş, hər birinin günbəzi olmuş və yuxarıdan işıqlandırılmışdır. Bişmiş kərpiclə və əhəng məhsulu ilə hörülmüş hamamların hamısı hazırda dağıdılmış-

dır. İ.Şopen isə hamamların adlarını belə vermişdir: 1. Şəhər (Şəhri) hamamı; 2. Şeyxülislam hamamı; 3. Mehdi bəy hamamı; 4. Hacı Bəyim hamamı; 5. Təpəbaşı hamamı; 6. Hacı Əli hamamı; 7. Hacı Fətəli hamamı; 8. Kərim bəy hamamı [95, 469].

İrəvan xanlığı dövründən bugünədək külli miqdarda dekorativ-tətbiqi incəsənət nümunələri, o cümlədən daş və ağac üzərində bədii oyma, döymə metal məmulatı, xalçalar, saxsı qablar və naxıştikmələr qorunub saxlanılmışdır. Təəssüf ki, bu cür sənət nümunələrinin böyük əksəriyyəti hazırda Ermənistan Respublikasının ərazisində mövcud olan muzeylərdə və digər saxlanan yerlərdə "ermənilərə məxsus" sənət nümunələri kimi nümayiş etdirilir.

İrəvan xanlığında dekorativ incəsənət növləri arasında xalçaçılıq xüsusi yer tuturdu. Qarabağ və Təbriz xalçaçılıq məktəbinə daha yaxın olan İrəvan xalçaçılıq məktəbinin nümunələri zaman-zaman xarici ölkələrə daşınmış, erməni kolleksionerlərinin malına çevrilmişdir. Bu gün "Yerevan xalçası", yaxud "erməni xalçası" adı altında dünya bazarlarına çıxarılan xalçaları azərbaycanlı ilmə ustaları toxumuşlar. Xalça, kilim, palaz, şəddə və s. toxumaq tarixən qoyunçuluqla məşğul olmayan ermənilərin milli mentalitetinə yad xüsusiyyətdir [bax: bölmənin sonu, şəkil 29, 30].

Bu gün İrəvandakı qədim əlyazmalar institutunda — Matenadaranda İrəvan xanlığı dövrünə aid yüzlərlə əlyazma, basma naxışlı kitablar saxlanılır. İrəvanın özündə boyakarlıqla məşğul olan məhəllə olmuşdur. Həmin məhəllə Şiləçi məhəlləsi adlanırdı. Boyaq bitkilərindən alınan al-əlvan rənglərlə basma naxışlı parçalar istehsal edilirdi [bax: bölmənin sonu, şəkil 31, 32, 33].

Xalq yaradıcılığının geniş yayılmış növlərindən biri də bədii tikmədir. İrəvan xanlığı dövrünün bədii tikmə nümunələrindən 2-si hazırda Milli Azərbaycan Tarixi Muzeyində saxlanılır. 1827-ci il oktyabrın 1-də İrəvan qalası rus qoşunları tərəfindən işğal edildiyi zaman İrəvan xanlığının 4 bayrağı rus qoşunlarının əlinə keçmişdi

[177,361]. Sonralar bu bayraqlar Qafqaz Hərb Tarixi Muzeyində saxlanılırdı. Bu bayraqlardan 2-si 1924-cü ildə indiki Milli Azərbaycan Tarixi Muzeyinə verilmişdir. 461 və 473 №-li inventarlar adı altında saxlanılan bayraqlar bədii tikmə sənətinin nadir nümunələri hesab olunur. Burada yalnız bayraqlardan birinin təsvirini verəcəyik. İrəvan sərdarına məxsus üçkünc bayrağın qumaş hissəsinin ölçüləri 145x261 x 217 sm-dir. Tünd qırmızı mahud parçadan hazırlanmışdır. Bayrağın yuxarı enli hissəsində şir və günəş (şiri-xurşid) təsvirləri qurama üsulu ilə tikilmişdir. Sarıya çalan, açıq qəhvəyi rəngli quramadan hazırlanmış şir yandan təsvir olunmuş, quyruğu belinə qatlanmış, sağ qabaq pəncəsi qaldırılmışdır. Şirin gözləri qara və sarı, dişləri, dili və caynaqları sarı sapla tikilmişdir. Şirin arxasından yarımdairə formasında çıxan insan sifətli günəş sarı mahud parçadan hazırlanıb. Günəşin burnu və qaşları qara, gözləri isə qara və sarı saplardan tikilmişdir. Mavi parçadan olan günəşin şüaları açıq qəhvəyi ipək saplarla bayrağın qumaşına tikilmişdir. Şir və günəşin təsvirindən yuxarıda, ona paralel olaraq, bir birinin yanında, açıq qəhvəyi mahud parçadan iki altıguşəli kartuş quranmışdır. Şirin quyruğu yanındakı kartuşda ərəb dilində "Mən qanuna (şəriətə) uyğun hərəkət edirəm", digərində isə "Kömək Allahdandır, yaxın qələbə" sözləri təkəlduz tikməsi ilə qara ipək saplarla tikilmişdir. Bayrağa müxtəlif rəngli (qəhvəyi, açıq qəhvəyi və qızılı) ipək saplardan saçaq salınmışdır. Bayraq qumaşını bayrağın sapına taxmaq üçün tikilmiş torbacıq yaşıl mahud parçadandır. Bayraq sapının yuxarı hissəsinə gümüşü saplardan toxunmuş uzun qotaz asılmışdır. Həmin bayraq 1825-26-cı illərdə (hicri 1241) hazırlanmışdır.

Mirzə Qədim İrəvaninin çəkdiyi portretlərdə də bədii tikmənin ən zəngin nümunələri öz əksini tapmışdır.

**Ziyarətgahlar, qəbirüstü abidələr və müqəddəs ocaqlar.** İrəvan xanlığının ərazisində xalq tərəfindən ziyarətgaha çevrilmiş çoxlu sufi, alim, şeyx, mövlana məzarları, pirlər və müqəddəs ocaqlar mövcud

olmuşdur. Şopenin yazdığına görə, İrəvanda tatarlar (yəni azərbaycanlılar — ***red.***) öz ölülərini yaşadıqları evlərin yaxınlığında, şəhərin mərkəzindəki qəbiristanlıqda (həmin qəbiristanların hamısını ermənilər məhv etmişlər — ***red.***), bəzi hallarda öz bağlarında, həyətlərində, hətta evin astanasında dəfn edirlər. Hər il zəvvarlar Məkkəyə və Kərbəlaya gedərkən həmin məzarlardan sümükləri yığışdırıb aparır və müqəddəslərin uyuduqları qəbiristanlıqlarda dəfn edirmişlər [95,716-717]. Bu, irəvanlıların müqəddəs yerlərə həddindən artıq bağlı olmalarından irəli gəlirdi.

İrəvan xanlığının ərazisində 2 dağ Ziyarət dağı adlanırdı. Onlardan biri Göycə gölü hövzəsində, digəri isə İrəvan yaxınlığında idi [170,98]. İlin bütün fəsillərində əhali həmin dağlara ziyarətə gələr, nəzir-niyaz verər, qurban kəsərdi. İrəvan şəhərinin özündə içərisində qara daş olan pir vardı. Həmin pir *Həzrət Abbas ocağı* adlanırdı. Ermənilər dəfələrlə bu müqəddəs ocağı söküb yerində nəsə tikmək istəmişdilərsə də, hər dəfə qəza baş vermiş, sökmək işini başa çatdıra bilməmişdilər. Son vaxtlar çəpərə alınmış Həzrət Abbas ocağını təkcə azərbaycanlılar deyil, ermənilər də ziyarətə gələr, şam yandırardılar.

İrəvan xanlığının ərazisindəki müqəddəs ocaqlardan biri də Dərələyəzin Ələyəz kəndindəki *Əxi Təvəkkül* məqbərəsidir. Onun qəbrini həm azərbaycanlılar, həm də ermənilər ziyarət edirdilər. 1543-cü ildə tikilmiş bu məqbərənin və onun ətrafındakı tikililərin yalnız özülləri qalmışdır [Немат М. Эпиграфические памятники Азербайджана, III cild, Bakı, 2001, s. 75; bax: bölmənin sonu, şəkil: 26].

İrəvan xanlığının ərazisində mövcud olmuş ocaqlardan biri də Miskin Abdal ocağıdır. Göycə aşıq məktəbinin banisi olan Miskin Abdal qızılbaşların rumlu soy birləşməsinə daxil olan Miskinli tayfasının ən nüfuzlu başçılarından olmuşdur. Rumlular şiəlik dini-fəlsəfi ideologiyasının yayılmasında səfəvilərin ən yaxın köməkçiləri olmuş-

lar. Miskin Abdalla Şah İsmayıl arasında yaxın dostluq münasibətləri olmuşdur. 1470-ci ildə Göycə mahalının Sarıyaqub (bu kəndin qədim adı Siyaqut olmuşdur) kəndində anadan olan Miskin Abdalı 500 ildən artıq xalqın qan yaddaşında yaşadan təkcə onun aşıq-şairliyi deyil, həm də övliya, müqəddəs insan, Allah-Taaladan verilən haqq vergisi olmuşdur. Hər zaman qonaq-qarası, ziyarətçisi əskik olmayan, binəsiblərin ümid yeri, şəfasızların şəfa yeri olan bu ocaq 1988-ci ilə kimi Sarıyaqub kəndində yerləşirdi. Hazırda Miskin Abdal ocağı Goranboy rayonunun Qaradağlı kəndinə köçürülmüşdur.

Şah Sultan Hüseyn (1694-1722) Miskin Abdal ocağına gəlmiş, onu ziyarət etmiş və "Fatihə" oxumuşdur. Şah Sultan Hüseynin fərmanı və Şah İsmayılın verdiyi tiyul sənədi, habelə Miskin Abdal nəslinin şəcərəsinin möhürlə təsdiq edilmiş orijinalı hazırda Miskin Abdal ocağında saxlanılır [bax: bölmənin sonu, şəkil 34].

**Ədəbi mühit.** İrəvan xanlığının ərazisində olduqca zəngin ədəbi mühit olmuşdur. Dövrümüzə gəlib çatan yazılı nümunələr kifayət qədər olmasa da, qonşu dövlətlərin arxivlərində və kitabxanalarında saxlanılan əsərlər bunu sübut edir. Rusların işğalından sonra İrəvan ədəbi mühitini özündə əks etdirən qiymətli əlyazmaların əksəriyyəti erməni vandalları tərəfindən məhv edilmişdir. Əsasən məscidlərdə və mədrəsələrdə saxlanılan əlyazmalar yandırılmış, bir qismi isə indiyədək Azərbaycan tədqiqatçılarının üzünə bağlı şəraitdə saxlanılır.

Xanlıqlar dövrünün bir sıra əlyazmaları XX əsrin 30-40-cı illərinədək (repressiyalaradək) İrəvandakı Göy məscidin kitabxanasında saxlanılırdı. Azərbaycan tədqiqatçısı İsa Əzimbəyov 1929-cu ildə dərc etdirdiyi "Tiflis, İrəvan və Naxçıvan SSR-in müsəlman kitabələri" məqaləsində yazır ki, o, İrəvandakı Göy məsciddə olarkən Hacı Mirzə Hüseynlə (1868-1938) tanış olmuşdur. Mirzə Hüseyn ağa onu olduqca zəngin kitabxana ilə tanış etmişdir. İ.Əzimbəyov həmin kitabların bir qisminin adlarını öz məqaləsində vermişdir.

İrəvanda həkim ailəsində doğulan və istedadlı şərqşünas alim kimi tanınan Mirzə Hüseyn ağa Bağdadda və Nəcəfdə mükəmməl təhsil almışdı. Məqalələri Türkiyədə və İranda dərc olunmuşdu. 1938-ci ildə bir çox azərbaycanlı ziyalılar kimi, Mirzə Hüseyn ağa da repressiyaya məruz qoyularaq Kaluqa şəhərinə sürgün edilir və bir qədər sonra sürgündə vəfat edir. Onun zəngin kitabxanası və əlyazmaları ermənilər tərəfindən qarət edilib yandırılmışdır [121,67,73].

Şərq poeziyasının görkəmli nümayəndələrinin əsərləri irəvanlı şairlər tərəfindən tərcümə edilir və ədəbi məclislərdə qiraət ustaları tərəfindən oxunurdu. İrəvanlı tərcümanlar haqqında ilk məlumat Məhəmməd Hüseyn İrəvaniyə aiddir. O, 1657-ci ildə Sədi Şirazinin "Gülüstan" əsərini Azərbaycan dilinə tərcümə etmişdir. Həmin tərcümə hazırda Təbrizin Mərkəzi Kitabxanasında (№2941) saxlanılır [121,545].

İstər xanlıqlar dövründə, istərsə də rusların işğalından sonrakı illərdə irəvanlı yazarların əsərləri xarici dövlətlərdə çap olunurdu. Bu, ilk növbədə İrəvanda mətbəənin olmaması ilə bağlı idi. Fazil İrəvaninin "Qızılgül və bülbül" adlı əsəri 1812-ci ildə Sankt-Peterburqda erməni və rus dillərində, 1826-cı ildə Parisdə erməni dilində, 1832-1833-cü illərdə iki dəfə dalbadal fransız dilində, 1892-ci ildə alman dilində çap olunaraq İrəvanlı Xocens Markar Geğamyanın "orijinal əsəri" kimi erməni, rus, fransız, alman oxucularına təqdim edilmişdir. Əsəri fransız dilinə Vayye de Floribal, alman dilinə Yoze fon Hammer tərcümə etmişlər. Fransalı tədqiqatçı 1892-ci ildə məsələyə aydınlıq gətirərək bildirmişdir ki, "Qızılgül və bülbül" türk müəllifi Fazil İrəvaninin əsəridir. Xocens Markar sadəcə olaraq onu erməni və rus dillərinə tərcümə edəndən sonra "öz əsəri" kimi çap etdirmiş, dünya oxucularını çaşdırmışdır. Kitabın əsl müəllifi bəlli olduqdan sonra belə ermənilər "Qızılgül və bülbül"ü 1950-ci ildə yenə də erməni müəllifinin əsəri kimi Freznoda (ABŞ) çap etdirmişlər [121, 544].

Yerli müəlliflər öz əsərlərini başqa yerlərdə, başqa dillərlə yanaşı, ana dilində də çap etdirmişlər. Bu ilk təşəbbüsü Molla Hüseyn İrəvani göstərmişdir. Onun 201 səhifəlik şəkilli "Müseyibnamə" kitabı 1888-ci ildə Təbrizdə çap olunmuşdur. Bir il sonra Təbrizdə Mirzə Ağa Əli Həkimi İrəvaninin növhə və qəzəllərindən ibarət divanı çap olunub. 239 səhifəlik bu divan Azərbaycan və fars dillərində nəşr edilib [121,544].

2001-ci ildə Tehranda "Zofa" nəşriyyatı tərəfindən Səməd Sərdariniyanın 245 səhifəlik "İrəvan müsəlman yurdu olmuşdur" kitabı çap olunmuşdur. Müəllifin uzun illər apardığı araşdırmalarının nəticəsi olan bu kitab tarixi Azərbaycan torpaqlarında süni surətdə bir erməni dövləti qurulduğunu, yüzilliklər boyu Azərbaycan şəhəri olan İrəvanın Ermənistan Respublikasının paytaxtına necə çevrildiyini tarixi-elmi faktlarla əks etdirir. Kitabın son hissələrindəki bölmələrdə ermənilərin İrəvanda törətdiyi soyqırımlarından nicat tapmış bir sıra ailələr haqqında sənədlərə və fotoşəkillərə əsaslanan materiallar təqdim edilmiş, İrəvanın məşhur Göy məscidi və digər məscidləri, Ermənistanda qalıqları mövcud olan islam abidələri, İrəvanın alimləri və ruhaniləri, görkəmli şəxsiyyətləri, şair və yazıçıları haqqında məlumatlar verilmişdir. "İrəvan müsəlman yurdu olmuşdur" kitabının maraqlı cəhətlərindən biri də İrəvanın tanınmış şairi Mirzə Müslüm Qüdsinin İrəvana həsr etdiyi 300 beytlik məsnəvisinin burada dərc edilməsidir. S.Sərdariniya M.M.Qüdsinin adıçəkilən məsnəvisi də daxil olan divanının nüsxəsinin mərhum Hacı Məhəmməd Naxçıvaninin kitabxanasında 2814 saylı bölmədə saxlanıldığını qeyd etmişdir. Kitaba, həmçinin, "İrəvani" imzası ilə yazan şairlərdən Aşuftə İrəvani, Aşub İrəvani, Çeşmə İrəvani, Hiccət İrəvani, Dəlil İrəvani, Fəxri İrəvani, Qüdsi İrəvani, Nazim İrəvani kimi şairlərin əsasən İrəvanın vəsfinə həsr olunmuş şeirləri daxil edilmişdir [Mədətli E. Səməd Sərdariniyanın 245 səhifəlik "İrəvan müsəlman yurdu olmuşdur" kitabı. Tarix və onun problemləri, 2002, №2, s.196-199].

Orta əsrlərdə İrəvan xanlığının ərazisində bir sıra aşıq məktəbləri formalaşmışdır. Bunlardan ən zəngini Göyçə aşıq məktəbidir. Göyçə aşıq məktəbinin banisi Miskin Abdal (1470-1535) Şah İsmayıl Xətainin dəvəti ilə şah sarayına getmiş və orada aşıqlar məclisinə başçılıq etmişdir. Miskin Abdalın gəraylı, qoşma, divan və təcnisləri XV-XVI əsr türkdilli şeirimizin nadir nümunələri hesab edilir. Bu məktəbin parlaq simalarından biri də Ağ Aşıq adı ilə tanınan Aşıq Allahverdi (1754-1860) olmuşdur. Göyçənin Kərkibaş kəndində yaşayan Ağ Aşıq Aşıq Alının (1800-1911) ustadı olmuşdur. Bir çox saz havalarının yaradıcısı olan Aşıq Alı isə Azərbaycan aşıq sənətinin korifeyi Aşıq Ələsgərin (1821-1926) ustadı olmuşdur. Ermənilər 1918-ci ildə Aşıq Ələsgərin şagirdi Aşıq Nəcəfin belinə qaynar samovar bağlayıb ağlasığmaz bir işgəncə ilə öldürmüşlər [Sazlı-sözlü Göycə. Bakı, 1999, səh.13].

Gümrü aşıq məktəbinin ən tanınmış simalarından biri Aşıq Tüccar (1780-1860) olmuşdur. O, həm dastançı, həm də yaradıcı aşıq kimi şöhrət tapmış, çoxlu şağird yetişdirmişdir. XVIII əsrdə yaşadığı bəlli olan Aşıq Beymuraz uzun müddət Gümrüdə aşıqlıq etmiş, əfsanəvi haqq aşığı kimi şöhrət qazanmış, haqqında çoxlu rəvayətlər yaranmışdır. O, XVIII əsrin sonlarında Gümrü şəhərinin yaxınlığındakı "Beş müqəddəs" qəbiristanlığında dəfn edilmişdir. Onun qəbri ziyarətgaha çevrilmişdir. Erməni vandalları həmin qəbiristanlığı da yer üzündən silmişlər.

Gümrüdə yazıb-yaradan aşıqlardan biri də Şirəkli Həsən olmuşdur. 1692-ci ildə Ağbabanın Qaraçanta kəndində anadan olan Həsən ərəb, fars və gürcü dillərini mükəmməl bilirmiş. Sonralar Gümrüdə yaşayan Həsən Leyli adlı bir qıza aşiq olsa da, qızı ona vermirlər. Bundan sonra Həsən başını götürüb Sarıqamışa gedir. O, 1752-ci ildə orada vəfat etmişdir. XIX əsrdə Şirəkli Həsənin Gəncədə kitabı çap olunmuşdur.

İrəvan xanlığının ərazisində yeganə işlək dil Azərbaycan türkcəsi olmuşdur. Rus tarixçi-statistiki İ.Şopen İrəvan və Naxçıvan xanlıqlarının ərazisində 1829-1832-ci illərdə kameral siyahiyaalma keçirmiş və "tatar dili" — Azərbaycan dili haqqında belə qənaətə gəlmişdir: "Bu məşhur dil haqqında bir neçə söz deməmək mümkün deyildir, hansı ki, Adriatik dənizindən tutmuş Sakit, Hind və Atlantik okeanlarının sahillərinədək, Qədim Dünyanın üçdəbir hissəsində milyonlarla xalqlar bu dildə anlaşırlar" [95,911].

Böyük rus şairi M.Y.Lermontov Qafqazı gəzdikdən sonra bu qənaətə gəlmişdi: "Tatar dilini (yəni Azərbaycan dilini) öyrənməyə başlamışam, fransız dili Avropada zəruri olduğu kimi, bu dil də burada və ümumiyyətlə Asiyada zəruridir" [Lermontov M., Əsərlərinin tam külliyyatı (rusca),V cild, Moskva — Leninqrad, 1937, səh. 393].

Hələ xanlıqlar dövründən öncə İrəvan bölgəsində şifahi xalq ədəbiyyatının zəngin nümunələri yaranmışdı. İrəvan xanının sarayında tez-tez musiqi məclisləri keçirilərmiş. Fransız səyyahı Jan Şardən 1673-cü ildə İrəvanda olarkən Sərdar sarayında Qulam şahın (həmin dövrdə İrəvana gələn şah elçisinin — ***red.***) şərəfinə düzənlənmiş bir musiqi məclisini təsvir etmişdir. Onun yazdığına görə, güləş əyləncəsi başa çatdıqdan sonra həyəti çadırlarla örtdülər, yuxarı başa gözəl xalçalar saldılar, böyük bir dəstə musiqiçilər və rəqqasələr gətirdilər. Avropa səyyahı yazır ki, "...onlar iki saatdan çox heç kimi darıxdırmadan səhnədə oldular. Hakim (yəni İrəvan sərdarı — ***red.***) bu müddət ərzində onlara baxdı, şah elçisi ilə, məclisdəkilərlə söhbət etdi, məni Avropa barədə danışmağa vadar etdi. Şah sarayındakı xidmət sisteminə uyğun olaraq, əyalət hakimləri də eyni cür mürəkkəb qulluqçu sisteminə malikdirlər. Musiqiçilər və rəqqasələr də bu cür qulluqçu sisteminə daxildir. Şərqdə əylənmək və ya bir-biri ilə xoş rəftar eləmək xatirinə rəqs etmək adətləri yoxdur. Onlarda rəqs bir incəsənət və ya sənət kimi mövcud olub, Avropadakı teatr sənətinə oxşar-

dır... Musiqiçilər və rəqqasələr Şərqin mimləri (mimik hərəkətlərlə tamaşa göstərən aktyor) və ya məzhəkəçilər idilər, daha dəqiq desək, bu, onların operasıdır" [10, 23, 28].

Deməli, hələ XVII əsrdə İrəvanda Sərdar sarayında teatr tamaşaya qoyulmuş və opera oynanılmışdır. Həmin dövrdə ermənilərin bu diyarda nə dövləti, nə dövlətçilik ənənəsi, nə də ədəbi məclisləri vardı. Ermənilər yalnız əhatəsində yaşadıqları xalqların folklorunu və musiqisini yamsılamaqla məşğul olmuşlar. Ermənilərin başqa xalqlardan istifadə etdikləri, bu xalqların təsiri sayəsində yaratdıqları nəğmələr və havalar haqqında erməni tədqiqatçısı S.Palasanyan yazır: "Bizim mahnıların havası müxtəlifdir. Türkiyədə türkün, Gürcüstanda gürcünün, İrəvan, Şuşa, Ağkilsə və İranda farsın, ümumiyyətlə hansı xalqın təsiri altında olmuşuqsa, həmin xalqın mahnılarının havalarını götürmüşük" [Bax: Abbasov İ. Azərbaycan folkloru XIX əsr erməni mənbələrində. Bakı, 1977, səh.65].

Bu gün dünyaya "Erməni havaları" kimi təqdim olunan havalar və nəğmələr haqqında erməni yazıçısı Mikael Nalbandyan təqribən 150 il bundan öncə yazırdı: "Ancaq havaların əksəriyyəti türklərdən-(azərbaycanlılardan — ***red.***) götürülübdür. Mən ermənilərin yaşadıqları çox yerləri dolaşmışam, həmişə də çalışmışam sırf ermənicə nəsə eşidəm. Lakin həmin şeyi dinləmək mənə nəsib olmamışdır" [Bax: Abbasov İ. Azərbaycan folkloru XIX əsr erməni mənbələrində. Bakı, 1977, səh.65].

Azərbaycan dilinin zənginliyi, poetikliyi, onun musiqi kimi ahəngdar olması İrəvan xanlığının ərazisində yaşayan ermənilərin də bu dildə yazıb-yaratmalarına səbəb olmuşdur. Erməni yazıçısı Xaçatur Abovyan yazırdı: "Türkcəni qadınlar və uşaqlar belə bilir. Buna görə də xalq içərisində məşhur və fitrətən şairlik istedadına malik olan adamların tatarca (Azərbaycan dilində — ***red.***) şeir yaratmaları çox təbii bir haldır".

Erməni aşıqlarının Azərbaycan dilindən, Azərbaycan şifahi xalq ədəbiyyatının forma və məzmun zənginliyindən istifadə etmələrinin səbəblərindən biri də XV-XVI əsrlərdən başlayaraq Azərbaycan şifahi xalq ədəbiyyatının çox sürətlə inkişaf etməsi olmuşdur. Digər səbəb isə XIX əsrin birinci yarısınadək erməni ədəbi dilinin — aşxarabarın formalaşmaması olmuşdur. Erməni yazarlarının əksəriyyəti əski erməni ləhcəsində — qrabarda yazıb-yaratdıqlarından həmin əsərləri erməni xalqı başa düşmürdü. Erməni tarixçisi Leo (Arakel Babaxanyan) belə qənaətə gəlmişdir ki, erməni dilinin yoxsulluğu üzündən erməni aşıqları öz mahnılarını Azərbaycan dilində qoşmuşlar. O yazır: "Aşıqlar üçün nağıllarda, mahnılarda təsvir olunan həyatı ifadə etmək üçün türk dili (Azərbaycan dili — ***red.***) erməni ləhcələrindən daha səlis, daha ifadəli və daha zəngindir".

Azərbaycan dilinin köməyi ilə erməni aşıqları özlərinə çoxlu dinləyici və tamaşaçı toplaya bilirdilər. Professor A.Arşaruni də təsdiq edir ki, Azərbaycan dili "...demək olar ki, erməni aşıqlarının və erməni xalqının doğma dili olmuşdur. Əks təqdirdə onlar (yəni, erməni aşıqları ) dinləyicilər qarşısında müvəffəqiyyət qazana bilməzdilər və onların dili dinləyicilər üçün anlaşılmaz olardı" [Bax: Abbasov İ. Azərbaycan folkloru XIX əsr erməni mənbələrində. Bakı, 1977, səh.102].

Azərbaycan dilində yazıb-yaradan XVII əsr erməni aşıqları haqqında xeyli məlumat vardır. Onların əsərlərindən bəzi nümunələr Matenadaranda və Ermənistan Ədəbiyyat və İncəsənət Muzeyində saxlanılır. XVIII əsrdə Azərbaycan dilində nəğmələr qoşan Sayat Nova, Miran, Bağıroğlu, Əmiroğlu, Qul Yeqaz, Turab Dədə, Şamcı Meleko, Kiçik Nova, Qul Hovanes və b. erməni aşıqlarının adları məlumdur. İrəvanda Aşıq Şirinin və Gümrüdə Aşıq Bavenin başçılığı ilə Azərbaycan dilində yazıb-yaradan aşıq məktəbləri olmuşdur [Yerevanlı Ə. Azəri-erməni ədəbi əlaqələri. İrəvan, 1968, s. 282].

Azərbaycan-erməni ədəbi əlaqələrini dərindən araşdıran, Matenadaranda və Ermənistan arxivlərində uzun illər tədqiqat aparan filologiya elmləri doktoru İsrafil Abbasov qeyd edir ki, XVII-XVIII əsrlərə, daha çox isə XIX əsrə aid elə bir erməni əlyazması yoxdur ki, orada Azərbaycan xalqının qədim nəğmələrinə təsadüf edilməsin. İ.Abbasov, həmçinin, Matenadaranda saxlanılan və Azərbaycan folkloru nümunələrini, habelə bir sıra yazılı ədəbiyyat materiallarını özündə əks etdirən qiymətli əlyazmaların inventar nömrələrini göstərməklə onların yazılma tarixini müəyyənləşdirən cədvəl tərtib etmişdir. Ermənilərin Azərbaycana aid sənədlərin, ilk mənbələrin izini itirməkdə peşəkar olduqlarını nəzərə alaraq həmin cədvəli olduğu kimi veririk.

Bütün bunlar göstərir ki, Azərbaycan dövləti olan İrəvan xanlığı olduqca zəngin tarixə, təkrarsız və qədim mədəni irsə malik olmuşdur. Bu irsin öyrənilməsi və gələcək nəsillərə çatdırılması günümüzün ən vacib və aktual elmi problemlərindən biridir.

Matenadaranda saxlanılan və Azərbaycan folkloruna aid bəzi əlyazmaları haqqında məlumat

| Sıra №-si | Əlyazma | Sənədin inventar №-si | Aid olduğu tarix |
|---|---|---|---|
| **1** | **2** | **3** | **4** |
| 1 | "-" | 2394 | XVII əsr |
| 2 | "-" | 2842 | XIX əsr |
| 3 | "-" | 2845 | XIX əsr |
| 4 | "-" | 3055 | 1831-ci il |
| 5 | "-" | 3581 | 1617-ci il |
| 6 | "-" | 3228 | XIX əsr |
| 7 | "-" | 3229 | 1885-ci il |
| 8 | "-" | 3411 | XVII əsr |
| 9 | "-" | 3417 | XVIII əsr |
| 10 | "-" | 3443 | XVIII əsr |
| 11 | "-" | 3751 | XIX əsr |
| 12 | "-" | 3998 | 1640-cı il |
| 13 | "-" | 4355 | XVIII əsr |
| 14 | "-" | 4529 | XIX əsr |
| 15 | "-" | 5954 | XVIII əsr |
| 16 | "-" | 6438 | XIX əsr |
| 17 | "-" | 6640 | XIX əsr |
| 18 | "-" | 6998 | XIX əsr |
| 19 | "-" | 7009 | XVIII əsr |
| 20 | "-" | 7197 | XIX əsr |
| 21 | "-" | 7315 | XIX əsr |
| 22 | "-" | 7316 | XIX əsr |
| 23 | "-" | 7318 | XIX əsr |


210

| 1 | 2 | 3 | 4 |
|---|---|---|---|
| 24 | "-" | 7351 | XIX əsr |
| 25 | "-" | 7653 | XIX əsr |
| 26 | "-" | 7693 | XIX əsr |
| 27 | "-" | 7694 | 1876-cı il |
| 28 | "-" | 7667 | 1759-cu il |
| 29 | "-" | 7702 | 1831-ci il |
| 30 | "-" | 7707 | 1611-ci il |
| 31 | "-" | 7709 | 1620-ci il (1608) |
| 32 | "-" | 7715 | 1687-ci il (1688) |
| 33 | "-" | 7716 | XIX əsr |
| 34 | "-" | 7717 | 1695-ci il |
| 35 | "-" | 7782 | 1784-cü il |
| 36 | "-" | 7891 | XVII-XVIII əsrlər |
| 37 | "-" | 7997 | ? |
| 38 | "-" | 8021 | 1802-ci il |
| 39 | "-" | 8084 | 1810-cu il |
| 40 | "-" | 8099 | XIX əsr |
| 41 | "-" | 8338 | XIX əsr |
| 42 | "-" | 8361 | 1696-cı il |
| 43 | "-" | 8397 | 1666-cı il |
| 44 | "-" | 8540 | 1799-1807-ci illər |
| 45 | "-" | 8605 | 1676 (1667)-ci il |
| 46 | "-" | 8715 | XVIII-XIX əsrlər |
| 47 | "-" | 8725 | XIX əsr |
| 48 | "-" | 8738 | XVII-XVIII əsrlər |
| 49 | "-" | 8741 | XIX əsr |
| 50 | "-" | 8764 | XIX əsrr |
| 51 | "-" | 8820 | XIX əsr |
| 52 | "-" | 8831 | XIX əsr |
| 53 | "-" | 8967 | XVII-XVIII əsrlər |
| 54 | "-" | 8968 | 1556-cı il |
| 55 | "-" | 9003 | XIX əsr |

Mənbə: Abbasov İ. Azərbaycan folkloru XIX əsr erməni mənbələrində. Bakı, 1977, s.46-47.



Şəkil 1.
İrəvan yaxınlığında Azərbaycan Qaraqoyunlu əmirlərinə məxsus
Cəfərabad türbəsi
***Mənbə:*** Папазян А.Д. Арабская надпись на гробнице
Туркменских Эмиров в селе Аргаванг. “Ближний и средний Восток”
Сб. статей. Памяти Б.И.Заходера. М., 1961, с.72



Şəkil 2.
Cəfərabad türbəsi üzərində yazı
***Mənbə:*** Неймат М. Корпус эпиграфических памятников Азербайджана, т, 3. Баку, 2001, с.175



Şəkil 3.
İrəvan bölgəsində Azərbaycan türklərinə məxsus türbə
***Mənbə:*** Alişan G. Ayrarat (erməni dilində).
Venesiya, 1890, s. 275



Şəkil 4.
İrəvan bölgəsində Azərbaycan türklərinə məxsus qədim başdaşı
***Mənbə:*** Axundov D. Архитектура древнего и раннесредневекового Азербайджана. Баку, 1986, с. 311



Şəkil 5.
İrəvan qalasının, Böyük və kiçik Ağrı dağının görünüşü
Dübua de Monperenin çəkdiyi şəkil (XIX əsr)



Şəkil 6.
İrəvan qalasının görünüşü.
***Mənbə:*** Alişan G. Ayrarat. (erməni dilində). Venesiya, 1890, s.455.



Şəkil 7.
İrəvan xanları sarayının ümumi görünüşü
***Mənbə:*** Alişan G. Ayrarat (erməni dilində).
Venesiya, 1890, s. 309.



Şəkil 8.
İrəvan Sərdar sarayının Güzgülü salonu
***Mənbə:*** Alişan G. Ayrarat (erməni dilində).
Venesiya, 1890, s. 310



Şəkil 9.
İrəvan Sərdar sarayının dəhlizindən bir görünüş
***Mənbə:*** Alişan G. Ayrarat (erməni dilində).
Venesiya, 1890, s. 310




Şəkil 10.
İrəvan xanları sarayının planı
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1068, с. 66



Şəkil 11.
İrəvan qalası, Xan sarayı içərisində xanın igamətgahı
***Mənbə:*** Kiyasi C., Bozyel I. Armenian Acts of Cultural Terrorism.
Ankara, 1997, p. 46



Şəkil 12.
"Ayaq üstə dayanmış oğlan" portreti
Rəssam Mirzə Qədim İrəvaninin çəkdiyi şəkil
***Mənbə:*** Azərbaycan Sovet Ensiklopediyası (ASE), c. VI, s.312



Şəkil 13.
"Oturmuş qadın" portreti
Rəssam Mirzə Qədim İrəvaninin çəkdiyi şəkil
***Mənbə:*** Azərbaycan Sovet Ensiklopediyası (ASE), c. VI, s.313



Şəkil 14.
Göy məscidin ümumi görünüşü. İrəvan şəhəri XVIII əsr.
AMEA TİEA, İ.P. Şeblıkinin şəxsi fondundan



Şəkil 15.
Göy məsciddəki Baş ibadətgahın portalı. İrəvan şəhəri
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с. 64




Şəkil 16.
İrəvan şəhərindəki Göy məscidin planı
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с. 64



Şəkil 17.
İrəvan şəhərindəki Göy məscidin çarhovuzu
***Mənbə:*** Lynch H.F.B., Armenia, Travels and Studies,
vol. 2, 1901, p. 214



Şəkil 18.
Azərbaycan türklərinə məxsus qədim Göy məscidin
əsas giriş qapısı və minarəsi
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с. 65



Şəkil 19.
Azərbaycan türklərinə məxsus qədim məscid. İrəvan qalasının içərisində
Dübua de Monperenin çəkdiyi şəkil (XIX əsr)



Şəkil 20.
Azərbaycan türklərinə məxsus qədim Göy məscidin ümumi görünüşü
Dübua de Monperenin çəkdiyi şəkil (XIX əsr)



Şəkil 21.
Azərbaycan türklərinə məxsus qədim
Göy məscidə həsr olunmuş poçt markası. 1910-cu il
***Mənbə:*** http://www.baku.ru/cmm-gir-list.php?cmm_id=564&id=124124



Şəkil 22.
1988-ci ildə ermənilər tərəfindən dağıdılmış İrəvandakı
gədim Göy məscidin yerində xarici ölkələrdən gələn müsəlman iş adamları
üçün tikilmiş fars məscidi (və ya “kiçik Göy məscid”)
***Mənbə:*** www.wikipedia.org/wiki/category: Blue-Mosgue



Şəkil 23.
Dəmirbulaq məhəlləsindəki Azərbaycan türklərinə məxsus
Çətirli məscid. İrəvan şəhəri.
Məscidin baxıcısı Əkbər Babayevin şəxsi arxivindən. Foto 1988-ci ildə çəkilib.



Şəkil 24.
Fəhləbazara gedən yol. İrəvan şəhəri
***Mənbə***: Арутюнян В., Асратян М., Меликян А. Ереван.
М., 1968, с. 71



Şəkil 25.
Azərbaycan türklərinə məxsus Əfşar karvansarası. İrəvan şəhəri
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван.
М., 1968, с. 70



Şəkil 26.
Əxi Təvəkkül zaviyəsinin xarabalıqlarının görünüşü (XII əsr).
***Mənbə:*** Mirzəyev H. Qərbi Azərbaycanın Dərələyəz mahalı
Bakı, 2004, s.192



Şəkil 27.
Əli xanın evi. İrəvan şəhəri
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с. 74



Şəkil 28.
Pənah xanın evi. İrəvan şəhəri
***Mənbə:*** Арутюнян В., Асратян М., Меликян А. Ереван. М., 1968, с. 89



Şəkil 29.
Qədim İrəvan xalçası.
Şəxsi kolleksiyadan



Şəkil 30.
Qədim İrəvan xalçası*
***Mənbə:*** http://www.gudman-stroy.ru/article2/images/kover_armen.jpg
*Azərbaycan türklərinə məxsus bu qədim İrəvan xalçası da ermənilər tərəfindən saxtalaşdırılaraq internet saytında “Erməni xalçası” kimi təqdim olunub.



Şəkil 31.
İrəvanda azərbaycanlılara məxsus bədii parça nümunəsi
***Mənbə:*** Армянская набойка. Альбом. М., 1950, с.56
*Azərbaycan türklərinə məxsus bütün bədii parça nümunələri
erməni müəllifləri tərəfindən təhrif olunaraq "erməni bədii parçaları"
kimi təqdim olunur.



Şəkil 32.
İrəvanda azərbaycanlılara məxsus bədii parça nümunəsi
***Mənbə:*** Армянская набойка. Альбом. М., 1950, с.61
*Azərbaycan türklərinə məxsus bütün bədii parça nümunələri erməni müəllifləri tərəfindən təhrif olunaraq "erməni bədii parçaları" kimi təqdim olunur.



Şəkil 33.
İrəvanda azərbaycanlılara məxsus rəngkarlıq nümunəsi
***Mənbə:*** Армянская набойка. Альбом. М., 1950, с.61
*Azərbaycan türklərinə məxsus bütün rəngkarlıq nümunələri
erməni müəllifləri tərəfindən təhrif olunaraq "erməni rəngkarlıq nümunəsi"
kimi təqdim olunur.



Şəkil 34.
Məşhur İrəvan aşığı (XVI əsr) Miskin Abdal nəslinin şəcərəsi
***Mənbə:*** "Haqq yolu" qəzeti, 6 sentyabr 2000-ci il



Şəkil 35.
Azərbaycan türklərinə məxsus qoç heykəli.* Orta əsrlər
*İrəvan xanlığı (indiki Ermənistan) ərazisindəki Azərbaycan türklərinə məxsus külli miqdarda qoc heykəlləri və qəbiristanlar erməni vandalları tərəfindən məhv edilmişdir.




Şəkil 36.
Azərbaycan türklərinə məxsus qoç heykəli.* Orta əsrlər
*İrəvan xanlığı (indiki Ermənistan) ərazisindəki Azərbaycan türklərinə məxsus külli miqdarda qoc heykəlləri və qəbiristanlar erməni vandalları tərəfindən məhv edilmişdir.



Şəkil 37.
Azərbaycan türklərinə məxsus sənduqə.* Orta əsrlər
*İrəvan xanlığı (indiki Ermənistan) ərazisindəki Azərbaycan türklərinə məxsus külli miqdarda daş sənduqələr və qəbiristanlar erməni vandalları tərəfindən məhv edilmişdir.



Şəkil 38.
Azərbaycanlılara məxsus qəbirüstü abidə.* Orta əsrlər
*İrəvan xanlığı (indiki Ermənistan) ərazisindəki Azərbaycan türklərinə məxsus külli miqdarda qəbirüstü abidələr və qibiristanlar erməni vandalları tərəfindən məhv edilmişdir.



Şəkil 39.
Azərbaycan türklərinə məxsus sənduqə.* Orta əsrlər
*İrəvan xanlığı (indiki Ermənistan) ərazisindəki Azərbaycan türklərinə məxsus külli miqdarda daş sənduqələr və qəbiristanlar erməni vandalları tərəfindən məhv edilmişdir.



Şəkil 40.
Azərbaycanlılara məxsus qədim qəbirüstü abidə.* Orta əsrlər
*İrəvan xanlığı (indiki Ermənistan) ərazisindəki Azərbaycan türklərinə məxsus külli miqdarda qəbirüstü abidələr və qəbiristanlar erməni vandalları tərəfindən məhv edilmişdir.

Azərbaycan xanlıqları, o cümlədən də İrəvan xanlığı Cənubi Qafqazla bağlı beynəlxalq münasibətlərin olduqca kəskinləşdiyi bir tarixi şəraitdə yaranmışdı. XVIII əsrin II yarısında inkişaf etmiş qərb dövlətlərinin Cənubi Qafqaz regionuna maraqları daha da artmışdı. Həmin dövrdə regionda mənafeləri toqquşan Rusiya və Osmanlı imperiyaları arasındakı münasibətlər daha da kəskinləşmişdi. Buna görə də İrəvan xanları şəraitdən asılı olaraq çevik xarici siyasət yürüdürdülər.

Azərbaycanın digər xanlıqları kimi, İrəvan xanlığı da mürəkkəb tarixi şəraitdə öz müstəqilliyini qoruyub saxlamaq uğrunda çətin mübarizə aparırdı. Bu mübarizənin əsasını xanın hakimiyyətini möhkəmləndirmək, yadelli təcavüzlərinin qarşısını almaq, xarici iqtisadi əlaqələri gücləndirmək, qonşu dövlətlərlə qarşılıqlı münasibətlər qurmaq təşkil edirdi [xanlığın dövlət atributları haqda bölmənin sonunda verilmiş şəkillərə bax].

İrəvan xanlığının xarici siyasətində **üç mərhələ** nəzərə çarpır:

**I.** 1747-ci ildən 1783-cü il Georgiyevsk müqaviləsinin bağlanmasına qədərki dövr;

**II.** Georgiyevsk müqaviləsinin bağlanmasından XVIII əsrin sonlarına qədərki dövr;

**III.** XIX əsrin başlanğıcından xanlığın Rusiya imperiyası tərəfindən işğalına qədərki dövr (bu dövr haqqında növbəti fəsillərdə geniş məlumat verilir).

İrəvan xanlığının xarici siyasətinin **ilk mərhələsində** aparıcı xətti Azərbaycanın digər xanlıqları və qonşu dövlətlərlə — xüsusən də Kartli-Kaxeti çarlığı və Osmanlı imperiyası ilə qarşılıqlı münasibətlər təşkil edir.

İrəvan xanlığı müstəqillik əldə etdikdən dərhal sonra öz sərhədlərini genişləndirmək uğrunda mübarizəyə başladı. 1748-ci ilin əvvəllə-

rində Mehdi xan Əfşar (1747-1751) digər Azərbaycan xanlığı olan Urmiya xanlığına hücum edərək onun bəzi ərazilərini tutdu və İrəvan xanlığının ərazisini xeyli genişləndirdi [112, 111]. Lakin 1749-cu ilin yayında İrəvan xanlığının özü digər Azərbaycan xanlığının — Qarabağ xanlığının hücumuna məruz qaldı: qarabağlı Pənahəli xan 4 minlik qoşunla İrəvan xanlığının sərhədlərini keçərək Üçkilsə ətrafındakı torpaqlara yürüş etdi [41,c.I,237-238;115,52]. İrəvan xanlığında azlıq təşkil edən gəlmə ermənilər bu hadisələrdən öz mövqelərini möhkəmləndirmək üçün istifadə etdilər. Onlar guya "özlərini müsəlmanlardan qorumaq" məqsədilə* Kartli çarı Teymuraza və onun oğlu, Kaxeti çarı II İrakliyə yardım üçün müraciət etdilər [105, 172, 187; 214, 30]. II İrakli qoşun toplayaraq Pənahəli xana qarşı göndərdi. Döyüşdə öz yaxınlarını itirən Pənahəli xan geri qayıtdı.

Daim Azərbaycanın qərb torpaqlarına, o cümlədən İrəvana göz dikən gürcü çarları** heç bir səbəb olmadan 1751-ci ilin sentyabrında gözlənilmədən İrəvan xanlığına basqın edərək xanın qoşununu məğlubiyyətə uğratdılar və buradan da Təbrizə tərəf irəlilədilər [41, c.I, 237-238; 387-388, 389; 115, 53].

Müdaxiləçilərlə danışıqlara girən İrəvan xanı bundan sonra gürcü çarları ilə "müttəfiq" olacağına razılıq verdi. Həmin razılığa əsasən, o, 1751-ci ildə qonşuluqdakı Şəki xanlığının qüvvətlənməsindən narahat olan Teymurazın və II İraklinin çağırışı ilə Gəncə xanı ilə birlik-

---

* İrəvan xanlığı ərazisində yaşayan azsaylı ermənilər xanlıqda hakim mövqe tutmaq məqsədilə fürsət düşən kimi gürcü çarına müraciət edərək onları İrəvana dəvət edirdilər. Məqsəd gürcü çarının köməyi ilə İrəvan xanını zəiflətmək və hakimiyyəti ələ almaq idi.

** 1736-cı ildə Muğan qurultayında tacqoyma mərasimində Gəncə-Qarabağ hakimləri Nadirqulu xanın Səfəvi dövlətinə son qoyması ilə razılaşmayıb, onun şah seçilməsinin əleyhinə çıxmışdılar. Həmin qurultayda iştirak edən gürcü və erməni feodalları isə əksinə, gələcək şahın namizədliyini dəstəkləmişdilər. Nadirqulu xan şah seçildikdən sonra Gəncə-Qarabağ bəylərini cəzalandırmaq üçün onları hakimiyyətdən uzaqlaşdırmış, bir sıra Azərbaycan torpaqlarını, o cümlədən Qazax, Şəmşəddil və Borçalının idarəsini gürcü çarı I Teymuraza həvalə etmişdi. Bu torpaqlarla qane olmayan gürcü çarları daim Azərbaycanın şimal-qərb və cənub-qərb torpaqlarını bütünlüklə ələ keçirməyə can atırdılar.

də gürcülərə qoşularaq şəkili Hacı Çələbi xana qarşı yürüşdə iştirak etdi. Bu yürüşü təşkil edən gürcü çarının əsas məqsədi onun Azərbaycanın şimal-qərb torpaqlarını işğal etmək planlarına qarşı başlıca maneə olan Şəki xanlığını zəiflətmək idi. Lakin gürcü çarının planı puça çıxdı. Hacı Çələbi xan işğalçı gürcü çarının və ona qoşulmuş Azərbaycan xanlarının hərbi qüvvələrini ağır məğlubiyyətə uğratdı [41, I, 389-390; 115, 53].

Bu hadisədən sonra İrəvan xanlığı cənubdan hücuma məruz qaldı. Mehdi xan Əfşar tərəfindən 1748-ci ildə məğlubiyyətə uğradılmış urmiyalı Fətəli xan Əfşar keçmiş məğlubiyyətin əvəzini çıxmaq üçün İrəvanı ələ keçirmək qərarına gəldi. Bu məqsədlə o, vaxtilə Nadir şahın, sonra isə Əmiraslan xanın yanında qulluq etmiş, indi isə Urmiya xanının xidmətində olan əfqanıstanlı Azad xanın başçılıq etdiyi hərbi qüvvələri Urmiya döyüşçüləri ilə birlikdə (ümumilikdə 30 min nəfər) 1751-ci ildə İrəvan xanına qarşı göndərdi. Bu qoşunların ön dəstəsi İrəvan qalasını mühasirəyə aldı. İrəvan xanı yardım üçün "müttəfiqi" gürcü çarı II İrakliyə müraciət etdi. Gürcü çarı yenə fürsəti əldən vermədi və dərhal İrəvana doğru hərəkət etdi. Gürcü qoşunları* qalanı mühasirəyə almış əfşar-əfqan qoşunlarının sayca az olan ön dəstəsini məğlubiyyətə uğratdı [41, I, 238; 115, 53-54].

Lakin az sonra Urmiya və əfqan qoşunlarının əsas qüvvələrinin yaxınlaşdığını eşidən gürcü çarı tələsik İrəvan ətrafını tərk edərək Gürcüstana doğru üz tutdu. Azad xan İrəvan qalasını ələ keçirdi və bundan dərhal sonra II İraklini təqib etdi. Gürcü qoşunlarını haqlayan Azad xan ilk toqquşmadaca II İraklinin hərbi qüvvələrini darmadağın etdi. Gürcü çarı özü üçün ağır şərtlərlə barışıq bağlamağa

* İlk mənbələrin məlumatından aydın olur ki, II İraklinin İrəvan xanlığına "kömək" məqsədilə topladığı qoşunların əksəriyyətini Qazax və Borçalı mahallarından səfərbər edilmiş azərbaycanlılar təşkil edirdi [bax: 123, 200-201].

məcbur oldu. O, 200 gürcü döyüşçüsünü, habelə Zal bəy və Aslan bəy adlı iki nüfuzlu gürcü sərkərdəsini girov verdi [41, I, 238; 112, 111-112]. Mənbələrdə II İraklinin bacısının da girov verilənlərin içərisində olduğu qeyd edilir [220, 42; 112, 111-112].

Azad xanın başçılıq etdiyi əfşar və əfqan qoşunları Azərbaycanın şimalını tərk edən kimi II İrakli yenidən Azərbaycana qarşı işğalçılıq siyasətini davam etdirdi. R.V.Qriqoryan 1752-ci ildə II İraklinin guya İrəvan xanığına yürüş etdiyini yazır [214,30]. Əslində isə, qeyd olunan vaxt II İrakli İrəvan xanlığına deyil, Azərbaycanın o zaman ən nüfuzlu xanı olan və Azərbaycanı vahid dövlət halında birləşdirməyə çalışan şəkili Hacı Çələbiyə qarşı yenidən yürüş təşkil etdi. Hacı Çələbi xanla təkbətək qarşılaşmaqdan ehtiyat edən gürcü çarı bir sıra Azərbaycan xanlarını, o cümlədən İrəvan xanını, guya "Hacı Çələbi xana qarşı hərbi əməliyyat planını müzakirə etmək" üçün Gəncə yaxınlığındakı düşərgəsinə dəvət etdi. II İrakli danışıqlar zamanı hiylə işlədərək öz müttəfiqlərinə xəyanət etdi. O, Qızılqaya adlı yerdə onunla danışıqlar aparmaq üçün gəlmiş müttəfiqlərini — Azərbaycan xanlarını əsir alaraq Gürcüstana üz tutdu. Ona qarşı düşmənlə ittifaqa girmiş xanlardan fərqli olaraq, Azərbaycanın ümumi siyasi mənafeyini üstün tutan Hacı Çələbi xan bu xəbəri alan kimi gürcü qoşunlarına qarşı hücuma keçərək II İraklini Tiflis yaxınlığında haqladı və ağır məğlubiyyətə uğratdı. II İrakli Azərbaycan xanlarını sərbəst buraxaraq bir qrup süvari ilə Tiflisə qaçdı. Gürcü çarının piyada qoşunlarından min nəfər öldürüldü və əsir götürüldü [41, I, 238-239, 390-391; 115, 57-58]. II İrakli ilə "dostluğun" "dadını" görmüş Azərbaycan xanları, o cümlədən İrəvan xanı bundan sonra gürcü çarından üz çevirib Hacı Çələbi ilə birləşdilər.

**Həsənəli xan Qacarın** (1755-1759) və varisi **Hüseynəli xan Qacarın** (1759-1783) dövründə Kartli-Kaxeti çarı İrəvan xanlığına daha tez-

tez yürüşlər etməyə başladı. 1759-cu ildə İrəvan xanlığı məhz bu viranedici yürüşlər nəticəsində II İraklinin xəzinəsinə illik bac ödəməyə məcbur oldu [166, 129]. Bununla kifayətlənməyən II İraklinin İrəvan xanlığına hərbi yürüşləri 1762-1765, 1778-1779-cu illərdə də davam etdi [214, 31]. Bununla belə, II İrakli İrəvan xanlığını özündən asılı hala sala bilmədi.

Bəhs olunan dövrdə Cənub-Qərbi Qafqazın açarı və ən güclü qalası hesab olunan İrəvanın hərbi-strateji əhəmiyyəti böyük olduğundan [166,205] İrəvan xanlığı qonşu dövlətlərin diqqət mərkəzində idi. Bu dövrdə İranda real hakimiyyəti ələ keçirən Kərim xan Zənd gürcü çarının Azərbaycan xanlıqlarına hücumlarından narazı qaldığını bildirərək Hüseynəli xandan II İrakliyə bac verməyi dayandırmasını tələb etdi. Belə olacağı təqdirdə Kərim xan Zənd onu müdafiə edəcəyinə söz verdi [115, 60]. Bu, bölgədəki siyasi vəziyyəti xeyli gərginləşdirdi. Hətta, 1770-ci ilin yazında İrəvan uğrunda Kərim xan Zəndlə II İrakli arasında müharibə olacağı gözlənilirdi [166, 142].

Bu mürəkkəb vəziyyətdə İrəvan xanlığı nəinki öz müstəqilliyi uğrunda mübarizə aparır, həm də Azərbaycanın digər xanlıqlarında və qonşu dövlətlərdə baş verən hadisələrə biganə qalmırdı. 1775-ci il iyunun 23-də İrəvan xanı Hüseynəli xan, Qars mühafizi İzzət Mehmet paşa vasitəsilə Osmanlı dövlətinə məktub göndərdi. Məktubda İrəvan xanının Rusiyanın Dağıstan ərazisindəki fəaliyyətindən doğan narahatlığı ifadə olunurdu [191, 107; 125,38]. İrəvanı daim diqqət mərkəzində saxlayan Osmanlı dövləti isə Rusiyanın Kartli-Kaxeti çarlığı vasitəsilə Cənubi Qafqaza, o cümlədən İrəvana müdaxiləsinin güclənməsindən ehtiyat edirdi. Sultan III Mustafa (1757-1774) öz vəzirinə yazdığı məktubda bu müdaxilənin qarşısını almaq tədbirlərini müzakirə etmək üçün onunla görüşüb məsləhətləşməyin zəruri olduğunu bildirirdi [14; 20, 57; 124, 159]. Şübhəsiz ki, II İraklinin İrəvan

xanlığına olan işğalçılıq niyyəti Azərbaycanın digər xanlıqlarını da narahat edirdi. Məsələn, Şəki xanı Məhəmməd Həsən xan 1776-cı ildə Osmanlı dövlətinə göndərdiyi məktubunda II İraklinin İrəvan qalasına hücum edəcəyi təqdirdə Azərbaycan xanlarının və Dağıstan hakimlərinin ona qarşı birləşəcəyini bildirirdi [20, 67].

Qeyd olunan dövrdə İrəvan xanlığının Kartli-Kaxeti çarlığı üçün iqtisadi əhəmiyyəti çox böyük idi [166,205]. Məhz bu səbəbdən 1779-cu ilin əvvəllərində II İrakli və oğlu Levan 12 minlik qoşunla (5 mini dağıstanlı muzdlu döyüşçü idi) İrəvan qalasını mühasirəyə aldı və yenidən Hüseynəli xandan bac tələb etdi. Lakin İmeretiyada baş vermiş üsyanı yatırmaq üçün gürcü çarı İrəvanın mühasirəsindən əl çəkib geri dönməyə məcbur oldu. II İrakli Gürcüstana qayıdarkən İrəvan xanlığından bac əvəzinə çoxlu sayda silahsız dinc əhalini əsir alaraq özü ilə Gürcüstana apardı [41, II, 73-74; 115, 60].

Kərim xan Zəndin ölümü (1779, mart — ***red.***) İranda hakimiyyət uğrunda mübarizənin və Azərbaycanda ara müharibələrinin daha da kəskinləşməsinə səbəb oldu. Yaranmış əlverişli şəraitdən istifadə edən II İrakli İrəvan xanı Hüseynəli xandan yenidən bac tələb etdi. Hüseynəli xan isə buna rədd cavabı verdi. II İrakli 1779-cu ilin sentyabrında 20 minlik qoşunla yenidən İrəvan xanlığına yürüş etdi [53,22; 159,112]. Hüseynəli xan Osmanlı imperiyasının dəstəyinə arxalanaraq Gürcüstana köçürülmüş ailələrin geri qaytarılmasını tələb etdi. Axalsıxlı Süleyman paşanın vasitəçiliyi ilə Hüseynəli xanla II İrakli arasında sülh danışıqlarına başlandı [214, 68-69]. II İrakli əvvəlcə sülh danışıqlarını yubatdı.* Lakin hadisələr sonradan elə cərəyan etdi ki, Kartli-Kaxeti çarı sülh müqaviləsinin bağlanması üçün

* Rus tarixçisi T.Q.Butkovun əsərində II İrakli ilə İrəvan xanı arasında sülh müqaviləsinin 1780-ci il mayın ortalarında bağlanması haqqında məlumat verilir [bax: 41,II,75]. Lakin İrəvan xanı Hüseynəli xanla II İrakli arasında gedən danışıqlar dəfələrlə baş tutmamışdı. Bu danışıqlarda İrəvan xanının oğlanları Məhəmməd bəy və Qulaməli xan iştirak etmişdi. Nəhayət, bu sülh müqaviləsinin bağlanması 1781-ci ilin noyabrında baş tutdu [bax: 214,71,72,73].

özü addım atmalı oldu. Səbəblər aşağıdakılar idi: əvvəla, İrəvan xanı heç də, erməni tarixçisi V.R.Qriqoryanın yazdığı kimi, gürcü çarından yarımasılı [214,73] vəziyyətdə deyildi. Müstəqil xarici siyasət* yeridən Hüseynəli xan Qacar digər Azərbaycan xanları ilə yaxınlaşıb II İraklidən heç bir asılılığı olmadığını bildirmişdi. Bundan xəbər tutan II İrakli Azərbaycan xanlarından ehiyat edərək Hüseynəli xana olan münasibətini dəyişməyə məcbur oldu [214,72]. Bu zaman II İraklinin İrəvan xanlığına zahiri münasibətinin dəyişməsinin digər səbəbi** qarabağlı İbrahimxəlil xanın Xoy xanlığına olan hücumu idi [214,72].

1781-ci ilin martında II İraklı İrəvan xanının hüzuruna mərhum şahzadə Levanın vəziri Georgini göndərdi. O, bir müddət İrəvanda qaldıqdan sonra Tiflisə qayıtdı, lakin çox keçmədən ikinci dəfə təkrar İrəvana döndü [214,72]. Nəhayət, 1781-ci ilin noyabrında İrəvan xanlığı ilə Kartli-Kaxeti çarlığı arasında sülh müqaviləsi bağlandı. II İrakli ildə 30 min tümən ödənc almaqla Gürcüstana əsir olaraq aparılmış dinc əhalini geri qaytarmağa razılıq verd [41, II, 75; 115, 63; 214, 73]. Lakin II İraklinin Azərbaycan torpaqlarına, o cümlədən İrəvan xanlığına olan təcavüzkar niyyəti davam etməkdə idi. 1782-ci ilin sonlarında II İrakli Rusiya imperatriçası II Yekaterinaya (1762-1796) məktub yazaraq Kartli-Kaxeti çarlığının Rusiyanın himayəsinə qəbul edilməsini xahiş etdi. II İrakli Rusiya hökumətindən onun İrəvan və Gəncə xanlıqlarının ərazisinə yiyələnməsinə kömək etməsini xahiş etdi, əvəzində Rusiyanın Türkiyə və İranla aparacağı müharibələrdə öz köməyini əsirgəməyəcəyinə söz verdi [166, 167]. Bundan

* 1781-ci ildə xoylu Əhməd xanın Naxçıvan xanlığına hücumuna etiraz edən İrəvan xanı Hüseynəli xan Qacar ona hədələyici məktub göndərərək öz ordusunu təcili Naxçıvan qalasından uzaqlaşdırmasını tələb etdi. İrəvan xanı öz məktubunda Naxçıvan xanlığına özü sahib olmaq istədiyini bildirdi [115, 62].

** Təbiidir ki, II İrakli İbrahimxəlil xanın müttəfiqi olduğu üçün bu yürüşdə ona hərbi qüvvə ilə yardım etməli idi. Bundan başqa, II İrakli özü Xoy xanlığını təsir dairəsinə almaq məqsədilə oraya qoşun yeritməyə hazırlaşırdı. Bu qoşun İrəvan ərazisindən — Qırxbulaqdan keçməli idi. [bax: 214,72]. Bütün bunlara görə sülh danışıqları sürətləndi və razılaşma əldə edildi.

əlavə, gürcü çarı Rusiya imperiyasına tövsiyə edirdi ki, Azərbaycan xanlıqlarını ələ almaq üçün "mehriban himayəçi" rolunu oynasın. General P.Potyomkin 1783-cü il mayın 3-də knyaz Q.Potyomkinə verdiyi məlumatda bildirirdi ki, II İraklı və Reyneqs (Rusiyanın İrəvandakı casusu — ***red.***) generaldan müqavilənin (Georgiyevsk traktatının — ***red.***) bağlanmasından əvvəl Cənubi Qafqaz xanlarına onları Türkiyədən qorumaq məqsədilə fərmanlar göndərməsini xahiş etmişdir [214, 82].

Rusiya imperiyası da, öz növbəsində, Cənubi Qafqazı işğal etmək, xüsusilə də Azərbaycan xanlıqlarını ələ keçirmək və Osmanlı dövlətinin burada nüfuzunun güclənməsinə yol verməmək üçün xristian dini amilindən, ilk növbədə gürcü çarlarından istifadə etmək siyasəti yeridirdi. Elə buna görə də gürcü çarı 1783-cü il iyulun 24-də (avqustun 4-də) Georgiyevsk şəhərində Rusiyanın himayəsinə keçmək haqqında saziş imzaladı [41, h.II, s.11; 166, 168-171].

İrəvan xanlığının xarici siyasətinin ***ikinci mərhələsi*** xanlıq üçün olduqca ağır və mürəkkəb bir dövrə təsadüf edir. Georgiyevsk müqaviləsinin bağlanmasından sonra Rusiya tərəfindən gizli şəkildə planlaşdırılan siyasətin — Azərbaycan torpaqlarında, o cümlədən İrəvan xanlığı ərazisində erməni dövləti yaradılması siyasətinin həyata keçirilməsi üçün real addımlar atılmağa başlandı. Məhz bu təcavüzkar niyyətin qarşısını almaq üçün bəhs edilən dövrdə İrəvan xanlığının xarici siyasətində aparıcı xətti Osmanlı dövləti ilə münasibətlər təşkil edir.

Rusiya imperiyası çoxsaylı xanlıqlara və sultanlıqlara parçalanmış Azərbaycanı işğal edərək, nəhayət, özünün regionla və bütövlükdə Şərq ölkələri ilə bağlı işğalçılıq planlarını reallaşdırmaq istəyirdi. Rusiya Osmanlı dövləti ilə həmsərhəd olduğuna və onunla yaxşı münasibətlər saxladığına görə İrəvan xanlığını daim diqqət mərkəzində

saxlayırdı. Çar Rusiyası bu xanlığı ələ keçirib onun ərazisindən Osmanlı dövlətinə qarşı hərbi istinadgah kimi istifadə etmək istəyirdi.*

Rusiyanın himayəsini qəbul etmiş II İrakli Azərbaycan torpaqlarını, o cümlədən İrəvan xanlığını ələ keçirmək üçün daha fəal işğalçılıq siyasəti yeritməyə başladı. Kartli-Kaxeti çarının İrəvan xanlığı ilə bağlı təcavüzkar niyyəti Osmanlı dövlətini narahat etməyə bilməzdi. Qeyd olunan dövrdə Türkiyənin Azərbaycan xanlıqları ilə qarşılıqlı münasibətində İrəvan xanlığı mühüm yer tuturdu [166, 205].

Rusiya özünün Cənubi Qafqazda işğalçılıq siyasətini həyata keçirmək məqsədilə Azərbaycan xanlarını müxtəlif yollarla öz tərəfinə çəkməyə çalışırdı. İmperiya siyasətçiləri bir tərəfdən Azərbaycan xanlarına "xəbərdarlıq" edir, hədə-qorxu gəlir, İrəvan, Xoy və Təbriz xanlarının saraylarına elçilər və hədiyyələr göndərir, digər tərəfdən isə Georgiyevsk sazişindən istifadə edərək hərbi Gürcüstan yolu vasitəsilə Cənubi Qafqazda hərbi hazırlıq işlərini daha da gücləndirirdilər [20, 85; 21, 66; 125, 55]. Məhz bu səbəbdən, Georgiyevsk müqaviləsi bağlandıqdan sonra Osmanlı dövləti ilə yaxın münasibətdə olan bəzi Azərbaycan xanları, o cümlədən irəvanlı Hüseynəli xan Rusiya dövlətindən ehtiyat edərək osmanlılara soyuq münasibət bəsləyir, hətta sultan tərəfindən göndərilən hədiyyələri belə çətinliklə qəbul edirdi [125,54]. II Yekaterina Cənubi Qafqazda işğalçılıq planını gerçəkləşdirmək üçün müxtəlif vasitələrdən istifadə edirdi. Bu məqsədlə hələ 1782-ci ilin sonlarından İrəvan xanlığına göndərilən doktor

* Rusiyanın hakim dairələri İrəvan xanlığını tutmağı asanlaşdırmaq üçün dini amildən də istifadə etmək niyyətində idilər. Həmin dövrdə bunun üçün əlverişli şərait də yaranmışdı. Azərbaycan hökmdarlarının himayəsindən istifadə edərək ölkənin qərbində — İrəvan xanlığının ərazisində möhkəmlənmiş Qriqorian kilsəsi Avropada özünə dayaq tapmadığından üzünü Rusiyaya çevirmişdi. Asiya qitəsinə vaxtılə Balkan yarımadasından köçüb gəlmə ermənilər, erməni kilsəsi və erməni işbazları hələ I Pyotrun dövründən başlayaraq Rusiyanın köməyi ilə Azərbaycan torpaqları hesabına özlərinə daimi məskənlər və dövlət yaratmaq, qondarma "Böyük Ermənistan"ı dirçəltmək xülyasına düşmüşdülər. Bu proses II Yekaterina dövründə daha da intensivləşdi [bax: 126].

Y.Reyneqs* hətta irəvanlı Hüseynəli xanın etibarını qazanaraq İrəvan qalasının planını da çəkə bilmişdi [37, sənəd 132, s.215-217; 126,153]. Bununla qane olmayan Rusiya hökuməti 1783-cü ilin payızında qraf Apraskini İrəvana göndərdi. İrəvan xanı Hüseynəli xan Qacarın 1783-cü ilin oktyabrında P.S.Potyomkinə göndərdiyi cavab məktubundan bəlli olur ki, qraf Apraksinin məqsədi İrəvan xanını II İrakliyə itaət etməklə, bir növ, Rusiyanın tabeliyinə keçməyə çağırmaq idi. Hüseynəli xan bu təklifi bəyəndiyini bildirsə də [37, sənəd 170, s.265-266], qəti addım atmadı.

XVIII əsrin II yarısına aid arxiv sənədlərində, habelə digər ilk mənbələrdə göstərilir ki, II İrakli Rusiyanın himayəsini qəbul etdikdən sonra Azərbaycan xanlarına könüllü surətdə Gürcüstana, dolayı yolla isə Rusiyaya itaət göstərməyi təklif edirdi. Bu təklifə razı olmayacaqları halda onlara hərbi güclə hədə-qorxu gəlinirdi [125,55]. Azərbaycan xanları isə müstəqilliklərini itirməmək naminə gah Rusiya, gah da Osmanlı dövləti ilə əlaqəyə girirdilər.

Bəhs olunan dövrdə İrəvan xanı öz müstəqilliyini itirməmək, yaxınlaşan Rusiya təhlükəsindən qorunmaq məqsədilə Osmanlı dövlətinə müraciət etdi. Cənubi Qafqazda öz maraqlarını qorumağa çalışan Osmanlı dövləti İrəvan xanının müraciətinə biganə qalmadı. Xanın müraciətindən dərhal sonra sultanın əmri ilə gizli surətdə İrəvana üç nəfər nümayəndə göndərildi. Onlar irəvanlıları möhkəm durmağa çağırır və onlara kömək üçün İstanbuldan Qarsa xeyli top gətirildiyini bildirirdilər [81, v.360]. Türkiyədən İrəvan xanına göndərilən məktublardan birində yazılırdı: "Siz irəvanlılar təbiətcə türksünüz. Əgər bəd qüvvələr İrəvan qalasını almaq istəsələr, müdafiə olunaraq dinimizin qanunlarını qorumalısınız. Sultan Qars, Bayazid paşalarına si-

* Y.Reyneqs knyaz Q.A.Potyomkinin tapşırığı ilə Tiflisdə gizli kəşfiyyat işləri ilə məşğul olurdu. Milliyyətcə fransız, ixtisasca həkim olan Y.Reyneqs əslində Rusiyanın İrəvan xanlığında casusu idi [bax: 37, sənəd 132, s.215-217; 126, 153].

zi həmişə müdafiə etməyi tapşırmışdır. Ən qədim dövrlərdən biz qonşu və dost olmuşuq. Biz həmişə dinimizin qanunlarını qorumağa hazırıq" [81, v.331]. Axalsıxlı Süleyman paşanın irəvanlı Hüseynəli xana göndərdiyi başqa bir məktubda isə deyilirdi: "...Böyük hökmdarımız Sultanın və vəzir Həsənin göstərişinə əsasən qapıçıbaşı Məhəmməd Səlim bəy vasitəsilə sizə və Azərbaycanın başqa xanlarına pul və hədiyyələr göndərirəm. Allahın köməyi ilə biz həmişə sizinlə dost olacağıq və bu dostluğu nəyin bahasına olursa-olsun qoruyub saxlamalıyıq. Sizə nə lazımdırsa, əmr edin" [81, sənəd 366, v.209].

Rusiya imperiyasının Cənubi Qafqazla bağlı öz işğalçılıq planlarını gürcü çarı II İrakli vasitəsilə həyata keçirməsi Osmanlı sarayına yaxşı məlum idi. Bunu Osmanlı sultanının İrəvan xanına göndərdiyi bir məktub da təsdiq edir: "Bizə gəlib çatıbdır ki, Tiflis çarı Rusiya ilə birləşərək Azərbaycan xanlarının arasını vurmağa, onların arasında Rusiyaya meyil yaratmağa çalışır. Siz bizimlə birləşməyə səy edin. Bizim məqsədimiz odur ki, çar İrakli sizə zərər vura bilməsin" [81, sənəd 331, v. 54-55].

Yeri gəlmişkən, Osmanlı dövləti ilə İrəvan xanlığı arasındakı yaxınlaşma artıq Rusiya imperiyasının hakim dairələri ilə əlaqəyə girmiş və onlar tərəfindən dəstəklənən gəlmə erməniləri də təşvişə salmışdı. Artıq onlar xanlıq ərazisində baş verən hadisələr barədə Rusiya imperiyasının müxtəlif strukturlarına məxfi məlumatlar çatdırırdılar. Bu zaman Rusiyanın İrəvandakı baş casusu Stepan Saakyan (rusdilli sənədlərdə Stepan Saakoviç Popov — ***red.***) idi [159, 113].

Osmanlı dövlətinin Rusiyanın Cənubi Qafqazda işğalçılıq planlarının qarşısını almaq üçün gördüyü tədbirlər II İraklini də narahat edirdi. O, bu barədə öz sarayında olan Rusiya nümayəndəsi polkovnik Stepan Burnaşevi müntəzəm məlumatlandırırdı [1, 17; 125, 55]. Göründüyü kimi, Rusiyanın Cənubi Qafqazda işğalçılıq planlarını həyata keçirməsində əsas dayağı gürcü çarları və bir də erməni işbazları idi.

Yaranmış beynəlxalq şəraitdə İrəvan xanı Hüseynəli xan müəyyən diplomatik danışıqlardan sonra digər Azərbaycan xanları ilə əlaqələrini möhkəmləndirdi və onların Türkiyə dövlətinə meyillərinin güclənməsinə nail ola bildi. Bu barədə irəvanlı Hüseynəli xanla xoylu Əhməd xan birgə məktub yazaraq Qars hakimi Əli paşa vasitəsilə Osmanlı sarayına müvafiq məlumat da verdilər [bax: 125, 89]. Əli İrəvan xanlığından üzülmüş II İrakli Hüseynəli xanı hakimiyyətdən devirmək üçün onun qardaşı Məhəmmədhəsən xanla məxfi sazişə girdi [115, 69].

1783-cü il noyabrın 9-da Hüseynəli xan Qacar xəstələnərək vəfat etdi.* Xanın vəsiyyətinə əsasən hakimiyyətə böyük oğlu, 15 yaşlı Qulaməli xan Qacar gəldi [37, 267; 159, 114]. Hüseynəli xanın ölümü xanlıqda vəziyyəti kəskinləşdirdi. II İrakli fürsətdən istifadə edərək öz qaynı Baqrationu qoşunla İrəvana göndərdi. Lakin İrəvana yaxınlaşan Baqration artıq Hüseynəli xanın böyük oğlu Qulaməli xanın taxta çıxdığını eşidərək hücumu davam etdirməyib geri döndü [115,69-70]. Beləliklə, Rusiyaya arxalanan gürcü çarının İrəvanla bağlı növbəti hiyləsi də baş tutmadı.

Dövrün ilk mənbələri Georgiyevsk müqaviləsinin bağlanmasından sonra Rusiyaya arxalanan II İraklinin Azərbaycan xanlıqlarına, o cümlədən İrəvan xanlığına qarşı işğalçılıq niyyətinin daha da güclənməsini sübut edir. Qeyd olunan dövrdə Azərbaycan xanlarının II İraklinin təcavüzü ilə bağlı Osmanlı sultanına göndərdiyi məktuba [20, 62; 21, 87; 125, 54-55] əsaslanaraq 1783-cü ilin noyabrında Çıldır valisi Süleyman paşa tərəfindən hazırlanmış bir sənəddə qeyd olunur ki, İrəvan xanı Hüseynəli xanın vəfatından sonra II İrakli Rusiya

*İrəvan xanı Hüseynəli xanın ölümü ilə bağlı müxtəlif məlumatlar var. Bəzi tədqiqatçıların fikrincə, Hüseynəli xan İrəvanda baş verən üsyan nəticəsində öldürülmüşdür [115, 69]. Mənbələr isə təsdiq edir ki, Hüseynəli xan ağır xəstəlikdən sonra vəfat etmişdir [bax: 37, 274; 214, 81]. Yeri gəlmişkən, Hacı Hüseynəli xan mömin bir insan olmuşdur. Çünki xanın cənazəsi Bağdada aparılaraq orada dəfn edilmişdir [bax: 37, 274; 159, 268] .

hərbçilərinin köməyi ilə İrəvan qalasını ələ keçirmək niyyətindədir [20, 72-74; 125, 55].

Osmanlı dövlətinin Azərbaycan xanları, o cümlədən İrəvan xanı ilə yaxınlaşması nəticəsində özünün Cənubi Qafqaz siyasətinin iflasa uğrayacağından ehtiyat edən çar Rusiyası 1783-cü ilin sonlarında bölgədə hərbi qüvvələrinin sayını artırmağa başladı. Tiflisə və Kaxetiyə yeni hərbi qüvvələr göndərdi. Burada yerləşən hərbi hissələrə Rusiyadan çoxlu top və digər hərbi sursat gətirildi və daha 35 min əsgərin göndəriləcəyi planlaşdırıldı [20, 88; 125, 55].

Osmanlı dövlətinin İrəvan xanlığı ilə həmsərhəd bölgələrinin paşaları İrəvan xanı və Azərbaycanın digər xanları ilə razılığa gələrək Rusiya tərəfindən gözlənilən təhlükənin qarşısını almaq üçün hərbi hazırlıq görməyə başladılar. Tiflisdəki rus qoşunlarının komandanı S.Burnaşev 1784-cü il fevralın 9-da P.S.Potyomkinə məktubunda bildirirdi ki, Axalsıx, Qars, Ərzurum və Bayazid paşalıqlarının nümayəndələri İrəvan şəhərində Qulaməli xanın yanındadırlar; onlar İrəvan xanlığı ilə Osmanlı dövləti arasında daha yaxın münasibət yaratmaq və xanın köməyilə Azərbaycanın digər xanlıqlarını da Rusiya və Gürcüstanın əleyhinə qaldırmağı planlaşdırırlar. S.Burnaşev bunun qarşısını almaq üçün çariçənin mütləq tədbir görməsini P.S.Potyomkindən xahiş edirdi [1, 17; 125, 56]. Bundan əlavə, Rusiyanın Ənzəlidəki konsulu Tumanovski 1784-cü ilin aprelində yazdığı məktubunda bu hazırlıq barədə Həştərxan qubernatoru Jukova ətraflı məlumat verirdi. Onun yazdığına görə, Ərzurum və Bayazid paşaları Gürcüstana hücum etmək üçün xeyli qoşun toplayaraq Azərbaycan və Dağıstan hakimlərini də bu işə cəlb etməyə çalışırlar. Onlar bu yürüşdə iştirak edəcək döyüşçülərin hər birinə ildə 200 rubl verməyi vəd etmişlər [115, 73-74].

Yaranmış vəziyyətlə bağlı II İrakli də təşvişlə polkovnik S.Burnaşevə məlumat verir, o da, öz növbəsində, bu məlumatı general P.Potyomkinə çatdırırdı. S.Burnaşevin P.Potyomkinə göndərdiyi 1784-cü il 16 fevral tarixli məruzəsində Axalsıx paşası Dədəgül ağanın müəyyən təkliflərlə İrəvan xanının yanına gəlməsi xəbəri verilir. Bu təkliflər əsasən xristianların qüvvə toplamasına imkan verməmək, Rusiya qoşunlarını Cənubi Qafqaza dəvət etdiyi üçün II İraklinin üzərinə hücum etmək məqsədilə Azərbaycanın digər xanları ilə birləşmək və s.-dən ibarət idi [78, h.VII, v.173; 214, 83].

Qeyd olunan dövrdə Osmanlı dövlətinin nümayəndəsi Xəlil əfəndi Azərbaycan xanları və Dağıstan hakimləri ilə görüşüb bir müddət İrəvanda qaldı [166, 203; 115, 74].

Xəlil əfəndinin tövsiyəsi ilə irəvanlı Qulaməli xan II İrakliyə bac verməkdən imtina etdi [20, 84, 85, 296; 124, 189] və hətta digər Azərbaycan xanlarına da yardım göstərdi. S.Burnaşev 1784-cü il martın 26-da göndərdiyi məruzəsində İrəvan xanının naxçıvanlı Abbasqulu xana yardım* göstərməsi haqqında məlumat verir [214, 84], P.Potyomkinə ünvanladığı digər məxfi məktubda isə yazırdı: "İrəvan xanı Qulaməli xanın çara (II İrakliyə — ***red.***) münasibəti birdən-birə də - yişmişdir və indi o, türklərə meyillidir" [1, 110; 125, 56]. General P.Potyomkinin 1784-cü il 2 mart tarixli gizli təqdimatına əsasən, polkovnik S.Burnaşev II İrakli ilə İrəvanın alınması məsələsini müzakirə edir. Lakin II İrakli İrəvanın alınması üçün lazımi ordunun olmadığını bildirir [78, h.VII, v.245; 214, 87]. Bu, bir daha İrəvan qalasının alınmazlığını, xanlığın hərbi-strateji mövqeyinin güclü olduğunu sübut edir.

General Potyomkin bir gürcü zadəganı vasitəsilə İrəvan xanına qarşı qəti tədbirlər görmək üçün polkovnik S.Burnaşevə yazılı əmr

---

* Bu zaman Naxçıvan xanı Abbasqulu xan hakimiyyətdən devrilmişdi, İrəvan xanı Hüseynəli xan ona sığınacaq vermişdi [bax:115,49-53;214,84-85].

göndərir. Generalın əmrini alan S.Burnaşev II İraklinin yanına məsləhətləşməyə gedir [214, 86-87]. İrəvan xanlığına təcavüzün elə də asan olmadığını başa düşən II İrakli öncə diplomatik vasitələrə* əl atır. Lakin bunun ciddi nəticə vermədiyini görən Rusiya hakim dairələri və gürcü çarı digər vasitələrə əl atır. Belə ki, 1784-cü ilin yayında Qulaməli xana sui-qəsd təşkil olunur və xan qətlə yetirilir.** Hakimiyyətə xanın 12 yaşlı oğlu Məhəmməd xan Qacar gəlir [166, 205; 215, 74]. Qars mühafizi Mustafa paşanın məlumatına görə, "Yaranmış real təhlükə qarşısında İrəvan xanının Osmanlı dövləti ilə yaxınlaşması nəticəsində bölgədəki ruslar və onların müttəfiqi olan gürcü çarının hiylələri nəticəsində Qulaməli xan qətlə yetirildi" [125; 56-57]. Arxiv sənədləri də İrəvan xanına qarşı törədilən qəsdin hansı istiqamətdən hazırlandığını aydın göstərir. 1784-cü ildə rus canişini Mixail Markov polkovnik S.Burnaşevə göndərdiyi məktubunda İrəvanla bağlı yazırdı: "…yaranmış əlverişli şəraitdən istifadə edərək, çar (II İrakli — ***red.***) nəyi isə bəhanə gətirərək oranı (İrəvan xanlığını — ***red.***) ordu ilə ələ keçirməlidir" [1, 15; 125, 56].

İrəvan xanlığına rus-gürcü hərbi müdaxiləsinin qarşısını almaq üçün Osmanlı hökuməti təcili tədbir gördü. Osmanlı dövlətinin dəstəyi ilə xoylu Əhməd xan dərhal öz kürəkəni, keçmiş İrəvan xanı Hüseynəli xanın 12 yaşlı oğlu Məhəmməd ağanı (1784-1805) İrəvan taxtına çıxardı [115, 71; 124, 191]. Sultan I Əbdülhəmid (1774-1789) yeni İrəvan xanı ilə sıx münasibətlər yaradılmasını diqqət mərkəzinə götürdü. Sultan Ərzurum paşasına pul, Axalsıx, Qars və Bayazid paşalarına fərmanlar göndərərək onlara İrəvanı II İraklinin təcavüzün-

---

* Hüseynəli xanın ölümündən bir neçə ay keçməsinə baxmayaraq, oğlu Qulaməli xanın hələ də yas libasını çıxarmadığını nəzərə alan II İrakli adətə uyğun olaraq ona rəngli libaslar göndərir və kəşfiyyat üçün bu fürsətdən istifadə etmək qərarına gəlir [bax: 214, 87].

** Qulaməli xanın qətli ilə bağlı müxtəlif məlumatlar var: 1.1784-cü il iyunun 7-də Bünyatəli bəy adlı bir nəfər İrəvan meydanında Qulaməli xanı və onun iki qulluqçusunu odlu silahla qətlə yetirmişdir [bax:159,266-267]; 2. 1784-cü ilin yayında xalqla qəddar rəftarına görə Qulaməli xan qardaşı ilə birgə İrəvanda baş vermiş iğtişaşlar zamanı öldürülmüşdür [bax: 166,205].

dən qorumağı tapşırdı. Fərmanda xoylu Əhməd xanın birləşmiş qoşunların baş sərkərdəsi təyin edildiyi, bütün paşa və vəzirlərə İrəvan xanına kömək etmələri tapşırıldı [81, siy.1/194, sənəd 336, h.VIII, v.54-55; bax: 166, 206; 124, 192]. İrəvan xanlığının Osmanlı dövləti ilə yaxınlaşması rus-gürcü siyasətinə ağır zərbə vura bilərdi. Məhz buna görə II İrakli İrəvana iki min nəfərlik qoşun göndərdi. O.P.Markovanın yazdığına görə, İrəvan xanı tələsik axalsıxlı Süleyman paşaya bildirdi ki, o, II İrakliyə xidmət edəcəkdir. Bununla da tərəflər arasındakı gərginlik müvəqqəti olaraq sakitləşdi [166, 206; 115, 75].

Lakin ilk mənbələrin məlumatları göstərir ki, İrəvan xanı Məhəmməd xan Qacarın bu mövqeyi müvəqqəti diplomatik gediş idi. Çox keçməmiş, 1784-cü il sentyabrın 28-də Məhəmməd xan II İraklinin İrəvan qalasına hücum təhlükəsi qarşısında Osmanlı dövlətinə məktubla müraciət etdi. Çıldır valisi, Qars mühafizi və Bayazid hakimləri xoylu Əhməd xanla birləşib II İrakliyə qarşı birlikdə çıxış etmək üçün danışıqlar apardılar [20, 93; bax: 125, 57]. Bunun ardınca Məhəmməd xan, digər Azərbaycan xanları və Ərzurum valisi Bayazid hakimi ilə birləşib düşmənin hücumuna qarşı hazır olduqları barədə Osmanlı sarayına yenidən rəsmi məlumat göndərdilər [20, 32; 125, 57].

Bu müraciətlərin qarşılığı olaraq 1784-cü ilin payızında Cənubi Qafqaza İstanbuldan çoxsaylı (60 nəfər) nümayəndə heyəti göndərildi. Onlar Azərbaycan xanlarına və Dağıstan hakimlərinə qiymətli hədiyyələrlə yanaşı Sultan Əbdülhəmidin fərmanını da gətirmişdilər. Fərmanda sultan bütün Cənubi Qafqaz müsəlmanlarını Rusiya təcavüzü qarşısında birləşməyə və müqəddəs müharibəyə hazır olmağa çağırırdı [81, siy.1/194, sənəd 350, h.II, v.4; bax: 115, 75].

Cənubi Qafqazda Rusiyanın və onun əlaltısı olan gürcü çarının açıq müdaxilə siyasətinə başlaması Osmanlı dövlətini daha konkret addımlar atmağa sövq etdi. Rusiyadakı ermənilərin dini başçısı H.Arqutyan 1785-ci il fevralın 25-də Stepan Saakova göndərdiyi məktubunda Qarabağ və Xoy xanlarının Axalsıx paşası vasitəsilə sultandan hədiyyə və məktub aldıqları barədə xəbər verdi. Sultanın məktubunda yazılırdı: "..sizə birləşməyi və İrəvanın düşmən əlində qalmaması üçün onu ələ keçirməyə cəhd etməyi təklif edirəm, bunun üçün istədiyiniz qədər qüvvə və pul ala bilərsiniz" [bax: 214, 115].

Azərbaycan xanlıqları ilə Osmanlı dövləti arasında siyasi əlaqələrin güclənməsi ermənilərin təşvişinə səbəb oldu. Çünki bu, Azərbaycanın tarixi torpaqları hesabına ermənilərə "dövlət yaradılması" planının baş tutmasına ciddi əngəl törədə bilərdi. Erməni müəllifi A.İoannisyanın yazdığına görə, İ.Arqutinskinin Axalsıxdan gəlmiş qardaşı oğlu xəbər verirdi ki, osmanlılar məktub və pul göndərərək Azərbaycan xanlarını rus qoşunlarına müqavimət göstərməyə, habelə Gürcüstan əleyhinə çıxmağa çağırmışdı. Eyni zamanda osmanlılar Qarabağ və Xoy xanına məsləhət görmüşlər ki, ruslara İrəvan şəhərini almağa imkan verməsinlər [159, 134-135].

İrəvan xanlığına birbaşa təcavüz etməkdən əli çıxan II İrakli digər vasitələrə əl atır. O, 1785-ci ilin payızında Gürcüstana yürüş edən Azərbaycanın Car-Balakən hakimi Ömər xanın* qoşunlarını İrəvan istiqamətinə göndərməyə çalışsa da, bu, mümkün olmur [214,135].

Ömər xanın yürüşündən bir qədər keçdikdən sonra İrəvan xanlığının alınması üçün yeni planlar hazırlanır. 1787-ci il mayın əvvəlində II İrakli P.Potyomkini xəbərdar edir ki, Xoy xanı, Car-Balakən hakimi Ömər xan və Qarabağ xanı İbrahimxəlil xanla birlikdə İrəvanı almaq qərarına gəlmişlər [78,v. 469; bax: 159,182].

* Car-Balakən hakimi və ya Avar xanı Ömər xanın adı rusdilli sənədlərdə "Omar xan" yazıldığı halda [bax: 24, f. VUA 482. op.144, d. 41481; op. 148, d. 41929] Azərbaycan dilinə tərcümədə səhv olaraq Ümmə xan kimi verilir.

Bütün bu tədbirlər Osmanlı dövləti tərəfindən sakit qarşılanmadı. 1787-ci ilin iyununda Xoyda yenicə hakimiyyətə gəlmiş Hüseynqulu xana göndərilən sultan fərmanında deyilirdi: "Tiflis valisi rusları Azərbaycanı və bizim torpaqları qarət etmək üçün dəvət etmişdir. …Biz heç zaman İrəvanın qarət olunması və dağıdılması ilə razılaşa bilmərik. Odur ki, ehtiyac olarsa, Bayazid, Van və Muşun rəislərinə sizə qoşun göndərməyi əmr etmişik. Əgər Tiflis valisi sərhədi keçmək fikrinə düşsə, o zaman sizə Ərzurum paşası Mustafa kömək edəcəkdir" [79, iş 4252,v.126].

Osmanlıların hərbi fəallığının artmasından xəbər tutan Qafqazdakı rus qoşunlarının komandanı general P.S.Potyomkin türklərin İrəvan istiqamətində hücum edəcəkləri halda necə hərəkət etməli olduğu barədə mərkəzə sorğu göndərdi [79, iş 4252, v.126].

Polkovnik S.Burnaşev 1787-ci il 8 iyul tarixli məktubunda general P.S.Potyomkinə bildirirdi ki, onun məlumatlarına görə, Osmanlı sultanı Azərbaycan xanlarını həmişə müdafiə edəcək, İrəvan şəhəri Azərbaycana məxsus olduğundan onun heç zaman Gürcüstanın tabeliyinə verilməsinə razı olmayacaqdır. Bundan əlavə, sultan Ərzurum paşasına və digər həmsərhəd paşalara nəyin bahasına olursa-olsun rus qoşunlarının qarşısına çıxmağı əmr etmişdir. Regionda siyasi durumun gərginləşməsi ilə əlaqədar Ömər xan, qarabağlı İbrahimxəlil xan və digər Azərbaycan xanları İrəvanı qəti surətdə gürcülərin təzyiqlərindən xilas etmək üçün birləşmişlər [81, siy.1/194, sənəd 416, h.I, v.354; 115, 77-78].

1787-1791-ci illər Rusiya — Osmanlı müharibəsi zamanı da Rusiyaya arxalanan II İrakli Azərbaycan xanlıqlarına qarşı öz işğalçılıq siyasətini davam etdirməkdə idi. Belə ki, Georgiyevsk müqaviləsinə əsaslanan II İrakli 1787-ci il noyabrın 22-də Qafqazdakı rus qoşunlarının komandanından yardım istədi. Rusiyadan alacağı köməyə

ümid bağlayan gürcü çarı İrəvanı ələ keçirmək və Azərbaycan xanlarına qarşı yenidən hücuma keçmək niyyətində idi [20, 122; bax: 125,82-83]. Bunu başa düşən irəvanlı Məhəmməd xan 1787-ci il noyabrın 26-da yaxınlaşan təhlükəyə qarşı öz elçisi Zeynalabdin vasitəsilə Osmanlı sultanından yardım istədi. Elə həmin ilin dekabrında İrəvan xanlığının elçiləri İstanbulda səmimi qarşılandı və onun xahişi müsbət qarşılandı [19, b. № 9, 6, 71; 125, 83]. Sultan vəziyyətin ciddiliyini və müraciətin əhəmiyyətini nəzərə alaraq İrəvanı "əl-Rumun (Türkiyənin — ***red.***) kilidi və Azərbaycanın Dərbəndi" adlandırmışdı [11; 15, 215; 20, 123, 324; 124, 222]. Beləliklə, İrəvan xanlığının xarici siyasətinin ikinci mərhələsində Osmanlı dövləti ilə qarşılıqlı münasibətlər önəmli yer tutur.

XVIII yüzilliyin 90-cı illərinin ortalarında İrəvan xanlığı cənubdan daha bir güclü təhlükə ilə üz-üzə qaldı. Məlum olduğu kimi, Kərim xan Zəndin ölümündən sonra İranda hakimiyyəti Azərbaycan-türk tayfası qacarlardan olan Ağa Məhəmməd xan ələ keçirdi. Onun ata-babaları vaxtilə I Şah Abbas tərəfindən Azərbaycandan İranın Astrabad vilayətinə köçürülmüşdü. Ağa Məhəmməd xan öz şahlıq iddiasını rəsmiləşdirmək üçün səfəvilərin və Nadir şahın idarə etdikləri bütün keçmiş əraziləri, o cümlədən Cənubi Qafqazı ələ keçirməyə çalışırdı. Bu siyasət eyni zamanda müstəqil Azərbaycan xanlıqlarına qarşı da çevrilmişdi. Qacar 1795-ci ilin yazında Şimali Azərbaycana və Gürcüstana hərbi yürüşə başladı.

Ağa Məhəmməd xanın güclənməsi ilə müstəqillikləri cənub tərəfdən də təhlükə altına düşən Azərbaycan xanlıqlarının qonşu dövlətlərlə diplomatik münasibətləri daha da genişləndi. Qarabağlı İbrahimxəlil xan və irəvanlı Məhəmməd xan Osmanlı dövlətindən yardım almaq üçün 1789-1790-cı illərdə İstanbulda danışıqlar aparmaq üçün öz elçilərini Çıldır valisinin yanına göndərdilər [12; 124, 229].

Ağa Məhəmməd şah yürüş ərəfəsində Şimali Azərbaycan xanlarına fərmanlar göndərərək ona tabe olmalarını və itaət əlaməti olaraq girovlar verməlerini tələb etdi. Şahın Cənubi Azərbaycandakı hərəkətlərini yaxından izləyən İrəvan xanı onun yaxın müddətdə Şimali Azərbaycana yürüş edəcəyini yəqin etmiş və Qars mühafizinə göndərdiyi məktubunda bu barədə məlumat vermişdi. Qars mühafizi də öz növbəsində İstanbula xəbər çatdırmış, Ağa Məhəmməd şahın İrəvan üzərinə yürüş edəcəyi halda Qars ətrafındakı bölgədən xeyli köçkün olacağı üçün əlavə qüvvə və hərbi təchizat göndərilməsini istəmişdi [20, sənəd 43, 134-135; bax: 124, 229].

Ağa Məhəmməd xanın güclənməsi ilə bağlı Azərbaycanda baş verənləri Osmanlı dövləti də diqqətlə izləyirdi. Belə ki, Qars mühafizi Kamal paşa hələ 1791-ci ildə Osmanlı sarayına göndərdiyi məktubda göstərirdi ki, Ağa Məhəmməd xan Təbrizdən 6 saatlıq məsafədə olan Müşki ənbər çölünə gələrək Cənubi Azərbaycan xanlarından bir neçəsini özünə itaət göstərməyə razı salmışdı. O, irəvanlı Məhəmməd xanın da yanına gəlməsini tələb etmişdi. Lakin Məhəmməd xan özü getməmiş, qardaşını hədiyyələrlə onun hüzuruna göndərmişdi.

Ağa Məhəmməd şahın İrəvana hücum edəcəyini yəqin edən Məhəmməd xan İrəvan qalasının müdafiəsini möhkəmləndirmiş, Qars mühafizindən kömək istəmiş, İrəvanın mühasirəyə alınacağı halda əhalinin bircə çıxış yolu olan Qarsa köçəcəyini bildirmişdi. Bu məlumatla əlaqədar Osmanlı sultanı bölgəyə xüsusi hazırlığı olan kəşfiyyatçılar göndərərək dəqiq məlumat əldə olunmasını və real vəziyyətə uyğun cavab verilməsini əmr etmişdi [16; 124, 230].

Ərzurum valisi Yusif Ziya paşanın köməkçisi Məmiş ağanın 1795-ci il 15 may tarixli məktubunda da eyni narahatlıq nəzərə çarpır: Ağa Məhəmməd xan İrəvana hücum edərsə, qala darısqal olduğundan təxminən 20-30 min nəfər elat ora sığmayacaq və onların çoxunun Qars, Bayazid və Ərzurumun sərhəd sancaqlarına pənah gətirəcəkləri yəqindir [20, sənəd 46, s.145-146, 339-340; 124, 236].

Yaranmış olduqca mürəkkəb tarixi şəraitdə İrəvan xanı çıxış yolu olaraq qardaşını Ağa Məhəmməd xanın sarayına girov kimi göndərdi, özü isə müqavimət göstərmək məqsədilə hazırlıq görməyə başladı. Lakin Ağa Məhəmməd xan İrəvan xanının hiyləsini başa düşərək qardaşı Əliqulu xanı 20 min döyüşçü ilə İrəvan qalasını fəth etməyə göndərdi. Qacar qoşunları qalaya yaxınlaşaraq onu mühasirəyə aldılar. İrəvan qalasının müdafiəçiləri 35 gün müqavimət göstərsələr də, Məhəmməd xanın tabe olmaqdan başqa bir əlacı qalmadı. O, Qacarlar dövlətinin xəzinəsinə ildə 8 funt qızıl və 80 min rubl bac ödəməyə razılıq verməyə məcbur oldu. Bundan əlavə, İrəvan xanı lazım gəldikdə öz hərbi dəstəsi ilə Qacarın hərbi xidmətinə getməli idi [115, 79-81].

Məlum olduğu kimi, Ağa Məhəmməd xan 1795-ci ildə Cənubi Qafqaza birinci yürüşü zamanı Qarabağ xanlığının mərkəzi Şuşa şəhərini 33 gün mühasirədə saxlamış, Gürcüstana yürüş etmiş və Tiflis şəhərini tutmuşdu. Bundan sonra Ağa Məhəmməd xan qışlamaq üçün Muğan düzünə gəlmiş, oradan isə Tehrana qayıtmışdı [9, 260-261].

Ağa Məhəmməd xanın Cənubi Qafqaza yürüşü və rəsmən Rusiyanın himayəsində olan gürcü çarlığına hücumu Rusiyanın regiondakı maraqlarına və nüfuzuna ağır zərbə vurmuşdu. Odur ki, Rusiya regionda öz qəsbkarlıq siyasətini həyata keçirmək üçün bəhanə axtarırdı. Buna görə də fürsətdən istifadə edən Rusiya imperatriçası II Yekaterina 30 minlik bir korpusu qraf V.Zubovun başçılığı ilə Cənubi Qafqaza, özü də Azərbaycana göndərdi. Bu, Rusiya imperiyasının Azərbaycana ikinci yürüşü idi.

V.Zubov Şimali Azərbaycanın bir sıra bölgələrini ələ keçirsə də, bu hərbi əməliyyat, nəticə etibarilə, rus dövləti üçün uğursuz oldu. 1796-cı ilin noyabrında II Yekaterinanın ölümündən sonra taxta çıx-

mış oğlu I Pavel Rusiyanın xarici siyasət xəttini dəyişərək rus qoşunlarını Cənubi Qafqazdan geri çağırdı.

Rus qoşunlarının Cənubi Qafqazda, o cümlədən Azərbaycanda hərbi əməliyyatlara hazırlaşması Osmanlı imperiyasını çox narahat edirdi. Buna görə də 5000 nəfərlik qoşunla Çıldırda olan Yusif paşa öz nümayəndəsini İrəvan xanının yanına göndərərək onu rus qoşunlarının təcavüzü əleyhinə çıxmağa çağırdı [24, v.80-81]. Kəşfiyyatdan rus ordusu qərargahına qayıtmış Nikolay Mirzəyev də eyni fikirləri söyləmişdi: "Türklər çalışırlar ki, İrəvan xanı Gürcüstanın tabeliyinə keçməsin" [24, v.80-81].

Osmanlı dövlətinin Cənubi Qafqazdakı fəallığı Rusiya dövlətinin təcavüzünə real maneə olduğundan Rusiya xristian dini amilindən fəal surətdə istifadə edirdi. Buna görə də Rusiya imperiyası Kartli-Kaxeti çarlığına Osmanlı imperiyasına qarşı bufer dövlət kimi baxır və hər vasitə ilə ona kömək etməyə çalışırdı. Təsadüfi deyildir ki, rus ordusu ali baş komandanının göstərişinə əsasən İrəvan xanlığını özündən asılı vəziyyətə salması üçün II İrakliyə kömək göstərmək qərara alınmışdı [80, sənəd 628-631, v.19].

Ağa Məhəmməd şah 1797-ci ilin iyununda ikinci dəfə Azərbaycanın şimalına yürüş etdi. O, bu dəfə Şuşa qalasını ələ keçirə bildi. Lakin elə buradaca sui-qəsdlə qətlə yetirildi. Sərkərdəsini itirmiş İran qoşunları geri — İrana qayıtmağa məcbur oldu [9, 261-262].

Ağa Məhəmməd şah ikinci yürüşü ərəfəsində irəvanlı Məhəmməd xan Qacarı yanına çağıraraq, onunla qohum olmasına baxmayaraq, rus qoşunları ilə əməkdaşlıqda suçlandırıb həbs etmiş və Tehrana* göndərmişdi [41, II, 428; 95, 164]. Ağa Məhəmməd şahın əmrinə əsasən onun ögey qardaşı Əliqulu xan Qacar İrəvanda hakimiyyəti idarə edirdi [41, II, 426; 95, 164; 200, 9]. Lakin Əliqulu xanın vergiləri artırması səbəbindən İrəvan əhalisi üsyan edib onu hakimiyyətdən qov-

* Q.P.Butkova görə, Qəzvinə göndərilmişdi [bax: 41, II, 431].

du [41, II, 431; 214, 59]. C.Bornoutyan isə bu hadisəni fərqli təqdim edərək yazır ki, Əliqulu xan Qacar qardaşı Ağa Məhəmməd xanın ölümündən dərhal sonra şah taxt-tacı iddiası ilə Tehrana tələsdi. Yaranmış vəziyyətdən istifadə edən Həsən xan Makulu İrəvan xanlığında hakimiyyəti ələ keçirdi və xalqdan ağır vergilər tələb etdi [200,9]. Ağa Məhəmməd şahın 1797-ci il iyulun 4-də Şuşada öldürülməsindən sonra taxta çıxan varisi Fətəli şah (1797-1834) İrəvanı silah gücünə əldə saxlamağın mümkün olmadığını nəzərə alaraq, İrana — Qacarlar dövlətinə sədaqətini saxlaması şərtilə, Məhəmməd xanı həbsdən azad edib İrəvana göndərdi [115, 85]. Lakin Məhəmməd xan qacarların müti vassalı olmadı. Əksinə, xoylu Cəfərqulu xanla birləşərək yeni şaha tabe olmaqdan imtina etdi. Lakin onlar şahzadə Abbas Mirzənin və sərdar Süleymanın başçılıq etdiyi Qacar qoşunu tərəfindən məğlubiyyətə uğradıldılar. Bundan bir neçə il sonra Abbas Mirzə İrəvan xanlığına hücum edərək İrəvan qalasını 40 günlük mühasirədə saxladı. Bu müddətdə ətraf kəndlər və ellər çapılıb-talandı. Nəticədə Məhəmməd xan Abbas Mirzəyə təzminat və sədaqət əlaməti olaraq girovlar verməyə məcbur oldu [115, 8 5-86].

XIX əsrin əvvəllərində Axalsıx hakimi Şərif paşanın sultana qarşı qiyamı ilə bağlı olaraq İrəvan xanlığı ilə Osmanlı dövləti arasında münasibətlərdə gərginlik yarandı. İrəvanlı Məhəmməd xanın Şərif paşanı dəstəkləməsi Osmanlı imperiyası ilə münasibətlərin pisləşməsinə səbəb oldu. Qiyamın yatırılması Ərzurum paşasına həvalə olundu. Ərzurum paşası bu zaman Fransa ilə müharibədə Türkiyə ilə ittifaq bağlamış Rusiyanın Qafqazdakı qoşunlarının komandanı K.F.Knorinqə kömək üçün müraciət etdi. K.F.Knorinq Tiflisdə olmadığından onun köməkçisi, erməni mənşəli general İ.P.Lazaryev gürcü şahzadəsi Davidi Borçalıdan və Qazaxdan topladığı azərbaycanlılardan ibarət dəstələrlə birlikdə Ərzurum paşasının köməyinə

göndərdi (türkləri bir-birinə qırdırmaq siyasəti!!! — ***red.***). Bununla yanaşı, 1801-ci ildə Ərzurum paşası K.F.Knorinqə məktub göndərərək Məhəmməd xanın Şərif paşaya kömək etməkdən əl çəkməsinə təsir göstərməsini ondan xahiş etdi [25, sənəd 1031, s.705].

1802-ci ildə Fətəli şah onun hakimiyyətini qəbul etməyən Azərbaycan xanlarını özünə tabe etmək məqsədilə tədbirlər görməyə başladı. İrəvan xanını Naxçıvandan olan köçkünləri Naxçıvana qaytarmadığı üçün hədələyən Fətəli şah sərkərdəsi Abbasqulu xanı İrəvan xanlığına qarşı göndərdi, özü də 1802-ci ilin martında İrəvana gəlmək və öz qüvvələrini buradan Gürcüstana yönəltmək fikrində idi. Müdafiəyə hazırlaşan İrəvan xanı qalanı möhkəmləndirdi, hərbi sursat və ərzaq ehtiyatı topladı. Lakin öz qüvvələrinə arxayın olmadığından ruslardan kömək istədi. General-leytenant Knorinq Fətəli şahın qoşununu Gürcüstandan kənarda qarşılayacağını və onları İrəvana buraxmayacağını vəd etdi [41, II, 513-514].

İmperatorun verdiyi 23 aprel 1802-ci il fərmanında Knorinqə bildirilirdi ki, o, Fətəli şahın qüvvələrini Gürcüstana buraxmasın və hər vasitə ilə İrəvan xanının Rusiya himayəsinə qəbul edilməsinə və İrəvanın rus qoşunları tərəfindən tutulmasına nail olsun. Lakin Fətəli şah İrəvana və Gürcüstana yürüşünü təxirə saldı. Bu zaman İrəvan xanı nəinki Rusiya təbəəliyindən imtina etdi, hətta rusların düşməni sayılan naxçıvanlı Kalbalı xanla birlikdə Gürcüstandakı rusları buradan sıxışdırıb çıxara bilməsə də, imkan düşdükcə onlara zərər yetirməyə başladı [41, II, 514-516].

1802-ci ilin mayında naxçıvanlı Kalbalı xan, onun qardaşı Abbasqulu xan və İrəvan xanının birləşmiş qüvvələri Qars əyalətinə hücum və qarət məqsədilə Pəmbək və Qars paşalığı istiqamətində hərəkət etdi. Qarslı Məhəmməd paşa kömək üçün Knorinqə müraciət etdi. Knorinq Pəmbəkdəki rus qoşunlarının komandanına Qarsla olan sərhəd xəttinin lap yaxınlığında Qars paşasının qüvvələri ilə birləşmə-

yi və xanlıqların birləşmiş qüvvələrinə zərbə endirməyi tapşırdı. 1802-ci ilin iyununda rusların və Qars paşasının birləşmiş qüvvələri irəvanlı Məhəmməd xanla naxçıvanlı Kalbalı xanı məğlubiyyətə uğratdı [41, II, 516-517].

Beləliklə, İrəvan xanlığı tarixinin bütün istiqamətlərdə araşdırılması aydın sübut edir ki, bu dövlətin idarə olunmasında ermənilərin heç bir iştirakı olmamışdır [162,44]. Əksinə, ermənilər İrəvan xanlığının ərazisini ələ keçirib burada öz dövlətlərini yaratmaq üçün xanlığa qarşı bütün istiqamətlərdən hücuma keçən təcavüzkarlara fəal köməklik göstərirdilər. Azərbaycan torpağında — ölkənin qərbində yaranmış bu xanlıqda bütün hakimiyyət Azərbaycanın qədim türk tayfası olan Ağcaqoyunlu Qacarların əlində cəmlənmişdi və bu dövlət Azərbaycanın dövlətçilik ənənələri tarixində xüsusi yer tutur.




Xəritə 2.
İrəvan xanlığının yaylaq-qışlaq mardarlığı ilə məşğul olan əhalisinin tərkibi, yerləşməsi və yerdəyişməsi
***Mənbə***: Bournoutian C.A.
The khanate of Erevan under Qajar rule 1795-1828, Mazda Publishers in association with Bibliotheca Persica, Costa Mesa. California and New York, 1992, p. 56


RUSSIAN EMPIRE
Sarashlu
Karim-Beglu
GÖKCHA
LAKE GÖKCHA
Qafarlu
Godaklu
Chobankara*
Jam-Melli
GARNI-BASAR
Banuki
Biryuki *
Jalali (s)*
Karachorli (s-w)*
Melli (s-w)*
'Alikhanli
Kolani
Piusan
Kangarlu
Karachorli (s)*
Melli (s)*
Sheikhlar (w)
Karapapakh *
Qajar*
VEDI-BASAR
SHARUR
Damirchilu
Karim-Beglu
Jalali (w)*
Banuki
Radikanli
Biryuki (w)*
KHANATE OF NAKHICHEVAN
N
0
30 miles




Xəritə 3. Rusiya tərəfindən işğal olunmuş Cənubi Qafqaz.
Rəssam: E.Stepanova
***Mənbə:*** Покоренный Кавказ (очерки исторического прошлого и современного положения Кавказа с иллюстрациями). Книга I-V, СПб., 1904, с.77-78




Xəritə 4.
İşğal olunmuş Cənubi Qafqazın yol xəritəsində keçmiş İrəvan xanlığı
***Mənbə:*** Маршрутная карта Кавказского края (составлена и литографирована при Генеральном штабъ Отьдельного Кавказского Корпуса, 1847 г.

İrəvan xanlığının xarici siyasətinin ***üçüncü mərhələsində*** aparıcı xətti xanlığın öz müstəqilliyini qorumaq uğrunda Rusiya imperiyasına qarşı apardığı mübarizə təşkil etmişdir.

Erməni və əksər rus tarixşünaslığında real tarix saxtalaşdırılaraq Azərbaycan dövləti olan İrəvan xanlığının Rusiya tərəfindən işğalı guya "Şərqi Ermənistan"ın və ya "Ermənistanın" Rusiyaya birləşdirilməsi kimi təqdim edilir. Əslində isə XIX əsrin əvvəlində Cənubi Qafqazın Rusiya tərəfindən işğalı zamanı bu ərazidə heç bir erməni dövləti yox idi. Çar Rusiyası tərəfindən işğal olunan "Ermənistan" deyil, məhz Azərbaycan dövləti olan İrəvan xanlığının ərazisi idi, yəni Azərbaycan torpağı idi.

1804-1813-cü illərdə Azərbaycan torpaqlarının işğalı uğrunda gedən Birinci Rusiya — İran müharibəsi zamanı İrəvan xanlığı iki dəfə Rusiya qoşunlarının güclü hücumuna məruz qaldı. Lakin İrəvan xanlığı Rusiyaya tabe olmadı. Xanlığın əhalisi müdrik və cəsur dövlət xadimi olan Məhəmməd xan Qacarın və Hüseyinqulu xan Qacarın başçılığı ilə çar qoşunlarına qəhrəmanlıqla müqavimət göstərdi. Lakin çar Rusiyası Osmanlı dövlətinə qarşı mübarizədə son dərəcə mühüm hərbi-strateji əhəmiyyətə malik olan bu Azərbaycan xanlığının ərazisini işğal etmək planından əl çəkmədi.

XIX əsrin əvvəllərində Rusiyanın xarici siyasətində Cənubi Qafqazın işğalı mühüm yer tuturdu. 1801-ci ildə Şərqi Gürcüstanın (Kartli-Kaxeti çarlığının) Rusiyaya ilhaq olunması ilə Cənubi Qafqazın işğalı prosesi daha da sürətləndi. Çar I Aleksandrın (1801-1825) 16 fevral 1801-ci il tarixli fərmanı ilə Şərqi Gürcüstanla [178, 25] eyni vaxtda Azərbaycanın Şörəyel, Pəmbək, Qazax, Borçalı və Şəmşəddil sultanlıqları da Rusiyaya ilhaq edildi [150, 372; 132, 28].

Azərbaycan torpaqlarının, o cümlədən İrəvan xanlığına məxsus olan Şörəyel və Pəmbək sultanlıqlarının Rusiya tərəfindən işğalı İrə-

van və Gəncə xanlarının kəskin narazılığına səbəb oldu [25, sənəd 801, 802, s.598-599; 132, 28; 41, II, 448]. Rusiya strateji baxımdan böyük əhəmiyyət kəsb edən İrəvan xanlığını tamamilə zəbt etmək üçün hərbi hazırlıqlarını artırmaqda idi.

Azərbaycan xanlarının əksəriyyəti, o cümlədən Rusiyanın hərbi-siyasi təzyiqinə daha çox məruz qalan irəvanlı Məhəmməd xan Qacar və naxçıvanlı Kalbalı xan öz müstəqilliklərini qoruyub saxlamaq əzmində idilər.

İrəvan xanı Rusiyanın təcavüzkar siyasətinə qarşı daha qətiyyətlə çıxış edərək pəmbəkliləri işğalçılara boyun əyməməyə çağırdı və onlara təklif etdi ki, rus qoşunlarının işğal etdikləri əraziləri tərk edib İrəvana köçsünlər. İrəvan xanının müraciəti ilə 600 pəmbəkli öz kəndlərini tərk edərək İrəvana pənah gətirdi [150, 402; 132, 28]. İrəvan xanı, eyni zamanda, öz nümayəndəsini general İ.P.Lazaryevin yanına göndərərək Pəmbək vilayətinin şahın fərmanına əsasən ona məxsus olduğunu bildirdi. İrəvan xanı Naxçıvan xanı ilə birlikdə hərbi qüvvələrini səfərbərliyə alaraq rus qoşunlarını Pəmbəkə buraxmamaq qərarına gəldilər [150, 402-403; 132, 28-29]. Hərbi əməliyyatda üstünlüyü əldə saxlamaq üçün erməni əsilli çar generalı İ.P.Lazaryevin başçılıq etdiyi qoşun hissələri 30 iyunda Pəmbəkə soxuldu [25, sənəd 799, s.598; 132, 29]. Çar generalı əvvəlcə Pəmbək ağsaqqallarına müraciət edərək İrəvan xanlığına pənah aparan Pəmbək əhalisinin geri qaytarılmasına yardım etmələrini xahiş etdi [25, sənəd 800, s.598]. Bunun nəticəsiz qaldığını görən İ.P.Lazaryev İrəvan xanına məktub yazaraq pəmbəklilərin geri qaytarılmasını tələb etdi və əks təqdirdə xanın Rusiya imperatorunun qəzəbinə gələcəyini bildirdi [25, sənəd 801, s.598-599]. Maraqlıdır ki, bu zaman gürcü şahzadəsi Davidin də Rusiyaya münasibəti dəyişdi. O, Gürcüstanın rus işğalından sonra düşəcəyi ağır vəziyyəti nəzərə alaraq İrəvan xanına Rusiya

dövlətinə tabe olmamağı tövsiyə etdi. Və gürcü şahzadələri David, Vaxtanq, Yulon və Aleksandr Gürcüstanı rus qoşunlarından təmizləmək üçün İrəvan xanından kömək istədilər [150, 404]. Bu fakt həmin dövrdə İrəvan xanlığının siyasi nüfuzunun və hərbi qüvvəsinin kifayət qədər güclü olduğunu sübut edir.

Bütün bunlara baxmayaraq, Rusiya əsas diqqətini İrəvan xanlığının işğalına yönəltmişdi. Rusiyanın xarici siyasət idarələrində İran, Türkiyə və Gürcüstanla həmsərhəd olan İrəvan xanlığının işğalına xüsusi önəm verilir, "xüsusilə Tiflis — Təbriz tranzit yolunun üstündə yerləşən İrəvan qalasının alınmasının vacibliyi" qızğın müzakirə olunurdu. Rusiya İrəvan xanlığına strateji baxımdan mühüm bir ərazi kimi yanaşmaqla bərabər bu Azərbaycan torpağını Gürcüstanda sakitliyin bərpa olunması, Cənubi Qafqazda İran və Türkiyənin siyasi təsir dairəsinin zəiflədilməsindən ötrü strateji bir istinadgah hesab edirdi. Məhz buna görədir ki, çar I Aleksandrın verdiyi fərmanda Rusiyaya tabe ediləcək ərazilər sırasında İrəvan xanlığının adı birinci çəkilirdi [178, 38; 25, sənəd 548, s.436].

XIX əsrin əvvəlində Cənubi Qafqazın, o cümlədən Azərbaycan torpaqlarının Rusiya imperiyası tərəfindən işğal olunmasında erməni - Qriqorian kilsəsi və erməni iş adamları fəal iştirak etmişdilər. Belə ki, bu zaman xüsusi olaraq İrəvandan Tiflisə gəlmiş Üçkilsə monastırının arxiyepiskopu Qriqori buradakı rus ordusunun komandanlığına, o cümlədən mənşəcə erməni olan İ.P.Lazaryevə kəşfiyyat xarakterli məlumatlar verir və onları inandırmağa çalışırdı ki, İrəvan və Naxçıvan xanlarına inanmasınlar, çünki "…İrəvan xanı ruslara yalnız zahirən meyil göstərir, daxilən onlara nifrət bəsləyir [25, sənəd 838, s.617-618; 115, 89] və …İrəvan xanı naxçıvanlı Kalbalı xana arxalanaraq Pəmbək mahalını Rusiyanın təbəəliyindən çıxarmaq istəyir" [25, sənəd 838, s.617-618; 115, 89]. Öz soydaşı olan erməni keşi-

şinin məlumatını "əsas tutan" İ.P.Lazaryev Azərbaycan türklərinə məxsus Pəmbək mahalına yeni-yeni qoşun hissələri göndərmiş və demək olar ki, bütün 14 kəndin əhalisini geri qaytarmışdı. Bu hadisədən sonra Pəmbək bəylərinin bir hissəsi Rusiyaya tabe olmayıb İrəvana qaçmışdı [25, sənəd 838, 617-618; 115, 89].

İşğal ərəfəsində Rusiyanın Cənubi Qafqazla bağlı siyasi rəqiblərinin zəifləməsi onun burada işğalçılıq planlarının gerçəkləşməsinə əlverişli şərait yaratdı. Belə ki, Rusiya 1792-ci ildə bağladığı Yassı müqaviləsi ilə onun bu regionda güclənməsinə mane olan Osmanlı imperiyasını Cənubi Qafqazda, o cümlədən Azərbaycanda fəal siyasət yürütmək imkanından məhrum etmişdi. Digər tərəfdən, həmin dövrdə Qacarlar dövlətində yaranmış siyasi qeyri-sabitlik də Rusiyanın regionda irimiqyaslı hərbi əməliyyatlarına yol açmışdı.

Yaranmış vəziyyətdən istifadə edən Rusiya imperiyası vaxt itirmədən Osmanlı imperiyası və Qacarlar İranının sərhədlərində yerləşən İrəvan xanlığını ələ keçirməyə çalışırdı. Rusiya imperiyası Gürcüstanın işğalı dövründən Azərbaycan torpaqlarının ələ keçirilməsi üçün geniş hazırlıq işləri görmüşdü. Belə ki, Gəncə və Car-Balakənin işğalından sonra növbəti hücum İrəvan xanlığına yönəlmişdi. Elə bu səbəbdən də irəvanlı Məhəmməd xanın "Pəmbək bəyləri ilə əlaqəsini" bəhanə edən Rusiyanın Qafqazdakı qoşunlarının baş komandanı K.F.Knorinq 1802-ci il aprelin 18-də Məhəmməd xana Rusiya təbəəliyini qəbul etməyi təklif etdi [25, sənəd 840, s.618-619; 115, 90]. Həmin il aprelin 24-də çar I Aleksandr K.F.Knorinqə yeni təlimat göndərərək ona Gürcüstanda olan rus qoşunlarının sıralarını möhkəmləndirməyi və hazır vəziyyətdə saxlamağı, İrəvan xanlığının Rusiya təbəəliyini qəbul etməsinə nail olmasını tapşırdı [115, 90].

I Aleksandrın təlimatından aydın görünür ki, Rusiya İrəvan xanlığının strateji mövqeyi və siyasi nüfuzuna mühüm əhəmiyyət verirdi.

Bunu belə bir fakt da təsdiq edir ki, həmin dövrdə İrəvan xanı Məhəmməd xanın sərhəddə yerləşən rus qoşunlarının üzərinə hərəkət etməsindən xəbər tutan K.F.Knorinq dərhal hərbi toqquşmaya meyil göstərməmiş, 1802-ci il mayın 17-də Məhəmməd xana məktubla müraciət edərək bu hərəkətin səbəbini izah etməsini tələb etmişdi [115, 90].

İrəvan xanlığının müstəqilliyini qorumağa çalışan Məhəmməd xan K.F.Knorinqi hərbi toqquşmadan çəkindirməyə və hətta ruslarla dostluq əlaqəsi yaratmaq istədiyinə inandırmağa çalışmışdı. Əslində isə o, Rusiyanın təbəəlik barədə təklifini dəfələrlə rədd etmiş, hətta Üçkilsə monastırının başçılığına Rusiya tərəfindən namizədliyi irəli sürülən Danili qəbul etməyərək özünə sadiq Davidi həmin vəzifədə saxlamışdı [178, 50; 115, 90-91].

Cənubi Qafqazda rus ordusunun baş komandanı K.F.Knorinq gürcü əsilli P.D.Sisianovla əvəz olunduqdan sonra (1802-ci il, sentyabr — ***red.***) Rusiyanın bu bölgədəki siyasəti daha da sərtləşdi. Yenicə baş komandan təyin olunan P.Sisianov İrəvan xanlığını ələ keçirmək və ermənilərin etimadını doğrultmaq məqsədilə Tehranda həbsdə saxlanılan Danili İrəvana qaytarmağı qərara aldı. Rus generalı bunun üçün öncə müxtəlif diplomatik vasitələrə əl atdı. O, 1803-cü il fevralın əvvəlində İrəvan xanına göndərdiyi məktubda xana səmimi dostluq təklif edərək onu Rusiya təbəəliyinə keçməyə çağırırdı. Məktubun sonunda isə böyük Rusiya imperatoru və böyük sultan (Osmanlı sultanı — ***red.***) tərəfindən bütün ermənilərin patriarxı təsdiq edilən Danil haqqında verilən fərmanın dəqiq icra olunmasını tələb edirdi [26, sənəd 1214, s.609]. Rusiya imperiyası ilə münasibətləri gərginləşdirmək istəməyən Məhəmməd xan Danilin həbsdən azad olunması haqda göstəriş versə də, onu yenə də patriarx təyin etmir və öz nəzarəti altında saxlayırdı [148, 120; 188, 19].

Məhəmməd xanla şəxsən görüşmək və irəli sürdüyü şərtləri qəbul etdirmək məqsədilə P.D.Sisianov öz nümayəndəsi Tomas Orbeliani-ni İrəvana göndərdi. Bu məqsədlə o, İrəvan xanına və Kalbalı xana müraciət etdi və İrəvan xanlığına Danilin patriarx vəzifəsinə təyin olunmasına köməklik göstərməsi xahişini bildirən məktubla xüsusi nümayəndə heyəti göndərdi. Bu heyətə İrəvan xanlığında gizli kəşfiyyat işləri aparmaq — İrəvan qalasının müdafiəsinin zəif və möhkəm yerləri, Kartli-Kaxetidən İrəvana gələn əlverişli yolları öyrənmək tapşırılmışdı [26, sənəd 1215, s.609-610]. Lakin nümayəndə heyətinin fəaliyyəti heç bir nəticə vermədi. İrəvan xanı Məhəmməd xan Qacar Rusiya komandanlığının bütün tələblərini rədd etdi [26, sənəd 1215, s.610; 148, 121]. Bu hadisədən hiddətlənən P.D.Sisianov 1803-cü il martın 12-də çara göndərdiyi məlumatında yazırdı ki, irəvanlı Məhəmməd xan əlahəzrət imperatorun Danilin erməni patriarxı təyin olunması barədə yüksək göstərişini yerinə yetirməkdən imtina edir. Onun cəzasız qalması silahla ələ keçirdiyimiz yerlərdə Əlahəzrətin nüfuzunu zəiflədir. Ona görə də mən Məhəmməd xanı cəzalandırmaq və Danili erməni patriarxı təyin etmək üçün 6 taborla İrəvana getməli və orada qarnizon yerləşdirməliyəm. Yerli erməni tacirləri bu qarnizonu ərzaqla təmin edəcəklərinə söz verirlər [26, sənəd 1216, s.610; 132, 46]. Lakin İrəvan xanlığını işğal etməyin elə də asan olmayacağını dərk edən P.D.Sisianov Rusiya imperatorundan əlavə hərbi kömək* istədi [26, sənəd 1216, s.610].

Bəhs olunan dövrdə Rusiya qoşunlarının Car-Balakəni (1803-cü il, mart-aprel), çətin və qanlı döyüşlərdən sonra Gəncə xanlığını (1804-cü il, 3 yanvar) işğal etməsi P.D.Sisianovun digər Azərbaycan

*P.D.Sisianov I Aleksandıra yazdığı 1803-cü il 12 mart tarixli məlumatında İrəvan xanlığını ələ keçirmək üçün əlavə olaraq 3 alay və 100 min rubl lazım olduğunu bildirir və bu qüvvənin köməyi ilə İrəvanı, Naxçıvanı, Şuşanı almağı və hətta Kür-Araz boyu ərazilərin işğalını başa çatdırmağı vəd edirdi [26, sənəd 1216,s.610; 148,121].

xanlıqlarını ələ keçirmək iştahasını daha da artırdı. O, İrəvan və Qarabağ xanlarının yanına nümayəndə göndərərək onlara döyüşsüz təslim olaraq Rusiya dövlətinin itaətini qəbul etmələrini tələb etdi [9,265]. Lakin bu danışıqlar heç bir nəticə vermədi.

İrəvan xanının ağır vəziyyətindən istifadə etməklə məqsədinə nail olmağa çalışan P.D.Sisianov 1804-cü il mayın 10-da təkrarən Məhəmməd xan Qacara məktub göndərdi. Həmin məktubda çar generalı Məhəmməd xanı hədələyir və öz şərtlərini İrəvan xanının nəzərinə çatdırırdı: 1. Hər şeydən əvvəl Davidlə aparılan bütün danışıqlar kəsilməli və patriarx Danil öz yerinə bərpa olunmalıdır; 2. İrəvan qalası rus ordusuna təslim edilməlidir; 3. Xan rus imperiyasını öz dövləti kimi qəbul etməli və sədaqətli olacağına and içməlidir; 4. Xan 80 min rubl məbləğində xərac verməli və hər il bu xəracı iki müddətə — birinci yarısını Novruz bayramından bir gün keçdikdən sonra, ikinci yarısını isə iyul ayından sonra ödəməlidir. Əgər xan bu şərtlər daxilində bizə sadiq olarsa, əvvəla, öz hüququnda qalacaq və hakimiyyətini davam etdirəcəkdir; ikincisi, imperator onun təhlükəsizliyini təmin etmək üçün ona xanlıq hüququ barədə şəhadətnamə verəcək, üçüncüsü, xanın ailəsinin İrandan gətirilməsi üçün butun imkanlardan istifadə ediləcəkdir [26, 613-614; 115, 92].

Danışıqlar yenə heç bir nəticə vermədi. Bu dəfə Məhəmməd xan T.Orbelianiyə Rusiya təbəəliyini qəbul etmədiyini qəti şəkildə bildirdi. Məhəmməd xandan rədd cavabı alan P.D.Sisianov İrəvana hücum planı hazırlamağa başladı. Artıq 1804-cü ilin mayında P.D.Sisianovun əmrinə əsasən İrəvana yürüş etməyə hazırlaşan müxtəlif növ seçmə qoşun hissələri hazır vəziyyətə gətirilərək Tiflisdə cəmləşdirməyə başladı [74, 258].

Gürcü əsilli çar generalı Sisianovun əsas məqsədi "İrəvan yürüşünü tezliklə başa çatdırmaq, bu vilayəti Rusiyanın tərkibinə daxil et -

məklə yanaşı, İranla baş verəcək gələcək müharibədə hərbi əməliyyat meydanını Gürcüstan sərhədlərindən uzaqlaşdırmaq idi" [67,95,97; 56,159; 132,47]. Bununla belə, hiyləgər çar generalı İrəvan xanına məktublar yazaraq onu gah şirnikləndirir, gah hədələyir, gah da dilə tutaraq müqavimətsiz təslim olmasını tələb edirdi. Şərtlər isə olduğu kimi qalırdı: Danil Eçmiədzin patriarxı elan edilməli, David isə Tiflisə göndərilib rus komandanlığına təslim edilməli idi; bundan əlavə, Məhəmməd xan İrəvan qalasında rus qoşunlarının yerləşdirilməsinə razılıq verməli, işğalçılara xərac ödəməli və sadiq qalacağı barədə and içməli idi [26, sənəd 1224, s.613].

Qeyd etmək lazımdır ki, bəhs olunan dövrdə İrəvan xanı olduqca mürəkkəb vəziyyət qarşısında qalmışdı. Məsələ burasında idi ki, mühüm strateji məntəqə olan İrəvan xanlığının Rusiya tərəfindən işğalına yol vermək istəməyən Qacarlar dövləti də xanlığın ərazisini ələ keçirməyə çalışırdı [178,136]. Hər iki təcavüzkar — həm Qacarlar İranı, həm də Rusiya İrəvan xanlığını işğal etmək üçün bir-birini qabaqlamağa çalışırdı. Sisianovla danışıqlar zamanı cənubdan İran qoşunlarının İrəvan istiqamətində hücum xəbərini alan Məhəmməd xan hadisələrin gedişinə uyğun olaraq siyasi manevr etmək məcburiyyətində qaldı, daha doğrusu, daha güclü düşmən hesab etdiyi Rusiya ilə münasibətlərini nizama salmaq, Rusiya hərbi qüvvələrinin köməyi ilə Qacarlar İranının İrəvanı ələ keçirməsinin qarşısını almaq istədi. Məhəmməd xan bu məqsədlə Tiflisə təcili qasid göndərib Rusiyaya xidmət etmək arzusunda olduğunu bildirdi. Bunun əvəzində Sisianovdan qoşunları ilə İrəvana yaxınlaşaraq İran qoşunlarının yolunu kəsməsini xahiş etdi. Sisianov bu təklifə o şərtlə razılıq verdi ki, Məhəmməd xan Üçkilsə monastırının rəhbərliyinə ruspərəst İosif Arqutinskinin ölümündən sonra təyin etdiyi özünə "sədaqətli" olan Davidi rusiyapərəst Danillə əvəz etsin və 500 nəfər rus əsgərinin İrəvanda yer-

ləşdirilməsini təmin etsin [26, sənəd 1224,s.611-614; 115,93,94]. Məhəmməd xan Sisianovun hiyləsini başa düşərək nə Üçkilsə patriarxının dəyişilməsinə, nə də rus qoşunlarının İrəvan qalasına daxil olmasına razılıq vermədi [178,143-144]. General Sisianov bu hadisədən İrəvan xanlığına hücum üçün bəhanə kimi istifadə etdi [Bax: xəritə 1, 2].

Beləliklə, Pəmbək vilayətində möhkəmlənmiş rus qoşunlarının İrəvana soxulması üçün Davidin Danillə əvəz olunması məsələsi yenidən gündəmə gətirildi. Rus qafqazşünası V.A.Potto və eyni zamanda erməni tarixçisi V.A.Parsamyan bu həqiqəti etiraf edərək yazırdılar: "Bizim İrəvan xanlığının işlərinə qarışmağımıza bəhanə Üçkilsə taxtı üstündə David və Danilin mübarizəsi oldu" [178, 129;172,20].

Beləliklə, 1804-cü ilin mayında rus qoşunları Sisianovun komandanlığı altında İrəvan xanlığının sərhədlərinə yaxınlaşdı. Qeyd olunduğu kimi, rus komandanlığının bu yürüşdə əsas məqsədi Qacar qoşunlarını Cənubi Qafqaza, o cümlədən də Azərbaycanın şimalına buraxmamaq, mühüm hərbi-strateji əhəmiyyətə malik olan İrəvan xanlığını ələ keçirməklə Rusiyanın regionda gələcək hegemonluğu üçün zəmin hazırlamaq, Türkiyə və İran sərhədlərində keçilməz sədd yaratmaq idi [115,95]. Bunun üçün Rusiya dini amildən istifadə edərək ermənilərin dəstəyi ilə özünə türk-müsəlman dövlətləri olan Osmanlı imperiyası və Qacarlar İranına qarşı dayaq kimi "erməni dövləti" yaratmaq planını həyata keçirməyə çalışırdı. Təsadüfi deyildi ki, rus tarixçisi P.İ.Kovalevski özü etiraf edirdi ki, Qafqazı işğal etməyə göndərilən P.D.Sisianova öz hərbi planlarının həyata keçirilməsində ermənilərə xüsusi diqqət və qayğı ilə yanaşmaq və onları müdafiə etmək tapşırılmışdı [67,79-82]. Bundan əlavə, P.D.Sisianova ermənilərin xristian olması və Rusiyaya sədaqətli olması baxımından onları sevgi ilə öz himayədarlığına almağı, onlardan istifadə etməyi tapşırmışdılar [67,79-82].

Həm Rusiya imperiyası, həm də Qacarlar İranı arasında manevr etməyə çalışan Məhəmməd xan Qacar İrəvan qalasını möhkəmləndirmək üçün müdafiə tədbirləri görməyə başladı. O, ətraf kəndlərin əhalisini qalaya köçürərək onlara özləri üçün hərbi sursat və lazımi ərzaq gətirməyi əmr etdi. Xanın səyi nəticəsində qala müdafiəçilərinin sayı 7 min nəfərə çatdırılmış, qala divarlarına 22 top bərkidilmiş, qalaya sığınmış əhali üçün xeyli ərzaq ehtiyatı toplanmışdı [bax: 148, 298; 74, 267; 115, 95-96].

Sisianov İrəvan yürüşünü uğurla başa çatdırmaq üçün mərkəzdən daha 4 alay və 100.000 rubl gümüş pul tələb etdi. Bu qüvvələrlə* o, nəinki İrəvanı, hətta Naxçıvan və Şuşanı almağı, Kür-Araz boyu həyata keçiriləcək işğal planının bir hissəsini bu kampaniyada başa çatdıracağını vəd edirdi [26, sənəd 1216, s.610]. V.A.Pottonun yazdığına görə, Sisianov bu qüvvələrlə Rusiya hakimiyyətini nəinki İrəvanda, hətta Qara dənizlə Xəzər dənizi arasında bərqərar etməyi və Araz çayını Rusiya ilə İran arasında sərhədə çevirməyi düşünürdü [178, 137]. İşğalçı hərbi hissələri döyüşə hazır vəziyyətə gətirən Sisianov hərbi əməliyyata əlavə qüvvələr cəlb etmək üçün vuruşmaq arzusunda olan hər kəsi yürüşə dəvət etdi və döyüşdə fərqlənənlərə mükafatlar vəd etdi [26, sənəd 1225, s.613; 132, 47].

Sisianovun İrəvana yürüşü zamanı İrəvan xanlarına xəyanət edən ermənilər ona bələdçilik edir, rus qoşunlarına maddi və hərbi yardım göstərirdilər. Erməni müəllifləri bu faktı iftixarla qeyd edirlər [147, 95-96]. Bu faktı rus müəllifləri də etiraf edirlər. Məsələn, V.A.Potto yazırdı: "Sisianov və Qudoviçin Gəncə və İrəvan xanlığına yürüşləri zamanı arxiyepiskop İoannes və rahib Nerses 1500 nəfərdən ibarət erməni dəstəsi topladılar və özləri də bu dəstənin başında durdular" [177, 722; 178, 138].

---

* Sisianovun rəhbərliyi altındakı hərbi qüvvələr 12 topla silahlanmış 3572 piyada, 3 eskadron, 300 kazak və knyaz Orbelianinin başçılığı ilə 200 nəfər gürcü knyazı və əyanlarından ibarət idi [178,137; 26, sənəd 1216, s.610]

Bütün bu faktlar ermənilərin Cənubi Qafqazda, o cümlədən İrəvan xanlığı ərazisində gəlmə olduqlarını və buna görə də yaşadıqları Azərbaycan torpaqlarını deyil, işğalçıların mənafelərini müdafiə etdiklərini sübut edir. Bundan əlavə, yaşadıqları dövlətə xəyanət edən ermənilər Rusiya hakim dairələrinə saxta məktublar göndərirdilər. Rusiyanın Gürcüstandakı mülki müşaviri Kovalenski çara göndərdiyi bir arayışda İrəvan xanının yanındakı erməni məmurlarından biri olan …məlik Avramın İrəvan xanlığında yaşayan bütün ermənilərin Rusiyaya meyilli olduğunu bildirdiyini yazırdı [25, sənəd 34, s.119].

Çar Rusiyası Azərbaycan xanlıqlarının işğalının həyata keçirilməsi planlarında xristian qüvvələrinin,* əsasən də ermənilərin köməyindən, erməni xəyanətindən dövlət səviyyəsində istifadə edirdi. Məsələn, çarın həmin dövrə aid bir fərmanına ermənilər haqqında ayrıca bənd daxil edilmişdi: "…Hər cür nəvazişlə erməniləri özünüzə cəlb etməyi sizin xüsusi nəzarətinizə buraxıram" [25, sənəd 548, s.436].

Rusiya və İran təhlükəsi, Gəncənin aqibəti irəvanlı Məhəmməd xan Qacarı son dərəcə ehtiyatlı olmağa və eyni zamanda tərəfləri narazı salmamaq üçün siyasi manevrlər etməyə məcbur edirdi. V.Pottonun fikrincə, xan yaxınlıqda olan İrana meyil etməyə başladı [178, 136]. Lakin bu manevrlərin artıq heç bir əhəmiyyəti yox idi. Fətəli şah İrəvan xanlığını müstəqil idarə edən Məhəmməd xanı xanlıqdan uzaqlaşdırmağa çalışırdı.** Rus qoşunları isə artıq İrəvanı ələ keçirmək üçün hərbi əməliyyata başlamışdılar.

Beləliklə, 1804-cü il iyunun əvvəlində general-mayor S.A.Tuçkovun komandanlıq etdiyi 1 alay, 2 tabor və 8 topdan ibarət olan qoşunlar İrəvan xanlığının Şörəyel vilayətini işğal etdi. Burada 2 ermə-

---

*Qeyd etmək lazımdır ki, Sisianovun İrəvan xanlığı üzərinə işğalçı yürüşündə öz hərbi qüvvələri ilə birlikdə gürcü knyazları da iştirak edirdilər [bax: 178, 137].

** E.Xubovun verdiyi məlumata əsasən, artıq 1804-cü il iyunun 1-də Qacarlar İranının qoşunları İrəvan xanlığını mühasirəyə almış, həmin ayın 18-də tərəflər arasında qanlı döyüş baş vermiş və hər iki tərəfdən xeyli itki verilmişdi [bax: 188, 22, 25-26].

ni arxiyepiskopu ilə bərabər 100 erməni atlısı da onlara qoşuldu [178, 138; 148, 311; 132, 48-49]. S.A.Tuçkovun rəhbərliyi ilə Şörəyeli ələ keçirən rus qoşunlarının ön dəstəsi qanlı döyüşlərdən* sonra iyunun 12-də Gümrünü ələ keçirdi [148, 311-312; 74, 260-261].

### *İrəvan qalasının Rusiya işğalçıları tərəfindən birinci mühasirəsi və şəhərin qəhrəmancasına müdafiəsi (2 iyul-3 sentyabr, 1804-cü il)*

1804-cü il iyunun 10-da Qacarlar İranı ilə Rusiya arasında diplomatik danışıqlar kəsildi və bir neçə gündən sonra hər iki dövlət arasında müharibə başladı. Gümrüdə möhkəmlənən rus qoşunları iyunun 15-də oradan Üçkilsəyə doğru hərəkət etdi. Üçkilsəni və Qəmərlini böyük çətinliklə** ələ keçirən rus qoşunları iyulun 2-də, sübh çağı İrəvan qalasını mühasirəyə aldı [26, sənəd 1668, s.810; 74, 228, 266]. İrəvan xanının qoşunları yaxşı silahlanmışdı və qalanın müdafiəsi də lazımınca təşkil olunmuşdu. Hətta erməni müəllifləri də bunu gizlədə bilməyərək İrəvan xanının güclü müqaviməti barədə yazırdılar ki, "…1804-cü il iyulun 24-də rus qoşunlarının İrəvan qalasına hərtərəfli hücumu başlandı. 60 topa və 7000 əsgərə malik olan qala qarnizonunun ruslara qarşı inadlı mübarizəsi başlandı [172,21]".

Həmin dövrdə İrəvan qalası və orada yerləşən müdafiə qarnizonu barədə maraqlı məlumatlar vardır. Həmin məlumatlardan aydın olur

* Bu döyüş Abbas Mirzənin rus qoşunlarına qarşı göndərdiyi Mehdiqulu xan Dəvəlinin rəhbərlik etdiyi 8 minlik dəstə arasında olmuşdu [bax: 127,30].

** Üçkilsədə yerləşən Qacarlar İranının qoşunları ilə rus qoşunları arasında 5 gündən artıq qanlı döyüş gedir. Bu döyüşlərdə rus qoşunları xeyli itki verərək iyunun 26-da kilsəni tərk edir. Sisianovun başçılıq etdiyi rus qoşunları İrəvan yaxınlığında Zəngi çayı üzərində yerləşən, əlverişli strateji mövqeyi olan Qəmərli kəndini ələ keçirməyə can atır. Bu zaman ermənilər general Sisianova artıq şah qoşunları tərəfindən Üçkilsənin boşaldıldığını xəbər verirlər. General az miqdarda qoşun göndərərək kilsəni müqavimətsiz ələ keçirir. Eyni zamanda Qəmərli kəndi uğrunda İrəvan xanının və Abbas Mirzənin qoşunları ilə rus qoşunları arasında qanlı döyüşlər gedir. Lakin iyunun sonunda əlavə kömək alan rus qoşunları böyük çətinliklə də olsa mühüm strateji mövqeyi olan Qəmərli kəndini ələ keçirə bilir [bax: 74, 225-227, 261-266; 148, 314-315; 320-321; 188,38].

ki, Zəngi çayının kənarındakı ən yüksək təpədə inşa olunan İrəvan qalasının çay tərəfdən qala divarı qalan divarlara nisbətən zəif idi. Qalanın digər divarları ikiqat hasarlardan ibarət idi. Kərpic və daşdan hörülmüş qala divarları həm hündür, həm də qalın idi. Birinci qala divarı ilə ikinci divarın arasındakı məsafə 15 və yaxud 20 sajenə* bərabər idi. Divarlar arasındakı xəndək su ilə doldurulurdu. Qalanın 17 bürcü var idi. İrəvan qalasının üstündə qurulmuş 60 topdan yalnız 20-si saz vəziyyətdə idi. İrəvan qalasında üç mortir (qısalüləli top — ***red.***) də qurulmuşdu. Qalanı müdafiə edən qarnizon 7000 nəfərdən ibarət idi [74, 267; 115, 97].

Rusiya dövlətinin sifarişi ilə yazılmış XIX əsr Azərbaycan salnamələrində, məsələn, Mirzə Adıgözəl bəyin "Qarabağnamə"sində də irəvanlıların qəhrəmanlıq mübarizəsi öz əksini tapmışdı: "Qızılbaşlar (burada İrəvan xanının və Qacar dövlətinin qoşunu nəzərdə tutulur — ***red.***) gəliş-gediş yollarını o dərəcədə kəsmişdilər ki, Rusiya qoşununun çarəsi hər tərəfdən üzülmüşdü. Hətta Sisianova qoşulub onunla bir yerdə gəlmiş olan gürcü knyazları qaçdıqları zaman qızılbaşların əlinə keçib əsir alınmışdılar" [8, I, 68]. Ərazisində yaşadıqları dövlətə xəyanət edən ermənilər isə rus qoşunlarının bu yürüşünə böyük ümid bəsləyirdilər. Məlik Abovun oğlu Rüstəm və Qriqor Manuçaryan öz atlı dəstələri ilə rus qoşunlarına kömək edirdilər [178, 150; 172, 21]. Məhz bu səbəbdən qalanın müdafiəsinə rəhbərlik edən Məhəmməd xan Qacar və qaynı naxçıvanlı Kalbalı xan qala sakinlərini ciddi nəzarət altında saxlayırdı. Ermənilərin xəyanətinə bələd olan Məhəmməd xan Qacar inandığı adamların başçılığı ilə qala divarlarında güclü nəzarətçi dəstələr yerləşdirdi. Hətta, gecə vaxtı öz adamlarını tanımaq üçün onlara xüsusi parol təyin etmişdi və bu parollar tez-tez dəyişdirilirdi [188, 49].

---

* 1 sajen 2,134 metrə bərabər idi.

İrəvan qalasının Rusiya işğalçılarına qarşı nəinki qəhrəmancasına müdafiə olunmasını, hətta imkan düşdükcə qaladan çıxaraq bir neçə istiqamətdə qəfil hücumlar edərək rus qoşunlarına ağır itki verməsini dövrün digər mənbələri də təsdiqləyir [26, sənəd 1672, s.811, sənəd 1673, s.812; 148, 325]. Mühasirədə olan irəvanlıların belə hücumları nəticəsində rusların 13 zabiti və 173 əsgəri məhv edildi [178, 147; 67, 100]. Arxiv sənədlərində Qacarlar İranının qoşunlarının ilk dəfə irəvanlıların köməyinə qalanın mühasirəsinin 15-ci günü gəlib çatdığı və rus qoşunları ilə müdafiəçilər arasında baş verən 8 saatlıq döyüşdə rusların 3 zabit, 120 əsgər itirdiyi, 6 zabit, 200 əsgərinin isə yaralandığı qeyd olunur [74, 269-270].

Çarəsiz qalmış P.Sisianov İrəvan xanına məktubla müraciət edərək məsələni ruslar tərəfindən az itki ilə həll etməyə çalışırdı. Lakin onun İrəvan xanı ilə 6 ay davam edən yazışmaları nəticəsiz qaldı. Belə olduqda P.Sisianov Məhəmməd xanın onun yanına gəlmiş sonuncu nümayəndəsi ilə kobud rəftar etmiş, onu və İrəvan xanını təhqir edərək bir saat ərzində xanın Üçkilsə monastırından apardığı xəzinəni və monastırın əsir götürülmüş yepiskopları David və Danili geri qaytarmasını tələb etmişdi. Xanın nümayəndəsi qalaya qayıtdıqdan sonra Məhəmməd xan tərəfindən Sisianova heç bir cavab verilmədi [115, 97-98].

Qalanın müdafiəsinə tam arxayın olan və getdikcə havaların soyumasını nəzərə alan Məhəmməd xan rus qoşunlarının ərzaq və sursatlarının tükənəcəyinə, Tiflisdən sursat və ərzaq çatana qədər yolların keçilməz olacağına əmin idi. Ərzaq təminatı ilə bağlı rus komandanlığının gördüyü bütün tədbirlər nəticəsiz qaldı. Əvvəlcə avqustun 22-26-da mayor Levitskinin başçılığı ilə Üçkilsəyə ərzaq dalınca gedən 100 nəfərlik dəstə geri dönmədiyinə görə polkovnik Maykovun başçılığı ilə 250 nəfərlik yeger dəstəsi ona köməyə göndərildi. Lakin

müdafiəçilərlə işğalçılar arasında baş verən qanlı döyüşdə rus qoşunlarından 20 nəfər öldürüldü, kapitan Firsov başda olmaqla 50 nəfər yaralandı [74, 274-275]. Avqustun sonlarında P.Sisianov mayor Montrezoru* 350 nəfər əsgər və 3 topla Tiflisdən gətirilən ərzağı qəbul etmək məqsədilə Qarakilsəyə yolladı [148, 339; 178, 153; 132, 49]. Bundan əlavə, P.Sisianov aclıq çəkən rus əsgərlərinə bölgədə taxıl axtarmağı əmr etdi. Yerli əhali düşmənə yardım etməmək üçün taxılı iri küplərə doldurub yerə basdırmışdı. Sisianov gizlədilmiş taxılı tapanlara 50 qəpik gümüş pul verməyi vəd etsə də, bunun heç bir nəticəsi olmadı. Bu zaman işğalçılara qoşulmuş ermənilər baş komandana Üçkilsə monastırının ətrafında azərbaycanlılara məxsus biçilməmiş taxıl zəmilərinin olduğunu çatdırdılar. Lakin işğalçı rus qoşunu gələnə qədər irəvanlılar bütün taxıl zəmilərini yandırdıqları üçün bunun da faydası olmadı [148, 338-339; 74, 272; 115, 101-102].

Üçkilsə monastırı ətrafında yaşayan ermənilər rusların düşdüyü çətin vəziyyətdən istifadə edərək əldə etdikləri taxılı çox baha qiymətə gizlincə rus zabitlərinə satırdılar. Ermənilər bir funt unu ruslara bir abbasıya, ya da 34 qəpiyə satırdılar ki, bu da o dövr üçün çox böyük məbləğ idi [74, 272-273].

Qacarlar dövlətinin müharibəyə başlaması ilə işğalçılara qarşı mübarizə genişləndi və kütləvi xarakter almağa başladı. Car-Balakən üsyanları, qarabağlıların Rusiya işğalı altındakı Yelizavetpol (Gəncə — ***red.***) vilayətinə hücumu [177, 372; 132, 50] və başqa azadlıq çıxışları** Rusiyanın Cənubi Qafqazdakı mövqeyini xeyli sarsıtdı.

*Vaxtilə Qarabağ xanı İbrahimxəlilə xəyanət edərək ailəsi ilə birlikdə Qarabağdan Gürcüstana qaçmış xristian məliki Abovun oğlu Rüstəm Montrezora bələdçiliyi öz öhdəsinə götürdü [178, 150].

** General Sisianov aclıq çəkən rus qoşunlarına ərzaq əldə etmək üçün Semyon Behbutovu Qazax əyalətinə göndərdi. Bu "gürcü qəhrəman" işğalçı rus qoşunlarına qarşı üsyan qaldırmış qazaxlılar tərəfindən ələ keçirilərək İran Qacarlar dövlətinə təhvil verilmişdi [bax: 74, 272]. İrəvan ətrafında olan general-mayor Orbelianov yanındakı gürcü knyazları ilə birlikdə ərzaq çatışmazlığı səbəbindən Tiflisə qayıtmaq əmrini verdi. Yolda Pəmbək hakimi Nağı bəy onları əsir götürdü. Əksəriyyətini öldürdü və Orbelian, knyaz Baqration-Muxranski başda olmaqla, digərlərini (onların içərisində Sisianovun "məşhur müşavir" rütbəsi verdiyi qılınc ustası Kaçaturi də vardı) Baba xana göndərdi [bax: 74, 273-274].

Gürcüstan valisi Aleksandr Mirzənin başçılıq etdiyi qoşunlarla birgə hərəkət edən üsyan etmiş yerli əhalinin Tiflis — İrəvan yolunu bağlaması İrəvandakı rus qoşunlarının vəziyyətini daha da ağırlaşdırdı. Qarakilsə kəndinin 12 verstliyində mühasirəyə alınan mayor Montrezor, demək olar ki, bütün dəstəsi ilə məhv edildi* [54, 241; 74, 275; 132, 50]. P.Sisianov əsirlikdən azad etdiyi 20 nəfər İrəvan ermənisini qalaya göndərərək axırıncı dəfə Məhəmməd xandan qalanı təslim etməyi tələb etdi [147, 275; 74,275; 132, 50]. Əvvəlki hədə-qorxuları mülayim müraciətlərlə əvəz edən və xana müxtəlif güzəştlər vəd edən Sisianov axırıncı ana qədər xanın qalanı təslim edəcəyinə ümid bəsləyirdi. Sisianovun "geridə qalmış" bir xalqın nümayəndəsi hesab etdiyi İrəvan xanı onu çıxılmaz vəziyyətə salmışdı. Məhəmməd xanın yaxşı hərbi hazırlığı və özünü doğrultmuş uğurlu taktiki manevrləri onun görkəmli siyasi və hərbi xadim olduğunu göstərirdi [bax: 26, sənəd 1241, s.618; 132, 50-51]. Xanın əsas gücünü Sisianovun həqarətlə yanaşdığı vətənpərvərlər, mübariz azərbaycanlılar təşkil edirdi. Onlar yadelli Rusiya işğalçılarına və onlarla əlbir olan ermənilərə qarşı öz doğma vətənlərini müdafiə edirdilər.

1804-cü il avqustun 31-də knyaz Sisianov general-mayorlar Tuçkov, Leontyev, Portnyagin, polkovnik Maykov, podpolkovniklər Simonoviç və baron Klot fon Yurgenzburqun iştirakı ilə çağırdığı hərbi şurada** İrəvan qalasının mühasirəsinin götürülməsini və qoşunların geri çəkilməsini qərara aldı. Həmin il sentyabrın 1-də Sisianov axırıncı dəfə Məhəmməd xandan İrəvan qalasını təhvil verməsini tə-

*Bu qanlı döyüşdən yalnız bir erməni xilas ola bildi. Onun Sisianova çatdırdığı məlumata görə, "topları ələ keçirdilər, yalnız 1 yaralı zabiti və 15 əsgəri əsir götürdülər, qalanlarını isə məhv etdilər". General Sisianov bu məlumatın gizli qalmasını tələb etdi [bax: 74, 275].

** Müzakirə zamanı podpolkovnik baron Klot fon Yurgenzburq bildirdi: "Qalada — qarşımızda dəfələrlə güclü olan qarnizon, arxamızda isə çoxsaylı düşmən ordusu olduğu üçün qalaya hücum mümkünsüzdür. Ona görə də mühasirəni götürməyi təklif edirəm". General Portnyagin isə çoxlu yaralının olması və atların çatışmaması ucbatından geri qayıtmağın çətin olacağını bildirdi. Nəhayət, gərgin müzakirələrdən sonra digər şura üzvləri də geri çəkilmək təklifini qəbul etdilər [bax: 74, 275-276].

ləb etdi. Onun bu müraciətinə ertəsi gün Məhəmməd xan yenidən rədd cavabı verdi. Yalnız bundan sonra — sentyabrın 3-də rus qoşunlarının geri çəkilməsi barədə əmr verildi [26, sənəd 1242, s.619; 178, 154-155; 74, 275-276; 115, 104].

Cənubi Qafqazın işğalı zamanı Azərbaycana xəyanət edən və buna görə də rus hərbçilərinin hər cür kömək göstərdiyi ermənilər yaşadıqları yerləri tərk edib Rusiyanın işğalı altında olan Azərbaycan torpaqlarına köçürdülər. Belə ki, məlik Abraham və yüzbaşı Qavril 200 ailə ilə birlikdə Rusiyanın nəzarəti altında olan Qarakilsəyə köçərək Sisianova "İrəvan qalası ətrafında yaşayan və qaçmaq imkanı olmayan 500 erməni ailəsinin də xilas edilməsi" üçün yalvarırdılıar [26, sənəd 1256, s.626; 74, 283; 172, 22]. Bundan əlavə, İrəvan xanının ona xəyanət edən təbəələrini cəzalandırması təbii idi.

Göründüyü kimi, general Sisianov bu yürüşdə öz doğma torpağını qoruyan Azərbaycan vətənpərvərlərinin inadlı müqavimətinə rast gəldi və mühasirəyə aldığı İrəvan qalasını ələ keçirə bilmədi. Mənbənin məlumatına görə, İrəvan qalasının birinci mühasirəsi zamanı Rusiya komandanlığı 2000-ə yaxın hərbçi itirmişdi [26, sənəd 1682, s.815-816]. Beləliklə, rüsvayçı uğursuzluğa düçar olan çar qoşunları geri çəkilməyə məcbur oldu. Lakin bu, məcburiyyət nəticəsində atılan müvəqqəti addım idi. Rusiya qoşunları İrəvan qalasının mühasirəsindən əl çəksələr də, strateji əhəmiyyətə malik İrəvan xanlığı ərazisinin işğal olunması Rusiya hərbi dairələrinin əsas məqsədi olaraq qalırdı. Məhz bu səbəbdən İrəvan xanlığının ərazisini hissə-hissə işğal etmək ön plana keçirildi. 1805-ci il martın sonlarında İrəvan xanlığına tabe olan, strateji və iqtisadi baxımdan əlverişli olan Şörəyel sultanlığı rus qoşunları tərəfindən tamamilə işğal edildi* [bax: 26, sənəd 1672, s.572-574].

---

* Şörəyelin itirilməsi ilə barışmayan İrəvan xanı Məhəmməd xan Qacar öz sərkərdələri Qasım bəy və Məhəmmədəli bəyin başçılığı ilə oraya 3 minlik qüvvə göndərdi. İrəvan xanının qoşunları ilə general-mayor Nesvetayevin başçılıq etdiyi işğalçı rus ordusu arasında Böyük Talın kəndində qanlı döyüş baş verdi. Lakin son nəticədə İrəvan xanının qoşunları məğlub olaraq Üçkilsəyə doğru geri çəkildi. Rus qoşunları onları təqib etsə də, Məhəmməd xan Qacarın əlavə qüvvə toplayaraq hücuma hazırlaşması xəbərini eşidən general-mayor Nesvetayev rus qoşunlarına geri çəkilmək əmri verir [26, sənəd 1672, s.573-574].

Rusiyanın işğalçılıq niyyətindən xəbərdar olan Abbas Mirzə 1805-ci ilin yayında "xarici siyasətdə ardıcıl olmayan" Məhəmməd Hüseyn xan Qacarı hakimiyyətdən uzaqlaşdırıb Mehdiqulu xan Qacarı İrəvan xanlığında hakimiyyətə gətirdi [26, sənəd 1256, s.626; 200, 14-15; 188, 113].

1806-cı ilin əvvəllərində Sisianov yenidən İrəvan istiqamətində hücuma keçmək qərarına gəldi. Lakin onun Bakı əməliyyatı zamanı öldürülməsi bu işğalçı yürüşün həyata keçirilməsinə mane oldu. Həmin ilin iyununda Sisianovun yerinə İ.V.Qudoviç Qafqazın ali baş komandanı təyin edildi və ona Azərbaycan xanlıqlarını tamamilə işğal edib Rusiya imperiyasının tərkibinə qatmaq tapşırığı verildi [8, 72-73; 39, 187-188].

Qeyd olunan dövrdə İrəvan xanlığının daxilində vəziyyət sabit deyildi. Mehdiqulu xanın vergiləri artırması və əhalini qarət etməsi nəticəsində irəvanlılar ona qarşı üsyan qaldırdılar [26, sənəd 1256, s.626-627]. 1806-cı ilin yayında Mehdiqulu xan Qacarı Təbriz və Marağa xanı Əhməd xan əvəz etdi [82, 5; 74, 368-370]. Marağalı Əhməd xan əhalinin Mehdiqulu xan tərəfindən qarət olunan əmlakını geri qaytardı, İrəvanda xeyli abadlıq işləri və müdafiə tədbirləri gördü. O, üç aylıq hakimiyyəti dövründə əhalinin rəğbətini qazansa da, İrəvanda baş qaldıran epidemiya nəticəsində 1806-cı il oktyabrın 17-də vəfat etdi. Bu hadisə şahzadə Abbas Mirzəni çox məyus etdi [98, 285-286; 74, 380]. Əhməd xan Marağalının vəfatından sonra Fətəli şahın tələbi ilə xanlıqdan uzaqlaşdırılan Məhəmməd Hüseyn xan Qacar yenidən İrəvan xanlığına geri qayıtsa da [bax: 27, sənəd 792, s.421], hakimiyyətini davam etdirə bilmədi. Mənbələrdə artıq 1806-cı ilin dekabrında İrəvan xanlığında hakimiyyətdə Hüseynqulu xan Qacarın olduğu qeyd edilir [27, sənəd 129, s.69-70; 74, 456; 95, 167; Bax: şəkil 1].

Bəhs olunan dövrdə beynəlxalq vəziyyət Rusiyanın xeyrinə deyildi. Çar Rusiyasının Cənubi Qafqaza təcavüzü təkcə Qacarlar İranı və

Türkiyənin deyil, Fransa və İngiltərənin də qəti etirazına səbəb oldu. 1806-cı ilin dekabrında Osmanlı dövləti Rusiyaya müharibə elan etdi. Bu, Rusiyanın Cənubi Qafqazda vəziyyətini xeyli ağırlaşdırdı. Fransadan Türkiyəyə əsgərlərə təlim keçmək üçün zabitlər və müdafiə istehkamları yaratmaq üçün mühəndislər göndərildi. Fransız mühəndislərinin rəhbərliyi ilə Türkiyənin sərhəd bölgələrində hərbi istehkamlar və qalalar inşa olundu [115, 106]. İki cəbhədə müharibə aparmağa çətinlik çəkən Rusiya kapitan Stepanovu danışıqlar aparmaq üçün İrana göndərdi. Qudoviçin təklifinə görə, Rusiya və İran arasında sərhəd İrəvan xanlığı da daxil olmaqla, Kür və Araz çaylarından keçməli idi. Lakin İranda olan Fransa diplomatları bu danışıqları poza bildilər [bax: 27, sənəd 831, s.456-460; 178, 268].

1807-ci ildə bağlanmış Fransa — İran müqaviləsinə görə, Fransadan İrana general Qardanın başçılığı ilə bir dəstə mühəndis gəldi. İrəvanın strateji əhəmiyyəti nəzərə alınaraq, onların bir hissəsi şahın xahişi ilə İrəvana gələrək qalanın müdafiəsini möhkəmləndirməyə başladı. General Qudoviç İrəvan qalasının fransız hərbi mühəndisləri tərəfindən xeyli möhkəmləndirilməsi barədə yazırdı: "İrəvan qalasının Avropa hərbi qaydaları üzrə möhkəmlənmiş iki divarı, xəndəyi və torpaqdan düzəldilmiş səddi var. Təpənin üstünə əvvəllər burada yerli hərbçilər tərəfindən istifadə edilməyən karteçlə işləyən toplar qoyulmuşdur. İrəvanlılar fuqas bombalarından istifadə edirlər ki, bu da fransız mühəndislərinin fəaliyyətinin nəticəsidir" [27, sənəd 467, s.254; 115, 107-108]. Yeri gəlmişkən, bu zaman irəvanlılar tərəfə keçən podpolkovnik Koçnev də rusların yürüşü ərəfəsində bu işə cəlb edilmişdi [74, 462-463; 132, 90].

Qudoviçin mərkəzə göndərdiyi məktublarından məlum olur ki, fransız mühəndisləri Üçkilsə monastırını da möhkəmləndirməklə məşğul olurdular. Hətta, fransızlar Qudoviçdən İrəvan diyarından çıxmasını tələb edirlər. O yazır: "…Mən qoşunlarımla Pəmbək istiqamətində hərəkət edərək İrəvan sərhədlərinə yaxınlaşmazdan əvvəl

fransızlar öz mühəndis və zabitlərini …İrəvan qalası və Üçkilsə monastırını möhkəmləndirmək üçün göndərmişlər" [79, iş 4265, v.17-18; 115, 108]. Digər bir məktubunda isə Qudoviç bildirir ki, "fransızlar məndən İrəvan vilayətini tərk etməyi tələb edirlər, halbuki bu yerlərə mən silah gücü ilə sahib olmuşam" [75, sənəd 168, v.60-72; 115, 108].

Cənubi Qafqazı güzəştə getmək istəməyən Qacarlar İranı Rusiyanın sülh təklifini qəbul etmədi. Rus qoşunları bundan bir bəhanə kimi istifadə edərək 1808-ci ilin baharında İrəvan istiqamətində yenidən hücuma keçdilər. İrəvanı ələ keçirmək üçün uzun müddət hazırlıq görmüş rus qoşunları İrəvan, Qars və Axalsıx tərəfdən İran və Türkiyə qoşunlarının gözlənilməz hücumlarının qarşısını almaq üçün Pəmbəkdəki Qarakilsə, habelə Dərəbaş, Hamamlı, Qacarabad, Gümrü kimi yerlərdə istehkamlar inşa etmişdilər. 1808-ci ilin sentyabrında Qudoviç Pəmbəkdən 6 minlik qoşun və 12 topla İrəvan istiqamətində hərəkət etdi. Digər məlumatda isə, rus qoşunlarının tərkibi 240 zabit və 7506 süvari əsgərdən ibarət idi. 500 nəfərdən çox erməni süvarisi də işğalçı orduya qoşulmuşdu [151,209; 115, 109-110].

Təcavüzkar Rusiya ordusu və onlara köməklik göstərən ermənilərin Azərbaycan torpaqlarında həyata keçirdikləri işğallarda hərəsinin öz marağı vardı. İrandan və Osmanlı imperiyası ərazisindən İrəvan xanlığı ərazisinə axışmağa başlayan ermənilər yaranmış vəziyyətdən istifadə edərək Azərbaycanın qərb torpaqları hesabına "erməni dövləti" yaratmaq məqsədlərinə çatmağa çalışırdılar. Məqsədlərinə yetmək üçün dəridən-qabıqdan çıxan ermənilər rus komandanlığına müxtəlif cür məxfi xarakterli məlumatlar verir, Rusiya hakim dairələrinə müxtəlif məzmunlu məktublar göndərir, onları özlərinin "xilaskarı" hesab edir, rus qoşunlarını İrəvanın işğalına şirnikləndirir və səbirsizliklə onların yolunu gözlədiklərini qeyd edirdilər [26, sənəd 1258, s.627]. Rusiya dövləti isə, öz növbəsində, Cənubi Qafqazı ələ keçirdikdən sonra Azərbaycanın qərb torpaqlarında yerli azərbay-

canlılara və qonşu müsəlman dövlətlərinə qarşı "erməni bufer vilayəti" yaratmaq məqsədilə ermənilərin göstərdikləri bütün köməklərdən, o cümlədən maliyyə vəsaitlərindən lazımınca istifadə edirdi.

Rus zabitləri onlara kömək edən ermənilərin "cəsurluğunu" yüksək qiymətləndirir, onlara tez-tez yazılı təşəkkürlər verməkdə öz səxavətlərini əsirgəmirdilər [bax: 180, 7-30, 56-62, 85-103].

Rusiya dövlətinin İrəvan xanlığını işğal etmək niyyətindən əl çəkməyəcəyini bilən Hüseynqulu xan Qacar hakimiyyətə gələn kimi dərhal müdafiə tədbirlərinə başladı. O, hələ 1806-cı ilin dekabrında Zəngi çayından başlayaraq İrəvan qalasının ətrafındakı xəndəyi daha da dərinləşdirdi və möhkəmlətdi, qalanı müdafiə edən qoşunların sayını artırdı [27, sənəd 424, s.232; 74, 456]. Rus qoşunlarının İrəvana hücumu ərəfəsində xan artıq İrəvan qalasını fransız mühəndislərinin köməyi ilə Avropa üslubunda yenidən möhkəmləndirdi. İrəvanın qalın qala divarlarının çöl tərəfində səngərlər qazıldı və bu səngərlərə toplar düzüldü. Döyüşlərdə fuqas adlı xüsusi bombalardan istifadə olunurdu [27, sənəd 467, s.254]. Məhz bu səbəbdən Rusiya komandanlığı xüsusi casuslar vasitəsilə İrəvan xanının qounlarının sayı haqda məlumatlar toplayırdı [27, sənəd 436, s.235].

Sentyabrın 26-da artıq rus qoşunları dağıdılmış Abaran kəndinə gəlib çatdı. Hüseynqulu xan Qacar İrəvanı müdafiə etmək üçün kiçik qardaşı Həsən xanı 2 min nəfər döyüşçü ilə qalada qoyaraq özü 4 min nəfər piyada ilə rus qoşunlarının qarşısına çıxdı. Lakin Əştərəkdə məğlub olan İrəvan xanı geri çəkilməyə məcbur oldu. 1808-ci il sentyabrın 30-da ermənilər Üçkilsəni rus qoşunlarına təslim etdilər. İşğalçılar burada sevinclə qarşılandılar [27, sənəd 453, s.243].

## *İrəvan qalasının ikinci mühasirəsi və rus qoşunlarının rüsvayçı məğlubiyyəti (3 oktyabr — 30 noyabr 1808-ci il)*

Qudoviçin başçılığı ilə Üçkilsəni ələ keçirən rus qoşunları İrəvan yaxınlığındakı Qarabağ kəndində mövqe tutdu. Hüseynqulu xan düşmənə qarşı Gərniçay sahilində düşərgə salsa da, ilk döyüşdə məğlub oldu [79, iş 4265, v.4-16; 115, 110; 178, 295-297]. Artıq oktyabrın 3-də Qudoviçin rəhbərlik etdiyi rus qoşunları Zəngi çayını keçərək İrəvan qalasını mühasirəyə aldı [27, sənəd 450, s.244]. Qudoviç şəhər əhalisindən və İrəvan qalasının komendantı Həsən xan Qacardan təslim olmağı tələb etdi. Qraf Qudoviç oktyabrın 4-də öncə İrəvan əhalisinə məktubla müraciət edərək onları könüllü olaraq rus qoşunlarına tabe olmağa çağırdı, özlərinin və əmlaklarının toxunulmazlığına söz verdi. Müqavimət göstərəcəkləri halda isə aman verilməyəcəyi ilə hədələdi.*

İlk döyüşdə rus qoşunlarına məğlub olan Hüseynqulu xan İrəvan istiqamətində hücuma keçərək qalaya daxil olmağa səy göstərdi. Xanın məqsədi rus qoşunlarına kənardan qəfil zərbələr endirməklə onları İrəvanın mühasirəsindən uzaqlaşdırmaq idi. Lakin Qudoviç general-mayor Portnyaginin başçılıq etdiyi hərbi hissəni Hüseynqulu xanı təqib etmək üçün göndərərək onun planını baş tutmağa qoymadı [27, sənəd 450, s.244; 178, 298-299; 115, 110]. İrəvan əhalisinə müraciətinin heç bir nəticə vermədiyini görən rus qoşunlarının baş komandanı Qudoviç qalanı bombardman etmək məqsədilə qalaətrafı strateji nöqtələri tutmaq əmrini verdi.** Ciddi müqavimətlə rastlaşan rus qoşunları oktyabrın 9-u günortaya yaxın əmri yerinə yetirə

---

* Qudoviç lovğalanaraq məktubda yazırdı: "İrəvanın əvvəlki müvəffəqiyyətsiz mühasirəsindən (1804 — ***red.***) nümunə götürməyin, onda vəziyyət tamamilə başqa idi, indi başqadır. …tabeliyimdəki qoşunla nəinki İrəvan qalasını məhv edərəm, hətta İranı belə keçərəm [27, sənəd 443, s.237].

** Oktyabrın 7-si gecə polkovnik Simonoviçin başçılıq etdiyi dəstə qalanın şimal tərəfində yerləşən Təpəbaşını, Borşovun dəstəsi Zəngi çayını keçərək qalanın cənub-qərbində yerləşən Mağtəpə kurqanını, mayor Buxvotsovun dəstəsi isə qalanın cənub-şərqində yerləşən, ətrafı bağlarla əhatə olunmuş Muğanlıtəpə kurqanını ələ keçirə bildi [27, sənəd 453, s.244-245; 178, 296-297].

bildi. Ətraf aləmdən təcrid olunan İrəvan qalası işğalçı rus qoşunu tərəfindən bombardman edildi [27, sənəd 453, s.244-245; 178, 296-297].

İrəvan qalasını ətraf aləmdən təcrid etməyə müvəffəq olan Qudoviç oktyabrın 17-də növbəti hədələyici və şirnikləndirici məktubla İrəvan qalasının komendantı Həsən xan Qacara müraciət etdi.* Həsən xan Qacar oktyabrın 21-də general Qudoviçə göndərdiyi cavab məktubunda qalanı heç bir zaman təslim etməyəcəyini bildirdi [74, 473].

Hüseynqulu xan isə qalanın mühasirəsini yarıb şəhərə daxil olmağa çalışır, vaxtaşırı düşmənə zərbələr endirirdi. Belə olduqda Qudoviç mühasirə olunmuş qalaya hücumu müvəqqəti dayandıraraq Hüseynqulu xanın üzərinə böyük bir hərbi dəstə göndərdi [27, sənəd 458; s.248-249]. Podpolkovnik Podlustskinin başçılıq etdiyi həmin dəstə ilə döyüşdə irəvanlılar məğlubiyyətə uğradılar. Xan sağ qalan qüvvələrini qorumaq üçün Arazın o tayına çəkilməli oldu. Bu hadisədən xəbər tutan Fətəli şah Qacar irəvanlılara yardım etmək məqsədilə Fərəculla xanın başçılığı ilə 5 min nəfərlik qoşun göndərdi. Qorxuya düşən rus komandanlığı general-mayor Portnyagini əlavə qoşunla Podlutskinin dəstəsinə göməyə göndərdi. Lakin Hüseynqulu xan rus qoşunlarının əsəbləri ilə oynayaraq hər dəfə açıq döyüşə girməkdən yayınırdı [27, sənəd 453, s.245].

Qudoviç İrəvan qalasını mühasirədə saxlamaqda ikən Naxçıvan xanlığı general Nebolsinin rəhbərlik etdiyi rus qoşunları tərəfindən işğal olundu. Lakin nə Naxçıvanın işğalı, nə də İrəvan qalasının sudan məhrum edilməsi** irəvanlıların döyüş ruhunu qıra bilmədi.

* Qudoviç İrəvan sərdarının qardaşı Həsən xan Qacara Hüseynqulu xanı məğlub etdiyini, onlara heç bir kömək gəlməyəcəyini bildirdi. Qalanı könüllü təslim edəcəyi halda onu sərbəst buraxaraq Arazı keçməyə icazə verəcəyini, əgər qalmaq istəsə, İrəvan qalası və şəhəri istisna olmaqla, bütün xanlığın hakimi təyin olunacağına Rusiya imperatoru adından söz verirdi [27, sənəd 447, s.239-240].

** İşğalçı rus ordusu və ona kömək edən ermənilər tərəfindən mühasirəyə alınmış İrəvan qalasının atılan top mərmiləri nəticəsində iki qülləsi sıradan çıxmış, qalanın divarları zədələnmişdi. İrəvanlıların mübarizə ruhunu qırmağa çalışan işğalçı ordu daha qəddar bir tədbirə əl atdı. Teymur bulağından İrəvan qalasına çəkilmiş suyun qarşısını kəsərək irəvanlıları sudan məhrum etdi. Lakin onların bu niyyəti baş tutmadı, cəsur müdafiəçilər top atəşi altında gecə vaxtı suyu Zəngi çayından qalaya çəkə bildilər [27, sənəd 453, s.246].

Mühasirənin başlamasından 40 günə yaxın keçməsinə baxmayaraq, qala qarnizonu və şəhər əhalisi işğalçılara qarşı qəhrəmancasına müqavimət göstərirdi [178, 299-302; 132, 91]. İrəvanlıların inadkarlığını görən qraf Qudoviç İrəvan qalasının komendantı Həsən xanla yenidən danışıqlara başladı və ona şirnikləndirici məktubla müraciət etdi. Noyabrın 12-də yazmış olduğu məktubunda dəfələrlə "möhtərəm komendant" ifadəsini işlədərək qalanı rus qoşunlarına təhvil verməsini xahiş etdi [27, sənəd 458, s.248-249].

Qudoviçin təslim olmaq tələblərinə cavab olaraq, Həsən xan Qacar çar zabitinə yazırdı: "Nə olursa-olsun biz sizinlə nəinki qalanın içində (bu o qədər də çətin deyil!), eləcə də açıq düzdə vuruşmağa hazırıq. Məlumunuz olsun ki, qala qarnizonu bu barədə artıq öz qərarını verib" [27, sənəd 460, s.249-250; 178, 301; bax: bölmənin sonu, sənəd 1]. Bundan əlavə, məktubu Qudoviçə yetirən İrəvan elçisi qala qarnizonunun axırıncı adam həlak olana qədər silahı yerə qoymayacağını bildirdi [151, 222; 178, 301].

Naxçıvanın rus qoşunları tərəfindən işğal olunmasına baxmayaraq, Qudoviç İrəvan qalasını ələ keçirmək üçün hücuma keçməyə cəsarət göstərmir, hələ də Həsən xanla məktublaşır və ondan İrəvan qalasını təhvil verməsini tələb edirdi. Bundan istifadə edən Həsən xan Qacar rədd cavabı verməklə vaxt qazanır və qalanın müdafiəsini daha da möhkəmləndirirdi [79, iş 4266, v.1-2; 115, 111; 178, 301].

Mühasirənin uzanması, soyuqların düşməsi və ərzaq çatışmazlığı rus qoşunlarının vəziyyətini getdikcə ağırlaşdırırdı. Nəhayət, Qudoviç qalanı hücumla ələ keçirməyi qərara aldı. İrəvan qalasına hücum 1808-ci il noyabrın 17-si səhər saat 5-ə təyin edildi [27, sənəd 895, s.509]. Rus qoşunları beş kalona bölündü. Dörd kalon müxtəlif istiqamətlərdən hücum etməli, beşinci kalon isə ehtiyatda dayanmalı idi. İrəvan qalasına hücum edən qoşunların sayı 3000 nəfərə yaxın [172,

26], digər mənbədə isə 4645 nəfər idi [27, sənəd 467, s.253-256]. Lakin onlar irəvanlıların ciddi müqavimətinə rast gəldilər. Hücum başlanan kimi irəvanlılar top atəşləri ilə rusları geri oturtdular. Rus qoşunlarının düzəltdiyi nərdivanlar qalaya daxil olmağa kifayət etmədi. Nəhayət, 1000 nəfərə yaxın itki verən rus qoşunları hücumu dayandırmağa məcbur oldu [41, h.III, 390]. Digər mənbənin məlumatına görə, rus qoşunlarından 17 zabit, 269 əsgər məhv olmuş, 64 zabit, 829 əsgər isə yaralanmışdı [27, sənəd 467, s.256]. Şəhərə daxil ola bilməyəcəyinə əmin olan Qudoviç noyabrın 30-da səhər tezdən İrəvanın mühasirəsindən əl çəkərək rus qoşununa Tiflisə qayıtmaq haqqında əmr verdi. Dekabırın 1-də Naxçıvanda möhkəmlənən rus qoşunları da oranı tərk etməli oldu [27, sənəd 895, s.509, 510; 178, 304-305].

Rusiya imperiyasının sifarişi ilə yazılmasına baxmayaraq, "Qarabağnamə" müəllifləri də İrəvanın mühasirəsi zamanı rus qoşunlarının heç bir iş görə bilmədiyini, "məqsədinə çatmadan qayıtmaq təbilini çaldırıb Darüssürura (Tiflisə) qayıtdı"ğını qeyd edirlər [8, I, 75; 8, II, 55].

Beləliklə, Vətən torpağının azadlığı uğrunda mübarizəyə qalxan İrəvan qalasının müdafiəçiləri bir-birinin ardınca çar generalları Sisianovu və Qudoviçi rüsvayçı məğlubiyyətə uğratdılar.

Məğlubiyyətə uğramış rus qoşunlarının İrəvan qalasına hücumu zamanı itkisi də çox oldu. Qudoviçin çara göndərdiyi raportunda isə bu itkilər barədə rəqəmlər kiçildilir, guya Rusiya tərəfindən cəmi 17 zabit və 269 əsgərin öldürüldüyü, 64 zabit və 829 əsgərin isə yaralandığı göstərilirdi [27, sənəd 467; 132, 92]. N.Dubrovinin məlumatı da irəvanlıların bu döyüşdə rus qoşunları üzərində parlaq qələbə çaldıqlarını təsdiq edir. Onun yazdığına görə,"…alaylar (rus ordusu alayları — ***red.***) elə vəziyyətə düşdü ki, təkrar hücum haqqında düşünməyə belə dəyməzdi" [151, 224; 132, 92; 178, 304]. Azərbaycan vətənpərvərlərinin hücumları və güclü qar yağması nəticəsində rus qoşunları da-

ha 1000 nəfərə yaxın itki verərək geri çəkildi [178, 305]. Yeri gəlmişkən, İrəvan xanının qardaşı Həsən xan Qacarın qəhrəmanlığını, hətta, erməni müəlliflər də etiraf edirlər. Baş komandanın qalanı yenidən təslim etmək tələbinə cavab olaraq Həsən xan Qacar yazırdı: "…Tələb edirsiniz ki, İrəvan qalasını könüllü təslim edim, əvəzində isə İrəvan xanlığını mənə verəcəksiniz. Əgər bu cür əməl yaxşıdırsa, onda siz İran hökmdarına qulluq edin ki, əvəzində İrəvan, Təbriz və başqa xanlıqları alasınız" [74, 473; 178, 298].

İrəvanı ələ keçirmək ümidindən əli üzülən Qudoviç Naxçıvandan geri çəkilən general Nebolsinə rus qoşunları ilə getmək istəyənləri (Azərbaycana xəyanət etmiş ermənilər nəzərdə tutulur — ***red.***) Qarabağa aparmağı tapşırdı [27, sənəd 462, s.250-251]. Bu yürüş rus qoşunlarına çox baha başa gəldi və demək olar ki, hərbi əməliyyatlarda iştirak edənlərin yarısı məhv oldu.

Beləliklə, Rusiya qoşunlarının İrəvan üzərinə ikinci yürüşündə rüsvayçı məğlubiyyətə uğrayan və Quba yürüşündə heç bir nəticə əldə edə bilməyən Qudoviç 1809-cu ilin fevralında erməni mənşəli Tormasovla əvəz olundu [39, 191].

Rusiyanın Cənubi Qafqazdakı uğursuzluqları regionda ingilislərin fəallaşmasına səbəb oldu. Rusiya imperiyasının əleyhinə kampaniyaya başlamaq istəyən ingilislər İranın xarici siyasətində mühüm rol oynamağa başladılar. Bu məqsədlə ingilis hərbi mütəxəssislərinin bir dəstəsi Türkiyə ərazisindən İrəvana gəldi. Onların təkidi ilə İrəvan xanı Hüseynqulu xan 20 minlik qoşunla Türkiyə ərazisindən Gürcüstana hücum etdi. Lakin o, bu yürüşdə uğurlu nəticə əldə edə bilmədi [bax: 28, sənəd 1112, s.725; 28, sənəd 1127, 736; 115, 112].

1810-cu ilin aprelində şahın təklifi ilə Əskəranda Rusiya ilə Qacarlar İranı arasında danışıqlar başlandı [178,160]. Danışıqlarda Rusiya Naxçıvan və İrəvan xanlıqlarını, İran isə Lənkəran xanlığını tələb

edirdi. Danışıqların aparıldığı dövrdə Rusiya İrəvan xanını öz himayəsinə girməyə məcbur etmək üçün bir-birinin ardınca İrəvana qarətçi və dağıdıcı hərbi yürüşlər təşkil etməyə başladı. Bu yürüşlərdə irəvanlıları qorxutmaq üçün ən dəhşətli metod və vasitələrdən istifadə olunurdu. Baş komandanın belə yürüşlərdən birinə hazırlaşan Lisaneviçə verdiyi göstərişdə deyilirdi: "Bu ekspedisiya ilə onlara qarşı güclü dəhşət və dağıntılar törədin ki, bu, heç vaxt onların yadından çıxmasın. Bacardıqca çoxlu ailə əsir götürün" [29, sənəd 170, s.120; bax: bölmənin sonu, sənəd 2]. Belə bir tapşırıq Corayevə də verilmişdi [28, sənəd 666, s.478]. 4 tabor və 200 atlı ilə qəfil hücum edən Lisaneviç 10 gün ərzində göstərişi "layiqincə" yerinə yetirdi: çar Rusiyası ordusunun vəhşiliyi nəticəsində çoxlu dinc əhali qətlə yetirildi, kəndlər dağıdıldı. Bu vəhşiliklərin şahidi olan əhali rus ordusunun gəldiyini eşidən kimi hər yerdə ev-eşiyini tərk edərək vahimə içərisində dağlara və Arazın o tayına qaçırdı [29, sənəd 172, s.122].

1813-cü ilin martında polkovnik Pestel İrəvan xanlığına qarşı yeni yürüşə başladı. Xeyli canlı qüvvə və 6 topla hücum edən rus qoşunları xanlığın əhalisinə ağır zərbə vurdu. Baş komandan həmin yürüşdəki "şücaətinə" görə Pesteli II dərəcəli Anna ordeninə təqdim etdi [74, 616-617]. Bütün bu qanlı işğalçılıq yürüşlərinə və ermənilərin hərtərəfli yardımlarına baxmayaraq, Rusiya yenə də İrəvan xanlığını özünə tabe edə bilmədi.

1813-cü il sentyabrın 27-də Qarabağda — Zeyvə çayı sahilindəki Gülüstan kəndində rus dövləti ilə şahın nümayəndəsi arasında sülh danışıqları başladı. Qacarları Mirzə Əbülhəsən Şirazi, rus tərəfini isə Rusiyanın Qafqazdakı baş komandanı Nikolay Rtişşev təmsil edirdi. Nəhayət, oktyabrın 12-də (yeni üslubla 23-də) 11 maddəlik sülh müqaviləsi bağlandı [29, sənəd 879, s.736; 29, sənəd 883, s.739-747]. İran heç bir hüquqi əsasa malik olmadığı halda Azərbaycanın Arazdan şi-

maldakı müstəqil xanlıqlarının (İrəvan və Naxçıvan xanlıqları istisna olmaqla) ərazilərini Rusiyaya güzəştə getdi. Beləliklə, Azərbaycan xalqının iradəsi nəzərə alınmadan və razılığı olmadan onun torpaqları iki işğalçı imperiya arasında bölüşdürüldü. Bu, Azərbaycan torpaqlarının Qacarlar İranı ilə Rusiya arasında birinci dəfə bölüşdürülməsi idi. Gülüstan müqaviləsi zamanı Rusiyanın İrəvan və Naxçıvan xanlıqlarını ələ keçirə bilməməsinin əsas səbəbi bu xanlıqların yerli əhalisi olan Azərbaycan vətənpərvərlərinin işğalçılara qarşı apardığı qəhrəmanlıq mübarizəsi idi.




Xəritə 1.
Rusiya qoşunlarının İrəvan xanlığına işğalçı yürüşləri
***Mənbə:*** Григорян З.Т. Присоединение Восточной Армении к России в начале XIX в. Москва, 1959, с.83




Xəritə 2. İrəvan xanlığının planı

***Mənbə:*** Покоренный Кавказ (очерки исторического прошлого и современного положения Кавказа с иллюстрациями). Книга I-V, СПб., 1904


Талышъ
Пироганъ
Егвартъ
Аштаракъ
Кизилтамуръ
Уджавъ
Ушаганъ
Г. Кизилларъ
Айкланлы
ЭЧМІАДЗИНЪ
ЭРИВАНЬ
пр. Норкъ
АБАТЪ
Колюбеклю
Курдукули
Зейва
Агджа кишлякъ
Р. Кара-су
Р. Занга
Агамвалы
Улуханлы
Каратапа
Диза
Алиджанъ
Тоханшалу
Зильфутаръ
Джанатабатъ
Теиджерлю
Рамазанъ кяндъ

**460.** *Тоже, Хасан-хана Эриванскаго къ гр. Гудовичу.*

. . . . . مراسلهٔ آنعالیجاه واصل و از مضامینش اطّلاعی
حاصل شد اینکه قلمی نموده بودند که قلعهٔ ایروانرا بدون
تأخیر بتصرف داده باشیم چون قلمی نموده اند که قشون
مارا شکست داده از رود ارس گذرانیده ظاهر است که ما ها
وقتی باین قلعه داخل و وارد گردیدیم چشم اعانت و امداد
از قشون خودمان پوشیده وجود ایشانرا با عدم ایشان مساوی
دانسته مطلقا انتظاری ازجانب ایشان نداریم بهرجا رفته
باشند خوب است بحمد الله تعالی احتیاج امدادی نداریم
و نیز قلمی نموده بودند که از شدّت توپ ها بروج قلعه خراب
گشته و چند عراده توپ از برج بزمین افتاده است ازین
عبارت و فقرات ملازمان سامی معلوم کردند که مقدّمات
دعوی نخچوان هم بهمین قسم خواهد بود بهر صورت ماهارا
خیال اینکه بدون قلعه و توپ درخارج و صحرا هم توانست
کاری کرده باشیم و اگرچه کسی دراندرون قلعه توقّف
و مشغول کارخود گردد چندان کاری نکرده همه کسرا قوّه
آنست که دراندرون قلعه نشسته آنچنانی که درقریهٔ آخرکلك
نشسته و ملاحظه شده که بچه منوال آخر کار صورت گرفت
و دیگراینکه اظهار کرده بودند که بزورویورش قلعه را مسخّر
نموده خواهند بود پس معلومست که بعد از اینکه ارادهٔ یورش
کردند بطریقی صورت انجام خواهد که بالمرّه رفع قیل
وقال ازطرفین شده فارغبالی کلّی حاصل گردد و کسانیکه
درین قلعه هستند دست از جان خود کشیده منتظر تقدیرات
الهی بوده و میباشند و درمراسلهٔ خودیشان نیزقلمی داشته
بودند که درجواب مراسلات عالیجاهان میرزا محمّد شفیع
و میرزا بزرگ مرقوم شده که از جانب پادشاه ماحکم گردیده
است که قلعهٔ ایروان گرفته باشیم واز جانب پادشاه جمجاه
بما نیز حکم و مقرّر شده است محافظت قعله را کرده باشیم
پس حقّ مطلب آنست که ملازمان سامی مصحوب فرستادهٔ
عالیجاهان معزّی الیهما قلمی و ارسال داشته است منتظر
جواب مراسلات ایشان باشند باقی دردوستی و خیرخواهی
ملازمان سامی موجود و آماده بوده انتظار جواب مراسله داریم

Sənəd 1. Həsən xan Qacarın general Qudoviçə noyabr, 1808-ci il tarixli cavab məktubu (fars dilində). ***Mənbə:*** AKAK, т. III. Тифлис, 1869, д. 460, с.249

..... Я получилъ письмо в. с., въ которомъ вы предлагаете мнѣ уступить вамъ кр. Эривань, сообщивъ мнѣ, что вы разбили нашу армію и прогнали за Араксъ. Да будетъ вамъ извѣстно, что мы, вступивъ въ эту крѣпость, закрыли глазъ отъ надежды на помощь со стороны своей арміи, а существованіе и несуществованіе ея сочли одинаковыми,—слѣдовательно мы не ожидаемъ ее; пусть она удалится куда угодно. По милости Аллаха мы не имѣемъ нужды въ ея содѣйствіи.

Также пишете вы, что отъ дѣйствій вашихъ пушекъ будто нѣкоторыя крѣпостныя башни разрушены и нѣкоторыя наши пушки, помѣщавшіяся на нихъ, опрокинуты. Изъ этихъ фразъ вы заключаете, что вѣроятно и сраженіе подъ Нахичеванью кончится тѣмъ-же. Какъ бы то ни было, мы готовы даже внѣ крѣпости, въ чистомъ полѣ, также дѣйствовать противъ васъ, ибо внутри крѣпости защищаться и дѣйствовать противъ васъ не составляетъ большой важности. Всякій можетъ обороняться внутри крѣпости и быть свидѣтелемъ того же послѣдствія, которое постигло васъ при осадѣ Ахалкалакъ.

Еще вы увѣряете, что силою и штурмомъ покорите крѣпость. Очевидно, что когда дѣло дойдетъ до приступа, конецъ будетъ совершенно удовлетворительный. Во всякомъ случаѣ да будетъ вамъ вѣдомо, что гарнизонъ этой крѣпости уже рѣшился на самоотверженіе и ожидаетъ предопредѣленія Аллаха.

Вы поставляете мнѣ еще на видъ, что въ отвѣтныхъ письмахъ Мирзѣ-Шефи и Мирзѣ-Безюргу вы отвѣчали, что имѣете повелѣніе отъ своего падишаха покорить крѣпость Эривань, но мы также имѣемъ повелѣніе отъ своего падишаха защищать ее. Слѣдовательно ожидайте отвѣта отъ названныхъ лицъ.—Въ заключеніе пребываю вашимъ другомъ и доброжелателемъ и остаюсь въ ожиданіи отвѣта.

Sənəd 1, davamı. Həsən xan Qacarın general Qudoviçə noyabr, 1808-ci il tarixli cavab məktubu, (rus dilində). ***Mənbə:*** AKAK, т. III. Тифлис, 1869, д. 460, с.250

подъ военнымъ присмотромъ съ 1804 года по сіе время, стоили большихъ и вмѣстѣ съ тѣмъ напрасныхъ издержекъ для казны Е. И. В., я приказалъ дать имъ свободу и отпустилъ по желанію ихъ въ Персію. Причины-же, побудившія меня взять сію рѣшимость, были тѣ, что я считалъ неприличнымъ содержать подъ арестомъ женщинъ ни въ чемъ невинныхъ и несовмѣстнымъ, чтобы ихъ бояться, также, чтобы избавить казну отъ безполезныхъ издержекъ и прекратить интриги, кои фамилія Джевад-ханская мужескаго пола, ушедшаго въ Персію, не преставала имѣть чрезъ сихъ женщинъ. При томъ-же случай сей представлялъ мнѣ удобность приличнымъ образомъ войти въ сношенія съ наслѣдникомъ Персіи Аббас-мирзою, къ которому я писалъ письмо. Впрочемъ, одна изъ Джевад-ханскихъ женъ по имени Баджи-ханумъ пожелала остаться въ Карабагѣ при дочери своей, находящейся въ замужествѣ за однимъ изъ родственниковъ нынѣ владѣющаго въ Карабагѣ хана, которой я и далъ позволеніе туда отправиться. Въ Персію-же уѣхала Джевад-ханова жена Шюкуфэ-ханумъ, также дочери его отъ разныхъ женъ Хатун-бегюмъ и Балажа-бегюмъ, внукъ Мусахиб-ага, мать его Тути и дочь сына Джевад-ханскаго Угурлу-аги, съ тремя при нихъ служителями.

## Г. ЭРИВАНЬ.

**170.** *Предписаніе маркиза Паулуччи ген.-м. Лисаневичу, отъ 27-го октября 1811 года, № 30.*

Слухи дошли уже сюда, что в. пр. находитесь съ войсками въ Эриванской области; но я, къ совершенному удивленію моему, не имѣю отъ васъ никакого свѣдѣнія ни о положеніи вашемъ, ни о вашихъ дѣйствіяхъ, хотя обязанность ваша была рапортовать мнѣ даже о самомъ выступленіи вашемъ въ сію экспедицію. А потому рекомендую вамъ впредь всегда въ точности исполнять сію обязанность, не оставляя главное начальство въ неизвѣстности. Я призналъ необходимымъ отправить къ в. пр. моего адъютанта, лейб-гусарскаго полка пор. кн. Чавчавадзе съ тѣмъ, чтобы вы чрезъ него доставили мнѣ полныя свѣдѣнія о вашихъ дѣйствіяхъ и успѣхахъ. Между тѣмъ въ особенности поручаю вамъ стараться сею экспедиціею навести сильный ужасъ Персіянамъ и сдѣлать оную надолго памятною Эриванцамъ, чрезъ всевозможное оной раззореніе; наипаче-же старайтесь сколько можно больше захватить въ плѣнъ семействъ и рогатаго скота, хотя до 4 т. штукъ, который по предположенію моему завести подвижной магазинъ весьма для сего употребленія нуженъ. При томъ не упустите, буде можно, взять и денежную контрибуцію съ Эриванцевъ, производя всевозможное опустошеніе. Разгласите также во всей Эриванской провинціи, что новый главнокомандующій въ Грузіи, т. е. я, поставилъ себѣ за непремѣнное правило никогда безъ строгаго наказанія не оставлять малѣйшее со стороны Персіянъ покушеніе на границы, Россійской Имперіи принадлежащія, и что каждый разъ, когда только Персидскія войска гдѣ-бы ни было сдѣлаютъ въ нашихъ границахъ малѣйшее хищничество, то храбрыя войска Россійскія тотчасъ введены будутъ въ самую ихъ землю и подобнымъ образомъ всякій разъ будетъ имъ заплачено. Въ заключеніе-же я долженъ присовокупить, что увѣренъ будучи совершенно въ отличныхъ вашихъ воинскихъ достоинствахъ, опытности и благоразуміи, я остаюсь въ пріятной для меня надеждѣ, что в. пр., руководствуясь испытаннымъ въ васъ похвальнымъ усердіемъ къ службѣ Е. И. В., совершите сію экспедицію соотвѣтственно пользамъ всемилостивѣйшаго Г. И., съ полнымъ успѣхомъ; если-же при томъ удастся в. пр. чрезъ произведеніе сильнаго ужаса въ Персіянахъ сею экспедиціею понудить ихъ искать мира съ Россійскою Имперіею или преклонить Эриванскаго сердаря Хусейн-Кули-хана со всѣмъ его владѣніемъ вступить въ подданство Россіи, на томъ условіи, что ему предоставлены будутъ всѣ его права, преимущества и доходы,—съ тѣмъ только, что въ самой крѣпости поставленъ будетъ Россійскій гарнизонъ: то в. пр. чрезъ сіе окажете весьма важную услугу на пользу службы Е. И. В. и обяжете меня отдать вамъ полную справедливость чрезъ ревностное засвидѣтельствованіе предъ Г. И., что успѣхи сіи суть слѣдствія истиннаго усердія вашего къ пользамъ службы Е. И. В. Когда вы сообразите все сіе дѣло, не оставьте дать мнѣ подробный отчетъ чрезъ моего адъютанта кн. Чавчавадзе.

**171.** *Тоже, отъ 3-го ноября 1811 года, № 37.*

Получивъ рапортъ в. пр., коимъ доносите мнѣ объ успѣхахъ военныхъ дѣйствій, произведенныхъ вами въ Эриванской области, равно и о возвращеніи вашемъ въ границы съ войсками, кои находились въ сей экспедиціи подъ главнымъ вашимъ начальствомъ, поспѣшаю отвѣтствовать в. пр., что я увѣренъ совершенно, что вы при исполненіи возложенной на васъ

Sənəd 2. Markiz Pauluçinin general-mayor Lisaneviçə 27 oktyabr 1811-ci il tarixli göstərişi
***Mənbə:*** AKAK, т.V. Тифлис, 1873, д.170, с.120



Şəkil 1.
İrəvan xanı Hüseynqulu xan Qacar (1806-1827)
***Mənbə:*** http://en.wikipedia.org/wiki/hossein_khan_sardar
(hazırda həmin şəkil göstərilən saytdan "çıxarılmışdır" )

İkinci Rusiya — İran müharibəsi (1826-1828) ərəfəsində İrəvan xanlığı ağır siyasi böhran içərisində idi. Bununla belə, Rusiya işğalı ərəfəsində İrəvanda ticarət geniş inkişaf etmişdi [95, 873-874]. Mənbənin verdiyi məlumata görə, "Sərdarın hakimiyyəti dövründə 57 min puddan çox pambıq istehsal olunduğu halda, hal-hazırda cəmi 1500 puda yaxın pambıq istehsal olunur" [71, h.I, 51]. İrəvan xanlığından ixrac olunan məhsullar hər il 300 min gümüş rubla çatırdı [71, h.IV, 284]. Bu da ilk növbədə xanlığın, Azərbaycanın digər xanlıqlarından fərqli olaraq, öz müstəqilliyini nisbətən uzun müddət qoruyub saxlaya bilməsi ilə bağlı idi.*

Azərbaycan xalqının İrəvan xanlığının müdafiəsi zamanı Rusiya işğalçılarına qarşı azadlıq mübarizəsində göstərdiyi misilsiz qəhrəmanlıq, azadlıq ruhu birinci Rusiya — İran müharibəsinin (1804-1812) sonuna yaxın Qafqazdakı rus qoşunlarının baş komandanı olmuş markiz Pauluqçinin Rusiya imperiyasına təqdim etdiyi 22 fevral 1812-ci il tarixli məlumatında çox aydın əks olunmuşdur. O yazırdı: "Mənim vicdanım üzərimə belə bir müqəddəs vəzifə qoyur ki, Siz əlahəzrətlərinə çatdırım ki, 1802-ci ildə…, habelə 1804-cü ildə Sisianovun dövründə, onun İrəvan üzərinə yürüşü zamanı və nəhayət, indi üçüncü dəfə buradakı yerli xalq içərisində aşkara çıxmış üsyankar ruhun dəfələrlə özünü göstərməsi aydın şəkildə sübut edir ki, buradakı xalq Rusiya idarəçiliyinə meyilli deyildir…" [29, sənəd 88, s.59-60; bax: bölmənin sonu, sənəd 1] .

Yuxarıda göstərilənlərlə yanaşı, qeyd etmək lazımdır ki, xanlıq əhalisinin olduqca az qismini təşkil edən ermənilər, ilk növbədə Qriqorian kilsəsi və erməni tacirləri, ərazisində yaşadıqları dövlətə xəyanət edərək işğalçı rus qoşunlarına hər vasitə ilə kömək edir, ərzaq və

*Azərbaycanın Araz çayından şimalda yerləşən digər xanlıqları 1813-cü il Gülüstan müqaviləsinə əsasən Rusiyaya ilhaq olunduğu halda, İrəvan və Naxçıvan xanlıqları hələ də öz müstəqilliklərini qoruyub saxlaya bilmişdi.

pulla yardım göstərir, onların xeyrinə təxribat və casusluqla məşğul olurdular. Məsələn, yüksək mənsəb sahibi olan bir rus məmurunun Üçkilsə monastırında erməni kilsə strukturunda katolikosdan sonra ikinci şəxs sayılan arxiyepiskop Nersesin azərbaycanlılara qarşı casusluq fəaliyyəti barədə verdiyi məlumat bunu bir daha təsdiq edir. Həmin məmurun yazdığına görə, "arxiyepiskop Nerses İrəvan xanlığının vəziyyətini öyrənməkdə bizə dəfələrlə yardım göstərmiş, özünün inanılmış adamları vasitəsilə orada baş verənləri bizə çatdırmış və düşmənin (İrəvan xanının — ***red.***) bütün niyyətləri barədə bizi əvvəlcədən xəbərdar etmişdir" [29, sənəd 523, s.443-444].

XIX əsrin əvvəlində xanlığın məruz qaldığı siyasi qeyri-sabitlik bu diyarın iqtisadi vəziyyətinə mənfi təsir göstərmişdi. Rusiya qoşunlarının həyata keçirdikləri irimiqyaslı hərbi əməliyyatlar, törətdikləri dağıntılar, talanlar və qarətlər xanlığın iqtisadiyyatına çox ağır zərbə vurmuşdu. Güzəranı pisləşən əhalinin bir hissəsi canını götürüb təhlükəsiz yerlərə pənah aparmağa, doğma vətəni tərk etməyə məcbur olmuşdu. Bütün bunlar xanlığın iqtisadi, hərbi və siyasi qüdrətini sarsıtmışdı. Bəzən isə xanın özü də əhalini qırğınlardan, qarətlərdən qorumaq üçün bütün əmlakı ilə birlikdə bir yerdən başqa yerə köçürürdü [82, 40-41; 93, 231; 177, 334].

Bununla belə, XIX əsrin əvvəllərində İrəvan xanlığı, yenə də, Azərbaycan xanlıqları içərisində ən güclü dövlət qurumu olaraq qalırdı. Məhz bu səbəbdən də 1816-cı ilin iyulunda imperator Qafqazdakı rus qoşunlarının baş komandanı Yermolova yazırdı: "Çox yaxşı olardı ki, İran şahı İrəvan və Naxçıvanı bizim tərəfimizdən tutulan Arazdan cənuba doğru olan ərazilərə dəyişsin. Ancaq İran tərəfinin bu ərazilərin Rusiyaya güzəştə gedilməsində göstərdiyi inadkarlığı nəzərə alaraq, onların bu işə razılıq verəcəklərinə ümid etmək olmaz" [93,12-13].

Məlum olduğu kimi, İrəvanın ələ keçirilməsini, öz sələfləri kimi, imperator I Nikolay da diqqət mərkəzində saxlayır, bu məsələni tez-tez Qafqazdakı Rusiya qoşunlarının baş komandanı Yermolova xatırladırdı [93, 122; 175, 410-411]. İrəvan xanı isə əsrin əvvəlində Rusiyanın köməyi ilə gürcü knyazlarının işğal etdiyi Azərbaycan torpaqlarını geri qaytarmaq və düşməni qabaqlamaq məqsədilə Tiflisə hücum etmək üçün əlverişli məqam gözləyirdi. Beləliklə, hər iki tərəf müharibəyə hazırlaşdığından Azərbaycan öz qüvvələrinin sayını artırır və münasibətlər getdikcə kəskinləşirdi.

Əvvəlcə rus komandanlığı xanlığın şərqindəki bəzi Azərbaycan ərazilərinin guya Rusiyaya məxsusluğunu iddia edərək Gil, Zod və Göyçə bölgələrinə hərbi mühəndislər göndərdi. Lakin İrəvan xanının tutarlı cavabı onları bu işdən çəkinməyə məcbur etdi [30, sənəd 1370-1371, s.892; 132, 162; 58, 40-42]. Nəhayət, 1826-cı ilin yazında rus komandanlığının Şirəkə (Miraka*) hücum etməyi qərara aldı [132, 162]. Bununla da Rusiya İrəvan xanlığına qarşı yeni hücum kampaniyasına başladı.

Rus qoşunlarının getdikcə İrəvan xanlığının mərkəzinə yaxınlaşmasından narahat olan İrəvan xanı qoşunlarını sərhəddə cəmləşdir - di. İrəvan xanının sərhəd yaxınlığındakı qüvvələri bu mövqelərdə yerləşmişdi: Göyçə gölü yaxınlığında 1000 nəfərdən çox süvari dəstə; Balıqçay məntəqəsi ilə üzbəüz 1000 nəfər qarapapaq süvarisi; Şirək yaxınlığında Hüseynqulu xan Qacarın özünün başçılıq etdiyi iki piyada taboru, 6 top və 3000 süvari; Adıyamanda (Təbrizdən Gümrüyə gedən yolda) İrəvan sərdarının qardaşı Həsən xan Qacarın başçı-

*Qafqaz Arxeoqrafik Komissiyasının topladığı bəzi sənədlərdə İrəvan xanlığının Şirək adlanan ərazisi səhvən Mirak kimi qeyd olunmuş [30, sənəd 1374 və s.] və sonralar nəşr olunmuş digər qaynaqlarda da [60, 179; 177, 32, 36; 59, 105; 93, 37 və s.] bu səhv təkrarlanırdı. Xanlıqlar dövrünə aid mənbədə — "Cambr"da bu ad olduğu kimi, "Şirək" şəklində təqdim olunur [105,191]

lığı ilə 5000 nəfərlik süvari dəstə [59, 105]. Bundan vahiməyə düşən Dəlicanda* yaşayan ermənilər qaçmağa başladılar. Sərhəddəki rus qoşunlarının komandiri Seversamidze ermənilərlə Azərbaycan türklərini müqayisə edərək yazırdı ki, əsgər olmayan bu sərhədlərdə ermənilər tatarsız (burada: azərbaycanlılarsız — ***red.***) keçinə bilməzlər. …Tatarlardan fərqli olaraq ermənilər daha çox sülh vaxtı yararlı və sadiqdirlər [30, sənəd 1372, s.892; bax: bölmənin sonu, sənəd 2]".

1826-cı il iyulun 16-da İrəvan xanının qoşunları əks-hücuma keçərək Şirəkə, qardaşı Həsən xanın qüvvələri isə Şörəyelə daxil oldular. Xeyli itki verən rus qoşunları geri çəkilməyə məcbur edildi. "Rəvan sərdarı və qardaşı Həsən xan Abaran qalasını azad edib, oradan qaçıb Qarakilsəyə sığınan rusları qılıncdan keçirdilər. Bölgə əhalisi Rəvan tərəflərinə, Gümrü qəzasının bəzi kəndləri isə Əcəm tərəfinə köçürüldü. Şahzadələr Tiflisə hücum etmək qərarına gəldilər" [20, 111-112]". İyulun 16-da İrəvan xanı 5 minlik qoşunla sərhədi keçərək Tiflis piyada alayının komandiri knyaz Seversamidzeni Şirək düşərgəsindən Gümrü məntəqəsinə tərəf geri çəkilməyə məcbur etdi [93, 37; 59, 104]. Rusiya qoşunlarının işğal etdikləri Balıqçay, Sadağaçay, Qarakilsə və başqa keşikçi məntəqələri darmadağın edildi. Həsən xanın qoşunları Gümrü yolunu nəzarətə götürdü. Beləliklə, qısa müddət ərzində Pəmbək və Şörəyel işğalçılardan təmizləndi. Bu faktı, Rusiya dövlətinin sifarişi ilə yazmasına baxmayaraq, öz salnaməsində Mirzə Adıgözəl bəy də təsdiq edir: "Knyaz Səvirzə Mirzə (Seversamidze) Pəmbək və Şörəyeldən çıxdıqdan sonra Hüseyn xan və Həsən xan İrəvan tərəfindən gəlib Rusiya hökumətinə aid dam-daşı yıxıb od vurdular və oralara yiyələndilər [8, I, 81-82]". Əslində isə, yuxarıda göstərildiyi kimi, Seversamidze Pəmbək və Şörəyeldən çıxarılmış, irə-

*Azərbaycan türklərinə məxsus olan "**Dəlican**" toponimi sonralar ermənilər tərəfindən təhrif olunaraq "**Dilican**" şəklinə salınmışdır. Hətta XX əsrin əvvəlində Rusiya imperiyası tərəfindən tərtib olunmuş xəritədə belə "**Dəlican**" şəklində təqdim olunur [bax: bölmənin sonu, xəritə 1].

vanlılar isə doğma Azərbaycan torpaqlarını geri almışdılar. Ümumiyyətlə, İrəvan xanının rəhbərliyi altında iyunun 16-dan sentyabrın 21-dək Pəmbək və Şörəyelin azad olunması uğrunda gedən döyüşlərdə 92 nəfər Rusiya əsgəri öldürülmüş, 2 zabit və 37 sıravi yaralanmış, 2 zabit və 25 sıravi əsir götürülmüşdü [146, 143-144].

Beləliklə, 1826-cı il iyulun 19-da İkinci Rusiya — İran müharibəsi başlandı.

Əvvəlki mövqelərinin itirilməsi və İrəvan xanının qoşunlarının Gürcüstan sərhədlərinə yaxınlaşması ilə barışmaq istəməyən Rusiya ordusunun Qafqazdakı baş komandanı general Yermolov Balıqçay məntəqəsinə yeni hərbi dəstə göndərdi. Lakin 166 nəfərdən ibarət bu hərbi dəstə iyulun 26-da xan süvariləri tərəfindən mühasirəyə alınaraq, demək olar ki, tamamilə məhv edildi. Onlardan 113 nəfəri öldürüldü, başda dəstə komandiri olmaqla 18 nəfər əsir götürüldü, qalanları isə (40 nəfər) döyüş meydanından qaçmağa məcbur oldular [177, 47-50]. Ruslar bu məğlubiyyətin səbəbini dəstədəki rus xidmətinə girmiş qazaxlıların üstünə yıxaraq bildirirdilər ki, onlar Voronkovun dəstəsini azdıraraq birbaşa düşmən üzərinə aparmış, onların bir hissəsi öz silahlarını rus dəstələrinə qarşı çevirmiş, digərləri isə guya ilk atəşdən sonra qaçmışlar [177,50].

Xan qoşunlarının hərbi uğurları yerli və qonşu vilayətlərin əhalisinin döyüş ruhunu yüksəltdi. Pottonun yazdığına görə, Pəmbək və Şörəyelin azad olunmasından sonra "Borçalı, Şəmşəddil və Yelizavetpol Rusiyaya açıqcasına xəyanət etdi, rus səfiri İrəvanda tutulub saxlanıldı" [177, 52; 132, 164]. Qazax ağalarını öz tərəfinə çəkmək məqsədilə İrəvan xanı onlara ünvanladığı məktubunda yazırdı: "Ruslarla bizim aramızda sülh olanda siz xahiş edirdiniz ki, sizi və ailənizi rusların əlindən qurtaraq… İndi bu zaman yetişmişdir" [152,618-619; 132, 164]. İrəvan xanının bu məktubu öz işini gördü. Qazax ca-

maatı ayağa qalxdı. Qazax pristavı Snejevski ona sadiq qalan bir neçə erməninin köməyi ilə çətinliklə qaçıb canını qurtara bildi [177, 52].

İrəvan xanına məxsus atlı dəstə 1826-cı il iyulun 14-də vaxtilə rus komandanlığı tərəfindən Tiflis yaxınlığında - Azərbaycan torpaqlarında salınmış alman məskənini, sentyabrın 1-dən 2-sinə keçən gecə isə Həsən xan 3 min nəfərdən çox süvari dəstəsi ilə Loridə yaradılmış yunan məskənini ələ keçirdi [177, 63; 93, 84-85; 43, 261]. Lakin Cəlaloğluda yerləşən 3 rus taqımı və artilleriyasının bir hissəsi onları geri oturdaraq təqib etməyə başladı. Digər tərəfdən, İrəvan sərdarı… Rusiya tərəfdarlarını cəzalandırmaq məqsədilə Göyçə gölü tərəfdən Şəmşəddil distansiyasına yönəldi. General Yermolov öz dəstəsilə onun qarşısını almaq üçün hərəkət etdi. Rus hərbi qüvvələri alman və yunan məskənlərini geri aldılar [43, 261] və bu Azərbaycan torpaqları bir daha öz həqiqi sahiblərinə qaytarılmadı. Rusiya işğalçıları bununla öz ata-baba torpaqları uğrunda mübarizə aparan azərbaycanlılarla alman və yunan icmaları arasında narazılıq yaratmağa cəhd göstərdi.

İrəvan xanlığının Rusiyaya qarşı müharibəyə başlaması və rus qoşunlarının xanlığın ərazisindən qovulması haqda hələ məlumat almayan çar I Nikolay İrəvana qarşı hərbi yürüşə başlamaq və burada iştirak edəcək qoşunların sayı barədə fərman verdi. General Yermolova göndərilmiş 1826-cı il 1 avqust tarixli həmin fərmanda deyilirdi: "Təcili İrəvan sərdarı üzərinə yürüş edin. Tezliklə sizdən belə cavab gözləyirəm: Allahın köməkliyi ilə sərdar daha yoxdur və İrəvan vilayəti tamamilə tutulub — Siz və 15 min nəfərlik rus ordusu qələbə qazanmaq üçün kifayətdir" [55, 214; bax: bölmənin sonu, sənəd 3]. Lakin avqustun 1-də verilmiş bu göstərişi general Yermolov yerinə yetirə bilmədi. Çünki artıq müstəmləkəçilərə qarşı başlamış genişmiqyaslı xalq azadlıq hərəkatı nəticəsində bütün Şimali Azərbaycan xanlıqları üzərində nəzarət itirildiyindən rus qoşunlarının İrəvana doğru

hərəkət etməsi mümkün deyildi. Buna görə də Rusiya imperatorunun fərmanı ilə nəzərdə tutulan yürüş təxirə salındı.

Rusiya qoşunlarının Şəmkir və Gəncə döyüşlərindəki qələbələri İrəvan xanlığına da öz təsirini göstərdi. Ruh düşkünlüyü keçirən xan qoşunları geri çəkilməyə başladı. Pəmbək və Şörəyel, demək olar ki, yenidən boşaldıldı. Rus qoşunları irəliləyərək sentyabrın 21-də Cəlaloğluya gəlib çıxaraq burada düşərgə saldı. Davıdovun həmin dəstəsi ertəsi gün İrəvan xanlığının içərilərinə doğru yürüşə başladı. Lakin görünür, İrəvana hücumların əvvəlki acı nəticələrindən ehtiyatlanan Yermolovun əmrilə Davıdov sentyabrın 29-da əvvəlki mövqeyinə qayıtdı [152, 686-687; 93, 87; 132, 165]. İmperiyanın əsas qüvvələri yenidən üsyana qalxmış Şimali Azərbaycan xanlıqlarının işğalına yönəldildiyindən, hələlik İrəvana həlledici hücum gözlənilmirdi. Az qüvvə ilə isə İrəvana yürüş təhlükəli idi. Belə ki, İrəvan sərdarı (Hüseynqulu xan Qacar nəzərdə tutulur — ***red.***) əks hücumla ruslara arxadan zərbə endirib onların Gürcüstanla əlaqəsini kəsə bilərdi [93, 87-88; 132, 165] və rus qoşunları üçün məğlubiyyət qaçılmaz olardı.

1826-cı il oktyabrın 21-də imperator Yermolova yazırdı: "Əgər İrəvanı ya silah gücünə, ya İrəvan sərdarını pulla ələ almaq yolu ilə, ya da onunla gizli münasibətlər qurmaqla ələ keçirmək mümkünsə ,bu imkanı əldən verməyin". Çar İrəvan və Sərdarabad qalalarını [bax: bölmənin sonu, şəkil 1, 2] ələ keçirməyin əhəmiyyətini yaxşı başa düşürdü və bunu tez-tez Yermolova xatırladırdı [93, 122].

Rusiya ordusunun baş qərargahı Yermolov və Paskeviçin rəyi əsasında növbəti hərbi kampaniya ilə bağlı 1826-cı ilin sonunda iki layihə hazırladı. Paskeviçin planına əsasən, gözlənilməz yerdən vurulan zərbə ilə İrəvan və Naxçıvan Azərbaycanın başqa yerlərindən tamamilə təcrid edilməli idi. Əsas zərbə isə Təbrizə endirilməli idi [152, 687; 93, 159-160, 166; 132, 165].

Yermolovun təklifi isə belə idi ki, mövcud qüvvələrlə İrəvan xanlığını tutmaqla kifayətlənməli, qalalarda rus qoşunlarına dəstək olan

ermənilərdən istifadə edilməklə onların hamısı müsəlmanlara qarşı silahlandırılmalı idi. Sonra Meşkin vilayətindən keçilməklə Ərdəbil, Xalxal və Azərbaycanın başqa vilayətləri ələ keçirilməli, habelə Lənkəran xanlığı itaət altına alınmalı idi. Çar I Nikolay Yermolovun planını təsdiq edərək əsas zərbənin İrəvan xanlığına endirilməsi fikrini bəyəndi [93, 157-166, 205-208].

Göstərilən layihənin reallaşdırılmasına hazırlıq görmək üçün baş qərargahın rəisi baron Dibiç 1827-ci ilin fevralında Tiflisə gəldi və bu planı bütün incəliklərinədək nəzərdən keçirdi. Çar öz sərəncamı ilə bu planın həyata keçirilməsi üçün 400 min çervon və ya 500 min rubl vəsait ayırdı. Bakı və Redutqalaya xeyli taxıl və un göndərildi [93, 166-170].

I Nikolay general Yermolovun dekabristlərlə əlaqəsindən şübhələndiyi üçün çox keçmədən onu Qafqazdakı rus ordusunun baş komandanı vəzifəsindən azad etdi. 1827-ci il martın sonlarında çara sadiq olan general İ.F.Paskeviç (1827-1831) Qafqazdakı rus qoşunlarının baş komandanı təyin edildi [93, 226, 228-229; 177,283; 172,38-39]. Yeni baş komandan İrəvan xanlığının strateji əhəmiyyətini dərk etdiyi üçün ilk zərbəni bu xanlığa endirməyi qərara aldı.

1827-ci il martın 26-da baron Dibiç İrəvan xanlığına hərbi əməliyyatların başlandığını elan etdi. Aprelin əvvəlində general Paskeviçin əmri ilə rus qoşunlarının ön dəstəsi general Benkendorfun komandanlığı altında, erməni arxiyepiskopu Nerses Əştərəklinin müşayiəti ilə Borçalıdan İrəvana doğru hərəkətə başladı [32, sənəd 214, s.258-260; 177, 287; 93, 222-223, 229-230, 233; 137, 12; 132, 166]. Aprelin 11-də Benkendorf Üçkilsənin 40 verstliyində yerləşən Sudakəndə yaxınlaşdı. Bu zaman ruslar üçün əlverişsiz şərait yarandı. İrəvanın bütün əhalisi Arazdan cənuba köçürülmüş, xanlığın ərazisi boşaldılmışdı; rus qoşunlarını ərzaqla təchiz etmək mümkün deyildi [93, 231]. Aprelin 13-də müqavimətə rast gəlmədən Üçkilsə monastırına

gəlib çatan rus komandanlığı burada ermənilər tərəfindən təntənə ilə qarşılansa da, tezliklə ağır vəziyyətə düşdüyünü və ermənilər tərəfindən aldadıldığını anladı.* Aclıqdan əziyyət çəkən rus əsgərləri hətta bitki kökləri ilə qidalanmağa başlamışdı [32, sənəd 214, s.258-259].

### *Rusiya işğalçıları tərəfindən Sərdarabad qalasının birinci mühasirəsi və qəhrəmancasına müdafiəsi (16-17 aprel 1827-ci il)*

Çıxılmaz vəziyyətdə qalan Benkendorf aprelin 16-da Üçkilsə monastırından Sərdarabada doğru istiqamət götürdü. Ətrafı quru xəndəklə əhatə olunan Sərdarabad qalası 22 topa malik idi. Qala qarnizonunun sayı 3000 nəfərə çatırdı. Qalanın rəisi İrəvan sərdarının qardaşı Həsən xan və nəvəsi (Fətəli xan — ***red.***) idi [59, 28]. Sərdarabad qalasını qəfil həmlə ilə ələ keçirməyə çalışan general Benkendorf aprelin 16-da səhər 5 taqım və 4 topla qalaya hücum etsə də, yalnız axşam gizlicə qalaya yaxınlaşa bildi.** Lakin qaladakılar rusların gəlişindən xəbər tutdular və qala müdafiəçiləri onlara aman verməyərək toplardan atəş açmağa başladı. Niyyətinin baş tutmadığını görən Benkendorf qaladakıların könüllü təslim olması üçün qala rəisinin yanına elçi göndərdi. Qala rəisi (Fətəli xan — ***red.***) Benkendorfun bu tələbini rədd edərək "qalanı təslim etməkdənsə onun dağıntıları altın-

* General Benkendorfun dəstəsi Üçkilsədə tezliklə ağır vəziyyətə düşdü. Yürüşə cüzi ərzaq ehtiyatı ilə başlayan rus qoşunu bu tələbatı ödəmək üçün ermənilərə böyük ümid bəsləyirdi. Başda Nerses Əştərəkli olmaqla ermənilər rus komandanlığına həm maddi, həm də hərbi cəhətdən kömək edəcəklərinə vəd vermişdilər. Lakin ermənilər tərəfindən ruslara heç bir kömək göstərilmədi [bax: 177, 287-288; 175, h.IV, 409]. Şübhəsiz ki, dəfələrlə olduğu kimi, bu dəfə də ermənilərin məqsədi rus qoşunlarını İrəvan xanlığına yürüşə şirnikləndirmək və tələsdirmək idi. Sonralar — 1828-ci ilin noyabrında general Paskeviç özünün yazdığı məxfi məktubunda rus qoşunlarının rüsvayçı məğlubiyyətlərinin səbəblərini məhz erməni katolikosu Nersesin onları yalançı vədlərlə aldatmasında görürdü [32, sənəd 214, s.258-259].

** General Benkendorfun hərbi planlarından vaxtında xəbər tutan Həsən xan Qacar 1000 nəfərlik süvari dəstəsi ilə rus qoşunlarını Sərdarabad qalasından 10 verst aralıda qarşılamış, məğlub olmasına baxmayaraq, düşmənin qalaya hücumunu xeyli çətinləşdirmişdi [bax: 93, 243].

da ölməyim yaxşıdı" cavabını verdi [177, 304-305]. Sərdarabad qalasının müdafiəçilərindən rədd cavabı alan Benkendorf aprelin 16-dan 17-nə keçən gecə qalanı güclü top atəşinə tutmağı əmr etdi. Lakin qala müdafiəçiləri düşmənə əks zərbə endirməklə cavab verdilər. Bundan əlavə, ərzaq cəhətdən korluq çəkən rus qoşunlarının ətraf kəndlərdən ərzaq toplamaq cəhdi də boşa çıxdı. Sərdarabad qalasının qəhrəman müdafiəçilərinin əzmkarlığı nəticəsində qalanı ala bilməyən rus qoşunları aprelin 17-də yenidən Üçkilsə monastırına çəkildi [93, 243-244; 177,305]. Bu zaman maddi cəhətdən korluq çəkən rus komandanlığı Qars və Ərzurum paşalıqlarına müraciət etsə də, bu müraciət uğursuz oldu [93, 245]. Nəhayət, aprelin 23-də Tiflisdən rus qoşunlarına göndərilən ərzaqla dolu araba karvanı düşərgəyə gəlib çatdı. Bu ərzaq rus qoşunlarını yalnız 10 gün təmin edə bilərdi [177, 306]. Beləliklə, müvəqqəti də olsa ərzaq problemini həll edən rus qoşunları əsas məqsədinə yetişmək — İrəvan qalasını ələ keçirmək və xanlığı tamamilə işğal etmək üçün tələsdi.

### *İrəvan qalasının üçüncü mühasirəsi və qala qəhrəmanlarının Rusiya işğalçılarına təslim olmaması (27 aprel — 23 iyun 1827-ci il)*

İrəvan sərdarı Hüseynqulu xan Qacar rus qoşunlarının məqsədini anladığından İrəvan qalasının müdafiəsinə yaxşı hazırlaşmışdı. Xan ətraf kəndlərdən qalaya çoxlu taxıl ehtiyatı toplatdı, qala qarnizonunu daha da möhkəmləndirdi. Təkcə İrəvan qalasında yerləşən qarnizonun sayı 5 minə çatırdı, qalada 26 top yerləşdirilmişdi [59,28]. Dəfələrlə ermənilərin xəyanəti ilə üzləşən Hüseynqulu xan bu dəfə ehtiyatlı davranıb Üçkilsə monastırını nəzarətə götürərək burada 400 nəfərlik qarnizon yerləşdirmiş, kilsədə olan ərzaq ehtiyatını İrəvan qa-

lasına daşıtdırmış və burada bir neçə nəfər din xadimi qoyaraq qalan ermənilərі İrəvan qalasına gətirtdirərək nəzarət altında saxlayırdı [93,233]. İrəvan xanı Hüseynqulu xan qardaşı Həsən xanı Sərdarabad və İrəvan qalasının mühafizəsinə təyin etdi, özü isə qoşunla ətraf yerləri qoruyurdu [8, II, 84].

Vaxt itirmək istəməyən Benkendorf Üçkilsədə podpolkovnik Voljenskinin başçılığı ilə 2 tabor qoyaraq aprelin 23-də oradan çıxdı. Səhəri gün Zəngi aşırımını keçərək İrəvanın cənub-şərqinə doğru hərəkət edərək yüksəklikləri tutdu. Aprelin 24-dən 27-nə qədər İrəvan qalasının müdafiəçiləri ilə işğalçı rus ordusu və İrəvan xanına xəyanət edən ermənilər arasında dəfələrlə qanlı döyüş baş verdi.* Çox çətin mübarizədən sonra, aprelin 27-də isə mayor Voljenskinin başçılığı ilə İrəvan qalasının şərq tərəfindəki şəhərətrafı adlanan hissə tutuldu. Bununla da İrəvan qalasının mühasirəsi başa çatdı [93, 256-258; 177, 308-310]. Hər tərəfdən mühasirəyə alınmasına baxmayaraq, İrəvan qalasının müdafiəçiləri mərdliklə mübarizə aparırdı. Buna görə də general Benkendorf qala rəisi Sübhanqulu** (Hüseynqulu xan Qacarın qardaşı oğlu və kürəkəni — ***red.***) xan vasitəsilə Hüseynqulu xanla danışıqlar aparmağa məcbur oldu. General əvvəlcə xanı pulla ələ almaq istədi, bunun nəticəsiz olduğunu gördükdə xana könüllü təslim olacağı təqdirdə onun Rusiya dövləti tərəfindən hakimiyyətində saxlanacağına və əvvəlki gəlirlərinin özünə qaytarılacağına söz verdi.

---

*Düşmənlə vuruşmaq üçün İrəvan qalasından ayrılan 500 nəfərlik süvari dəstə qala yaxınlığındakı kəndlərin birində düşmənlə qanlı döyüşə girdi. İrəvan süvarilərinin inadla döyüşməsinə baxmayaraq, yaxşı silahlanmış düşmən qalanın cənub-şərq hissəsindəki Muğanlıtəpə kurqanını ələ keçirdi. Lakin qala müdafiəçiləri onları güclü top atəşinə tutdu. Aprelin 25-də düşmən qanlı döyüşdən sonra "İrakli dağı" təpəsini ələ keçirdi. Həmin gün qala rəisi Sübhanqulu xanın başçılıq etdiyi hərbi dəstə şəhər bağlarında yerləşən düşmən alayına hücum etdi. Düşmən alayı geri çəkildi, lakin rus qoşunları əlavə hərbi kömək aldığı üçün İrəvan döyüşçüləri məğlub oldu... [bax: 93, 256, 257; 177, 308-309].

**Potto İrəvan qalasının komendantı Sübhanqulu xanın adını əsərinin bir yerində "Savatqulu" xan [177, 309-311], digər yerində isə "Suvanqulu" xan [177,514], Şerbatov isə "Suanqulu" xan [93, 264] kimi təqdim edir. Lakin digər mənbədə Hüseynqulu xan Qacarın qardaşı oğlu, İrəvan qalasının komendantı Sübhanqulu xan kimi verilir [32,566].

Lakin Hüseynqulu xan Qacar generalın təklifini nəinki qəbul etmədi, əksinə, yenə də mübarizəni davam etdirməyi üstün tutdu. Aprelin 29-dan 30-na keçən gecə İrəvan süvariləri Zəngi çayının üstündən keçən körpünü qoruyan düşmən gözətçi dəstələrinə qəflətən hücum edərək onları çətin vəziyyətdə qoydular. Məqsəd düşmən mühasirəsini yarıb İrəvan qalasına daxil olmaq idi. Lakin rus qoşununun güclü top atəşləri bu hücumun axıradək davam etdirilməsinə mane oldu [177, 309-312].

Aprelin 30-da Həsən xan Qacar 200 nəfərlik süvari dəstə ilə şərq tərəfdən mühasirəni yarmaq və qaladakılarla əlaqəyə girməyə çalışdı, lakin ruslar buna imkan vermədilər [93, 258]. Mayın 1-də general Paskeviçin göndərdiyi 2-ci hərbi sursatı alan Benkendorfun dəstəsi artıq ərzaqla təmin edilmiş, bundan əlavə, ona Qara dəniz kazaklarının iki alayı da qoşulmuşdu. Həsən xan tez-tez süvari dəstəsi ilə rusların düşərgəsinin ətrafında görünür, lakin ciddi toqquşmalara girişmirdi. Yəqin ki, xanın əsas məqsədi rus qoşunlarını narahat etmək və yormaq idi [93, 260]. Mayın 7-də Həsən xan təqribən 4 minlik dəstə ilə Zəngi çayının mənsəbində düşərgə qurdu. Ayın 8-i axşam Benkendorf 1200 kazak və 1 topla silahlanmış iki bölüklə bərabər düşərgədən çıxaraq gecə Uluxanlı kəndini keçib səhər Zəngi çayının mənsəbinə çatdı. Çayın o biri sahilində Həsən xanın dəstəsi durmuşdu. Sarvanlar kəndi yaxınlığında çayı keçən Benkendorf xanın sol cinahına doğru yönəldi. Həsən xan Abaran çayına doğru geri çəkilərkən Benkendorfun Qara dəniz və Don kazaklarının hücumuna məruz qaldı. Həsən xanın dəstəsini təqib edən Benkendorf onların ölən və yaralananlarla birlikdə 300 nəfər itki verdiyini bildirirdi. 54 nəfər isə əsir düşmüşdü. Əsir düşənlərin arasında Xoy və Qarapapaq bəyləri, İrəvan sərdarının qayınatası da var idi. Sərdarabad yaxınlığında Həsən xanın təqibi dayandırıldı. Səhərisi gün Benkendorf düşərgəyə qayıt-

dı. Həsən xan Arazın cənubunda yerləşən Bəybulaqda düşərgə salıb bir sıra yerli tayfalardan süvari dəstələr toplayaraq qoşunun sayını 5 min nəfərə çatdırdı [93, 261-162].

İrəvan qalası müdafiəçilərinin qəhrəmancasına müdafiə olunması, mühasirənin uzanması baş komandan Paskeviçin şəxsən özünü İrəvan üzərinə səlib yürüşünə məcbur etdi. Belə ki, general Paskeviçin başçılıq etdiyi qoşun hissələri, ona qoşulmuş erməni və gürcü dəstələrinin müşayiəti ilə mayın 12-də İrəvan istiqamətində hərəkətə başladı. Paskeviçin ardınca imperator I Nikolayın razılığı ilə təşkil edilən ilk erməni atlı alayı* mayın 17-də İrəvan xanlığının ərazisinə doğru hərəkət etdi. İrəvan sərhədlərində onların sayı 1000 nəfərə çatırdı [177, 323-324]. Bütün bunlar bir daha İrəvan qalasının o zaman necə möhtəşəm qala olduğunu sübut edir.

İyunun 8-də Üçkilsədən İrəvan qalasına doğru yönələn Paskeviç İrəvan xanlığına məxsus qalalar haqqında kəşfiyyat məlumatları toplamağa başladı. General Sərdarabad qalasında 1000 sərbazdan ibarət qarnizon və 500 Mazandaran atıcısının olduğunu, qalanın torpaq səngərlərində 18 top yerləşdirildiyini və iki aylıq ərzaq tədarükü görüldüyünü öyrənə bildi. İrəvan qalası haqda Paskeviç hərbi əməliyyatlar jurnalında yazırdı: "İrəvan qalasının dərin xəndəklə əhatə olunmuş bürcləri olan iki hündür divarı var. Divarların arasındakı dar zolaq da sanki xəndək kimi maneə rolunu oynayır. İç divarın qapalı bürclərində toplar yerləşdirilib, bayır divar isə mazğal və bürclərdəki falkonet (kiçik çaplı top — ***red.***) və tüfənglərdən açılan atəşlə qorunur. Qala qarnizonu 2 min sərbazdan və təxminən bu qədər qeyri-nizami atıcıdan ibarət idi" [93, 262-263]. Paskeviçin rəyinə görə, İrə-

*General Sipyagin 1826-cı ildə ermənilərin iranlıların (İrəvan xanının və Qacarlar İranının qoşunları — ***red.***) əleyhinə göstərdikləri xidmətlərdən fəxrlə danışırdı. Ona görə də ermənilərdən iba - rət dəstələrin yaradılmasına diqqət yetirən Sipyagin 1827-ci il mayın 24-də dəstələrə daxil olmaq istəyənlər üçün xüsusi qaydanı imzaladı [153, 62-64].

van qalasının müdafiəsi kifayət qədər möhkəm idi və qala qarnizonunun yüksək əhval-ruhiyyəsi onun əhəmiyyətini daha da artırırdı. Alınmaz hesab edilən İrəvan qalasının hələ 1804-cü ildə Sisianov, 1808-ci ildə isə Qudoviç tərəfindən ələ keçirmək cəhdlərinin uğursuzluqla nəticələndiyini [93, 263-264] Paskeviç yaxşı bilirdi və bu uğursuzluqları təkrar etmək fikrində deyildi.

Paskeviç İrəvan qalasının ətrafına çatanda Benkendorfun Sübhanqulu xanla (İrəvan qalasının komendantı — ***red.***) danışıqlar apardığını öyrəndi. O, İrəvan sərdarının yaxın köməkçisi və təbəəsi olan Sübhanqulu xana etibar etmirdi, lakin qalanı döyüşsüz ələ keçirməyi ehtimal etdiyindən danışıqların davam etdirilməsinə icazə verdi. Hələ bir neçə gün bundan əvvəl Sübhanqulu xan knyaz Seversamidzeyə rus qoşunlarının baş komandanı ilə görüşmək istədiyini bildirmişdi. Paskeviç qalanın komendantına öz gəlişi barədə xəbər göndərəndə komendantdan deyil, sərdarın özündən cavab aldıqda Benkendorf çox təəccübləndi. İrəvan sərdarı Hüseynqulu xan knyaz Seversamidzeyə bildirmişdi: "Əgər söhbət qalanın təslim edilməsindən getmirsə, onda qalanın komendantına Paskeviçlə görüşməyə icazə verirəm. Əks halda bu, mənasızdır — çünki mən qalanı heç vaxt təslim etmə - yəcəyəm" [93, 264-265]. Bundan sonra Paskeviç qala ilə bütün əlaqələri kəsməyi əmr etdi [93, 265; 132,167]. Krasovski 20-ci piyada diviziyası və iki kazak alayı ilə İrəvan yaxınlığına gəldi. Burada o, Paskeviçlə birlikdə hücuma keçməli olan Benkendorfun mühasirə dəstəsini əvəz etməli idi [177, 449].

Hava şəraiti ilə bağlı olaraq İrəvanın mühasirəsi artıq qoşunların qüvvəsi xaricində idi. Yay bürküləri başlamış, eyni zamanda qoşunun arasında xəstəlik yayılmışdı. Paskeviç bir günün içində İrəvanı mühasirə edən gürcü qrenadyor alayında 240 nəfərin xəstələndiyini bildirirdi. Taborlar seyrəlməyə başlamışdı və döyüşə biləcək əsgərlərin sayı 400 nəfərdən bir az artıq idi. Mühasirə artilleriyası hələ gə-

lib çıxmamışdı (artilleriya yalnız iyunun 26-sında Tiflisdən yola düşmüşdü). Buna görə də Paskeviç mühasirədən əl çəkərək qoşunu ərzaq və su ehtiyatı olan dağlarda yerləşdirmək, yollara nəzarəti əldə saxlamaq və lazım gəldikdə tez bir zamanda İrəvan, Üçkilsə və Sərdarabada yeritməyi düşünürdü.* Üçkilsəyə geri dönən Paskeviç Həsən xanın 3 min süvari və sərbazla Arazı keçərək Alagöz dağının şərq ətəklərinə yaxınlaşdığını eşitdi. Buna mane olmağa çalışan Paskeviç iyunun 10-da Şipovun başçılığı ilə Həsən xana qarşı qoşun göndərdi. Onların Başabarana çatdığını eşidən Həsən xan Qaracasara — Alagöz dağlarına doğru geri çəkildi [93, 265-267].

İrəvan qalasını işğal etməyin mümkünsüzlüyünü görən general Paskeviç Naxçıvan üzərinə yürüş etmək qərarına gəldi və qoşunlarını İrəvanın 25 verstliyində yerləşən Gərniçay kənarındakı düşərgəyə topladı. Lakin Naxçıvana yürüşdən əvvəl İrəvan qalasının mühasirəsini möhkəmləndirmək tədbirlərini də unutmadı. Benkendorfun yerinə general-leytenant Krasovski İrəvan mühasirə dəstəsinin rəisi təyin edildi.** Paskeviç Krasovskinin dəstəsini İrəvan ətrafında yerləşdirərək ona lazımi təlimatlar*** verdi: havalar istiləşənədək İrəvanın mühasirəsini davam etdirmək, sonra isə lazım olarsa, Sudakəndə doğru geri çəkilməyi tapşırdı. Paskeviç xəbərdarlıq edirdi ki, İrəvan sərdarının, xüsusilə də komendant Sübhanqulu xanın danışıqlar aparmaq cəhdi yalnız Krasovskini qəti tədbirlərdən yayındırmaq məqsədi güdür. Buna görə də Krasovski onlarla mümkün qədər az danışıqlara girsin [93, 267-273; 177, 332-333].

---

* Dağlara çəkilmək fikri yalnız İrəvana hücum edən qoşuna aid idi, Paskeviç özü isə əsas qüvvələrlə Naxçıvan üzərinə getməyi planlaşdırırdı [93,266].
** İrəvan dəstəsində 3200-ə yaxın piyada, 1200 süvari, 16 top, əsas qüvvələrin tərkibində isə 4800 piyada, 800 nəfər nizami və 3000 nəfər qeyri-nizami süvari dəstəsi, 26 top var idi [93, 269-270].
*** Paskeviç gələcəkdə əyalətin idarə olunmasında yaxından iştirakı nəzərdə tutulan erməni arxiyepiskopu Nersesə isə taxıl yığımına və tarlaların suvarılmasına xüsusi diqqət yetirməyi tapşırdı [bax: 93, 273].

İyunun 19-da hərəkətə başlayan rus qoşunları ayın 21-də Dəvəli kəndinə girdi. Kənd əvvəlcədən boşaldılmışdı [93, 273; 132,167]. Qeyd olunduğu kimi, sərdar əvvəlcədən əhalini İrəvana köçürmüş, bəzi qalalarda isə mühafizə dəstəsi qoymuşdu. Şerbatovun yazdığına görə, qalaya 18 min sakin köçürülmüşdü [93, 322; 132, 167].

İrəvanlıların güclü müqaviməti, havaların isti keçməsi və əsgərlər arasında yayılan xəstəliklər İrəvan qalasını mühasirəyə alan rus qoşunlarının vəziyyətini günbəgün ağırlaşdırırdı. Leytenant Krasovski iyunun 17-də gündəliyində yazırdı ki, artıq Üçkilsə hospitalında 700-dən çox hərbçi yerləşdirilib [59,6]. Eyni fikri — iki ay ərzində havaların çox isti keçməsini, əsgərlər arasında dəhşətli xəstəlik yayılmasını V.Potto da təsdiq edərək yazırdı ki, avqust ayında gəlməsi gözlənilən mühasirə artilleriyası olmadan qalanın alınmasından söhbət belə gedə bilməz. Mövcud vəziyyət barədə Paskeviçə məlumat verən Krasovski İrəvan qalasının mühasirəsinin mənasız olduğunu bildirir və mühasirədən əl çəkmək üçün ondan razılıq istəyirdi [177, 449-451]. Pottoya görə, nəhayət, Paskeviçdən İrəvanın mühasirəsindən əl çəkməyə icazə alan Krasovski iyunun 21-də gecə yarısı Üçkilsəyə doğru geri çəkildi. Səhəri gün rusların geri çəkilməsindən xəbər tutan qala sakinləri 2 ay sürən mühasirədən sonra rahat nəfəs aldılar. Onların sevinclərinin həddi-hüdudu yox idi [177, 451].

Şerbatov isə Krasovskinin ayın 22-dən 23-nə keçən gecə mühasirədən əl çəkərək Sudakəndə keçməyi planlaşdırdığını yazırdı [93,275]. Lakin Krasovskinin özünün gündəliyində İrəvan qalasının mühasirəsindən əl çəkməsinin gizli şəkildə həyata keçirildiyi və qalanı mühasirəyə alan birləşmiş qüvvələrin 1827-ci il iyunun 23-də gecə yarısı Üçkilsəyə doğru geri çəkildiyi qeyd olunur [59, 6].

Ruslar geri çəkildikdən sonra Hüseynqulu xan qalanı mökəmləndirməyin qayğısına qaldı və bunun üçün heç bir şeyi əsirgəmədi.* Hətta bəzi şayiələrə görə, xan bir zərbədə rus korpusunun yarıdan çoxunu qıra biləcək dəhşətli top yaratmaq təşəbbüsündə olmuş, yalnız bunun üçün əridilmiş metal azlıq etmişdi [177, 453-454].

Naxçıvan qalası yaxınlığında rus qoşunları Qacarlar İranının Həsən xanın və Nağı xanın komandanlığı altında olan süvari hərbi qüvvələri ilə qarşılaşdılar. Eristovun komandanlığı ilə sayca üstün olan rus qoşunları üstün gəldilər [115, 118]. İyunun 26-da Naxçıvan ələ keçirildi. Naxçıvanı tutan Paskeviç iyulun 1-də bütün qüvvəsi ilə Abbasabadın mühasirəsinə başladı [93, 275-280]. Bu zaman Hüseynqulu xan Qacar Üçkilsəyə hücum etmişdi** [177, 454]. Görünür, İrəvan xanı Abbasabad qalasını mühasirəyə alan rus qoşunlarının diqqətini yayındırmağa çalışırdı.

İyulun 5-də Abbasabadın mühasirəsini yarmağa çalışan Abbas Mirzə Həsən xanla birgə Xoy tərəfdən hücuma keçdi. Lakin Cavanbulaqda baş verən döyüş onların məğlubiyyəti ilə bitdi. Qala şiddətli atəşə tutuldu. İyulun 7-də qala qarnizonu təslim oldu. İyulun 8-də Paskeviç Abbasabada daxil oldu. İyulun 13-də general-mayor Saken qalanın komendantı və Naxçıvan vilayətinin rəisi təyin edildi [93, 282-287, 293; 132,167]. 1827-ci il iyulun 19-da Qriboyedov baş tərcüməçisi A.Bakıxanovla birlikdə Abbas Mirzənin düşərgəsinə gəldi.

---

* Rusların İrəvan qalasının mühasirəsindən əl çəkməsindən sonra Hüseynqulu xan məscidə gedərək kafirlərin  hücumundan xilas olduğu üçün Allaha dua etmişdi… İrəvan qalası Hüseynqulu xan üçün çox əziz idi, onun 23 illik döyüş xatirələri, ən yaxşı günləri bu qalada keçmişdi [177,452, 453-454].

** İyulun 4-də İrəvan sərdarı 4 minlik süvari dəstəsi və 2 topla silahlanmış 2 sərbaz taboru ilə İrəvan qalasından çıxaraq Üçkilsəni tutmağa getdi. Sərdar komendanta məktub göndərərək arxiyepiskop Nersesə qulaq asmayaraq monastırı təslim etməyi təklif etdi. Təslim olmaq əvəzinə monastırdan top atəşləri açıldı. Sərdarın dəstələri monastırı mühasirəyə aldı. Lakin bir neçə erməni monastırdan qaçaraq Krasovskini xəbərdar etdi. Krasovski 2 tabor və 4 topla iyulun 5-də monastıra yönəldiyindən sərdar mühasirədən əl çəkdi və İrəvana doğru geri çəkildi [177,454-455; 59,8].

Danışıqlar zamanı Qriboyedov İrəvan və Naxçıvan xanlıqlarının Rusiyaya güzəştə gedilməsini və hərbi təzminat ödənilməsini tələb etdi. Abbas Mirzə isə hərbi əməliyyatların 10 aylığa dayandırılmasını təklif etdi. Danışıqlar uğursuzluqla nəticələndi [153, 76].

Üçkilsədə yerləşən rus qoşunu iyulun 1-dək buranın müdafiəsini möhkəmləndirməklə məşğul oldu və qoşunun müəyyən hissəsini burada qoyaraq Üçkilsədən 35 verst aralı, Abaran çayı sahilində yerləşən Çınqıllı kəndində düşərgə saldı. Rus qoşunlarını təqib edən İrəvan qoşunları* isə onların düşərgəsindən 10 verst aralı Alagöz dağının ətəyində onlara nəzarət edirdi [59, 6; 177, 452-455].

Abbas Mirzə öz qüvvələrini cəmləşdirib (onun qoşununda 10 min piyada, 15 min süvari və 28 top var idi [93,301]), avqustun 17-də Uşağa vuruşmasında rus qoşunlarına ağır zərbə endirdi. Səhər saat 7-dən gündüz saat 4-dək davam edən qanlı döyüş Üçkilsənin 2 verstliyində başa çatdı. Döyüşdən qaçan Krasovski Üçkilsə monastırına sığındı. Abbas Mirzə Uşağadakı mövqelərini möhkəmləndirərək hücum etməyə qərar vermədi [93, 302-303]. Gizetti adlı müəllifin bu vuruşma haqqında məlumatına görə, Krasovskinin dəstəsi həmin döyüşdə 1166 əsgər və zabit itirdi (685 nəfər öldürüldü, 347 nəfər yaralandı, 134 nəfər isə əsir düşdü) [146, 145; 132, 167]. Şerbatova görə isə, Krasovskinin dəstəsindən 700-ə yaxın əsgər və zabit öldürüldü, 300 nəfərədək yaralandı və generalın özü çiynindən ağır yara aldı. Şerbatov Abbas Mirzənin itkisinin 3 minə çatdığını qeyd edir [93,303]. Görünür, müəllif Abbas Mirzənin itkisini çox, ruslarınkını isə az göstərmişdir. Krasovskinin dəstəsi qaçaraq geri çəkildiyindən rus qoşunlarının itkisi daha çox olmalı idi.

Krasovski öz məğlubiyyətinə haqq qazandıraraq bildirirdi: Abbas Mirzə Uşağada mövqeyini elə möhkəmləndirmişdi ki, böyük qurban-

* Pottoya görə, qarapapaqlılardan ibarət bu ayıq və cəsur dəstəyə Nağı xan başçılıq edirdi [177, 455].

lar və itkilər vermədən oranı keçib yenidən düşərgəyə qayıtmaq mümkün deyildi. Digər tərəfdən, əgər mən bu təhlükəli hərəkətə qərar versəydim, onda Üçkilsənin itirilməsi labüd olardı [93,303-304]. General Paskeviçin Uşağa döyüşündən sonra Krasovskinin İrəvanın mühasirəsini yenidən davam etdirməyə qadir olmadığını etiraf edərək yazır: "Hətta əgər Abbas Mirzə təkrar Krasovskiyə hücum etsəydi, o, Üçkilsə monastırında çətin ki tab gətirə biləydi [177, 481]. Həmin döyüşdən bəhs edən müəlliflər yazır: "İrəvanın mühasirəsindən əl çəkən Krasovski Üçkilsəyə* yürüş etdi. Bundan istifadə edən sərdar 4000 atlı, 2 briqada sərbazla oraya hərəkət etdi. Avqustun 4-də Abbas Mirzə 30 minlik qoşunu ilə Üçkilsə düzündə göründü və avqustun 6-da Əştərək kəndini tutdu. Onlar birləşərək avqustun 17-də rus qoşunlarını mühasirəyə alıb, qırmağa başladılar. 200 əsiri çıxmaqla 24 zabit, 1130 əsgər öldürüldü" [185, 48; 177, 457, 469-478; 137, 21; 132, 168]. Bu qələbə rus qoşunlarının İrəvana yürüşünü xeyli ləngitdi.

### *Sərdarabad qalasının rus qoşunları tərəfindən ikinci mühasirəsi, qəhrəmancasına müdafiəsi və süqutu (14-20 sentyabr 1827-ci il)*

1827-ci il avqustun 29-da Üçkilsədə toplaşan rus qoşunları bu dəfə Sərdarabad qalasını hədəf seçdilər. General Paskeviçin qalada çoxlu ərzaq ehtiyatının olması haqda məlumatı vardı və rus qoşunlarının gələcək yürüşünü təmin etmək üçün bu qalanın alınması zəruri idi [64,138]. Sentyabrın 11-də general Paskeviç birləşmiş qüvvələrlə Sərdarabada doğru yürüşə başladı və səhəri gün qalaya yaxınlaşdı. Bu xəbəri eşidən Abbas Mirzə öz qüvvələri ilə birlikdə Makuya doğru geri çəkildi. Sərdarabad qalası İrəvan xanı Hüseynqulu xan və qardaşı Həsən xanın öz qüvvələri ilə müdafiə olunurdu [32, sənəd 518, s.561; 177, 494].

* Üçkilsə bir rus taboru ilə müdafiə olunurdu, Krasovski isə 2 minlik dəstəsi və ərzaq daşıyan transportu (nəqliyyat) ilə ora yönəlmişdi [185,48]

Sentyabrın 14-də Krasovskinin başçılıq etdiyi qoşun Sərdarabad qalasını mühasirəyə aldı [59, 31]. 10-12 il bundan əvvəl İrəvan xanı tərəfindən tikilmiş* Sərdarabad qalası Üçkilsədən Alagözə doğru uzanan geniş düzənlikdə yerləşirdi. Dördbucaq şəklində nəhəng qüllə və qapıları olan, ikiqat hündür divarları qalaya kifayət qədər müdhiş görkəm verir və onun alınmasını çətinləşdirirdi. Qalanın 14 topla silahlanmış iki minlik qarnizonuna Həsən xanın nəvəsi — gənc və təcrübəsiz Fətəli xanın başçılıq etməsi Paskeviçə qalanın tutulmasına ümid verirdı. Lakin İrəvan sərdarının qardaşı Həsən xan Qacar qalaya girməyə müvəffəq oldu və müdafiəçilərin döyüş ruhunu yüksəldərək onları qala divarları arasında öləcəklərinə, amma təslim olmayacaqlarına and içdirdi [32, sənəd 518, s.561; 177, 494-495; 93, 315-316]. Paskeviç əvvəlcə qalanı hücumla deyil, düzgün təşkil edilmiş mühasirə ilə almaq istədi və general-leytenant Krasovskini mühasirə korpusunun rəisi təyin etdi. Paskeviç ilk həmləni qalanın cənub hissəsindən başlamağı qərara aldı. Sentyabrın 15-dən başlayaraq Sərdarabad top atəşinə tutuldu və qaladakılar cavab atəşi açdılar. Sentyabrın 16-da tezdən mühasirə artilleriyası gəlib yetişəndən sonra onların qala ətrafında yerləşdirilməsinə başlandı. Sentyabrın 18-dən başlayaraq şəhər 24 topdan şiddətli atəşə tutuldu. 2 gün fasiləsiz davam edən atəşdən sonra qala qarnizonu ələ keçməmək üçün mühasirədən çıxmağa müvəffəq oldu. Sentyabrın 20-də səhər Paskeviç əsas qüvvələri ilə qalaya daxil oldu [32, sənəd 518, s.561; 177, 495-501; 93, 315-317]. Məcburiyyət qarşısında atılan bu addım Həsən xanın yüksək sərkərdəlik məharətini nümayiş etdirirdi. Bununla belə, qaladakı xeyli hərbi sursat və ərzaq — 13 top, 14 min çetvert buğda ilə dolu anbar, çoxlu pambıq parça, xeyli hərbi sursat rus qoşunlarının əlinə keçdi [177, 501-502; 32, sənəd 518, s.561-562, 563-564]. Şerbatova görə, qala qar-

* İ.Şopenin məlumatına görə, İrəvan xanı Hüseynqulu xan Qacar Sərdarabad qalasının əsasını 1810-cu ildə qoymuşdu [95, 255].

nizonundan 500 nəfər öldürülmüş və yaralanmış, 250 nəfər isə əsir götürülmüşdü. Burada ələ keçirilən taxıl ehtiyatı, Paskeviçin hesablamalarına görə, rus ordusunun bütün sağ cinahını altı ay ərzaqla təmin edə bilərdi. Bundan əlavə, anbarlarda çoxlu barıt, mərmi, pambıq və s. ehtiyatı, qala divarlarında isə 13 mis top ələ keçirilmişdi. Paskeviç hərbi əməliyyatlar jurnalında yazırdı: "Buradan əldə edilənlərin qiyməti yoxdur, onlar olmadan sonralar İrəvanın mühasirəyə alınması şübhə altında qalardı. Yəqin ki, Sərdarabad Abbas Mirzənin ordusunu ərzaqla təmin edən ehtiyat anbarı olmuşdur [93, 318]". Sərdarabad qalasında bu qədər ehtiyatın toplanması göstərirdi ki, xan öz qoşunlarını yadelli işğalçılara qarşı uzunmüddətli mübarizə üçün hazırlamışdı. Lakin çoxlu sayda top və batareyaların şəhəri fasiləsiz atəşə tutması nəticəsində xan və onun qoşunları həmin ərzaq və hərbi sursat ehtiyatlarını məhv edə bilməmişdi. Bəzi məlumatlara görə, Sərdarabadın itirilməsindən sonra şahın İrəvan və Naxçıvan xanlıqlarını güzəştə getmək niyyətinə baxmayaraq, Abbas Mirzə onun Rusiya ilə sülh bağlamaq barədə əmrini yerinə yetirmirdi [132, 168].

### *İrəvan qalasının dördüncü mühasirəsi, erməni xəyanəti və İrəvan qalasının süqutu (24 sentyabr — 1 oktyabr 1827-ci il)*

Qacarlar İranının hərbi uğursuzluqlarına baxmayaraq, İrəvan xanının qoşunları işğalçılara qarşı müqavimət göstərməkdə davam edirdi. Əsas diqqət İrəvan qalasının müdafiəsinə yönəldilmişdi. Sərdarabadın mühasirəsindən çıxa bilən Həsən xan İrəvan qalasını möhkəmləndirməkdə idi [177,505]. Sentyabrın 21-də Paskeviç mühasirə artilleriyasını Üçkilsəyə yola saldı. Ertəsi gün bütün dəstə İrəvana doğru yola düşməli idi. Sərdarabada polkovnik Xomutov komendant təyin edildi. Qala qarnizonu Krım alayından bir tabor, iki top,

erməni və kazak dəstələrindən ibarət idi [93, 319]. Sentyabrın 23-də Paskeviçin hərbi qüvvələri İrəvan qalasının 2 verstliyində düşərgə salaraq qala divarlarından 750 sajen məsafədə yerləşən Muğanlıtəpə kurqanını tutdu və İrəvan qalasına baxış keçirdi: "Zəngi çayının sıldırımlı sahilindən İrəvan qalasının bağları, minarə və qüllələri ilə birlikdə içəridəki binalar görünürdü. Dik sahilin zirvəsində, 200 sajen məsafədə mazğalları və cinahlarda bürcləri olan qala divarları uzanırdı. İrəvanın sahil müdafiə xəttinə lazımi fikir verilməmiş, bəzi yerlər isə uçub-tökülmüşdü. Lakin sahilin dik olması və çayın axını sahil müdafiə xəttini yarmağa və mühasirəyə almağa mane olurdu. Qalanın digər üç tərəfi isə 50 topla təchiz edilən və su ilə doldurulan dərin xəndəklə əhatələnmişdi. Bürclərdən və cinahlardan müdafiə olunan ikiqat qalın divarların olması isə qala qarnizonunun inadla müdafiə olunacağından xəbər verirdi. Sərdarabadın süqutu bundan sonra İrəvan qalasına başçılığı öz üzərinə götürmüş Həsən xanın güc və fəaliyyətini zəiflədə bilməmişdi. Paskeviç kəşfiyyat nəticəsində öyrənmişdi ki, İrəvan qalasındakı çoxlu barıt, mərmi və taxıl ehtiyatı onun müdafiəsini və qarnizonun ərzaq ehtiyacını bir neçə ay ödəyə bilər. Lakin Həsən xanın qardaşı — İrəvan sərdarı Hüseynqulu xan tərəfindən İrəvan şəhərindən və qalanın ətraf ərazilərindən qalaya 18 min əhali köçürülmüşdü. Yalnız onların tibbi-sanitariya vəziyyəti xanı narahat edə bilərdi" [93, 321-322]. Qalaya baxış keçirən Paskeviç oranın mühasirəsinə cənub-şərq tərəfdən başlamağı qərara aldı [93, 323]. İki hündür qülləsi olan İrəvan qalasının iri xəndəklə əhatə olunmuş divarları arxasında toplar qurulmuşdu. Qala qarnizonu 2 min əsgər və 2 min atıcıdan ibarət idi. Qaladakı ərzaq ehtiyatı yarım ilə nəzərdə tutulmuşdu [93, 263].

Artıq hər tərəfdən təcrid olunduğu üçün qalanın müdafiəsinin mümkünsüzlüyünü yəqin edən Hüseynqulu xan Qacar öz süvariləri ilə Türkiyəyə tərəf geri çəkildi. Qalanın müdafiəsinə onun qardaşı Həsən xan Qacar başçılıq etdi [177, 492].

1827-ci il sentyabrın 24-də İrəvanın rus qoşunları tərəfindən növbəti mühasirəsi başlandı. Paskeviç həmin gün Muğanlıtəpədən sağa doğru batareyalar qurdu və bütün gecəni qalanın içərisini top atəşinə tutdu [93,323; bax: bölmənin sonu, şəkil 1]. Şəhəri ara vermədən 2 batareya 3 gün artilleriya atəşinə tutdu. Ağır topların atəşinə davam gətirməyən qala bürcləri dağıldı. Qala müdafiəçilərini sudan məhrum etmək məqsədilə Paskeviçin əmrilə qala divarlarının dibindəki kəhrizlər daşla dolduruldu. Eyni zamanda Paskeviç Həsən xandan qalanın təslim olunmasını tələb etdi. Lakin bu müraciətə məhəl qoymayan Həsən xan Qacar əksinə, bürcləri təmir etdirərək yeni döyüşə hazırlaşdı. Qala qarnizonu rus qoşunlarını güclü atəşə tutdu. Lakin işğalçıların mühasirə korpusu topları şəhərə yaxınlaşdıra bildi. Növbəti təslim cavabına müsbət cavab almayan Paskeviçin əmrilə İrəvan qalasına 40 topdan 1000-dən artıq mərmi yağdırıldı. Şəhər od-alov içində yanmağa başladı. Uçqunlar altında və yanan şəhərin tüstü-dumanı içərisində qalan dinc əhali içərisində təşviş və ümidsizlik baş aldı [177, 505-511]. İrəvanlılar da düşməni top atəşinə tuturdular. Lakin qaladakı ermənilərin xəyanət edərək düşmənlə əlaqəyə girməsi vəziyyəti daha da ağırlaşdırdı. Erməni casusları Paskeviçlə əlaqə yaradıb qala müdafiəçilərinin mövqeyi, sayı, topların yerləşdirildiyi yerlər və s. barədə bütün hərbi sirləri ona çatdırırdılar. Bundan başqa, təcrübəli topçuların olmaması üzündən onların atdığı mərmilər sərrast olmurdu. Digər tərəfdən, bəzi topların arxasında ermənilər durduğundan onlar xəyanət edərək topu rus qoşununa deyil, boş yerlərə atırdılar [84,36; 153,86]. Həmçinin qaladan bayırda olan ermənilər də İrəvan qalasının ələ keçirilməsi üçün rus qoşunlarına yardım edirdilər. Əştərəkli Nerses adlı bir erməni sentyabrın 27-28-də rus qoşunlarına təcili yardım etmək üçün Üçkilsə kəndlilərinə xüsusi çağırışla müraciət etmişdi [172,44]. Bundan başqa, İrəvan qalasının mü-

dafiəsi zamanı şəhərdə yaşayan azsaylı ermənilər rus qoşunlarına hər cür yardım göstərirdilər. Hələ 1827-ci ilin aprelində şəhər əhalisi öz yerlərini tərk edib qalaya köçəndə ermənilər azərbaycanlılardan təcrid olunmuş şəkildə qalada yerləşdirilmişdi [153,85-86]. Ermənilər qala divarlarının üstünə qalxıb papaqlarını yellədə-yellədə təslim olduqları barədə işğalçılara işarə verdikləri halda [143, 164], qalanın azərbaycanlı əhalisi özlərinin qədim şəhərini qəhrəmancasına müdafiə etməkdə davam edirdilər.

Sentyabrın 30-da qalanın mühasirəsi daha da daraldıldı. Toplar yeni, daha yaxın mövqelərə gətirildi. Qala divarları bütün mövqelərdən atəşə tutuldu. Həsən xanın əmrilə oktyabrın 1-nə keçən gecə qala müdafiəçiləri rus qoşunlarını yenidən güclü atəşə tutdu. Lakin bu, istənilən nəticəni vermədi.

Oktyabrın 1-də qaladakı ermənilər işğalçılarla əlaqəyə girərək qiyam qaldırdılar və Həsən xandan tələb etdilər ki, qalanı ruslara təslim etsin.* Ermənilər, xanın bütün səylərinə baxmayaraq, qalanın şimal qapılarını rus qoşunlarının üzünə açdılar [32, sənəd 523, s.566]. Pottoya görə isə, qala qapılarının üzərində ağ bayraq qaldıran adamlar görünsə də, qapı açılmamışdı [177, 512-513]. Bu təslim bayrağını qaldıranlar yaşadıqları dövlətə xəyanət edən ermənilər idi. Artıq yuxarıda qeyd olunduğu kimi, İrəvanın mühasirəsi zamanı ermənilər Paskeviçlə əlaqəyə girə bilmiş və azərbaycanlıların qalanın hansı hissəsində yerləşdiklərini, top atəşlərini hara istiqamətləndirmək lazım olduğunu ruslara bildirmişdilər [153, 85-86]. Bundan istifadə edən podpolkovnik Qurko və Şepelevin dəstəsi qalanın cənub-şərq qülləsini tutdu. Bundan sonra qalanın şimal qapılarına yaxınlaşan Krasovski tatar dilini (Azərbaycan türkcəsi — ***red.***) yaxşı bilən Belova onlara elə həmin dəqiqə qala qapılarını açmalarını deməyi əmr etdi. Bu,

* Digər mənbənin məlumatında bu qiyamın sentyabrın 28-də baş verdiyi göstərilir və Həsən xanın bu tələbi rədd etdiyi qeyd olunur [bax:177,508].

sözlər Belovun ağzından çıxan kimi qaladan atəş açıldı və folkonetdən açılan iri mis mərmi onun beynini göyə sovurdu. Bu İrəvan qalasından Həsən xan Qacarın əli ilə atılan sonuncu mərmi oldu. Bir dəqiqədən sonra darvazalar açıldı və rus qoşunları qalaya soxuldu. Məlumata görə, İrəvan qalasının qəhrəman müdafiəçisi Həsən xan Qacar [bax: bölmənin sonu, şəkil 5] son anda qalanı düşmənə təslim etməkdənsə partlatmaq məqsədilə barıt qülləsinə yanan fitil qoymuşdu. Lakin poruçik Lemyakin bunu vaxtında görmüş və əli ilə yanan fitili götürmüşdü. Elə bu anda qarnizon silahı yerə qoymuşdu. Həsən xan isə özünə sadiq adamları ilə məsciddə müdafiə olunurdu [175, 415; 177, 512-513; 67, 252].

M.Şerbatova görə isə, ruslar qala qapısını sındırıb içəri girmişdi [93, 329]. Ermənilərin xəyanəti nəticəsində şəhərin qərb tərəfində yerləşən Təpəbaşı adlanan məhəlləni tutmağa hazırlaşan ruslar Zəngi çayını keçərək orada batareya qurdular... Məhz 6 günlük mühasirədən sonra bu hissədən qala divarları dağıdıldı və 6 qvardiya alayı şəhərə daxil ola bildi [153, 86].

Erməni xəyanətindən istifadə edərək qalaya daxil olan rus qoşunları ilə onun qəhrəman müdafiəçiləri arasında qanlı döyüş baş verdi. 200-dək əyanla qaladakı məscidlərin birinə çəkilən Həsən xan Qacar müqavimət göstərməkdə yenə də davam edirdi. Axşama yaxın İrəvan qalası işğalçıların əlinə keçdi. Həsən xan Qacarla* bərabər qalanın komendantı Sübhanqulu xan,** xüsusi tabor komandiri Qasım xan,

* Doğma torpağının azadlığı uğrunda işğalçılara qarşı rəşadətlə vuruşan, "Aslanlar başı" titulu daşıyan Həsən xan Qacarın sonrakı aqibəti haqda məlumat olduqca azdır. Həsən xan Qacar İrəvan qalasının işğalından sonra Paskeviç tərəfindən Peterburqa — I Nikolayın yanına göndərildi. Lakin onun Peterburqa çatmasına siyasi şəraitin dəyişməsi mane oldu. Həsən xan Qacar yolda Terek sahilində Yekaterinoqradda saxlanıldı [bax: 177, 516]. Xanın sonrakı taleyi haqda məlumat verilmir.

** Paskeviç İrəvan qalasının işğalından iki gün sonra — 1827-ci il oktyabrın 3-də verdiyi raportunda Həsən xan Qacarla bərabər əsir düşən 6 nəfərin arasında Sübhanqulu xanın da olduğunu qeyd edir [bax: 32, sənəd 523, s.566]. Digər müəlliflər isə Sübhanqulu xanın bir qədər sonra poruçik Çevkin tərəfindən zirzəmidən tapıldığını göstərirlər [bax: 177, 514; 93, 329].

Mərəndli Cəfərqulu xan, Təbrizli Əlimərdan xan, Əhərli Aslan xan, Fətəli xan və başqaları ələ keçirildi. Həmçinin qala üzərindəki bütün toplar, silah və sursat ehtiyatı da düşmənin əlinə keçdi [32, sənəd 523, s.564-566; 93, 328-330; 177, 514]. Bundan əlavə, vaxtilə böyük türk sərkərdəsi və hökmdarı Əmir Teymura məxsus olmuş, dəstəyi qızıl və qiymətli daşlarla bəzədilmiş Həsən xan Qacara məxsus qiymətli qılınc* da rusların əlinə keçdi.

Rus qoşunlarının İrəvanda törətdikləri dağıntılar və şəhərə vurulan maddi zərərlə bağlı V.Potto hadisənin şahidi olan bir nəfərin dediklərini olduğu kimi yazırdı: "Mən qalanın cənub-şərq küncünə çatarkən divar və bürclərin dağıntısına təəccübləndim. Mənə elə gəlir ki, mühasirə artilleriyasının dörd gündə etdiyini çərxi-fələk dörd əsrdə belə edə bilməzdi" [177, 516; bax: bölmənin sonu, şəkil 3, 5, 6].

Doğma torpağının azadlığı naminə dəfələrlə yadellilərə qəhrəmancasına müqavimət göstərən İrəvan qalasının ələ keçirilməsi Rusiya imperatorunun sarayında böyük sevinclə qarşılandı və təntənəli mərasimlə qeyd olundu. V.Potto bu hadisəni təsvir edərək yazır ki, İrəvan qalasının işğalı xəbərini alan I Nikolay Riqadan tələsik Peterburqa qayıtdı. Noyabrın 8-də İrəvanın alınması münasibətilə imperator bütün ailə üzvləri ilə birlikdə Qış sarayı kilsəsində dua oxuma mərasimi keçirdi. Elə həmin gün İrəvan qalası darvazasının açarları və qala divarlarından ələ keçirilmiş 4 bayraq şəhərin mərkəzi küçələrindən keçirilərək nümayiş etdirildi [bax: 177, 518-519].

Erməni xəyanəti nəticəsində əldə olunan bu "qələbəyə görə Paskeviç qraf titulu aldı" [93, 330]. Bundan əlavə, Paskeviç Abbasabadın

* Əmir Teymur bu qılıncla vaxtilə (1402 — ***red.***) Osmanlı sultanı İldırım Bayazidi məğlub etmişdi. Əmir Teymurdan Səfəvi şahlarına keçən qılınc, Nadir şah hakimiyyətə gələrkən Səfəvilərin digər qiymətli əmlakı ilə bərabər onun əlinə keçmişdi. Nadir şahdan sonra Qacarlar sülaləsinin əlinə keçən bu qılınc Fətəli şah Qacara çatmışdı. Fətəli şah türklər üzərində qələbədən sonra göstərdiyi igidliyə görə bu qılıncı Həsən xan Qacara bağışlamışdı. Həsən xan İrəvan qalasından kəndirlə düşərkən itirdiyi qılıncının tapılmasını general Krasovskidən xahiş etdi. Bu qiymətli qılınc tapılaraq I Nikolaya hədiyyə göndərildi [bax: 59, 61-62; 177, 515-516].

alınmasına görə 1-ci dərəcəli Müqəddəs Vladimir ordeni, İrəvanın alınmasına görə 2-ci dərəcəli Georgi ordeni, sülhün bağlanmasına görə 1 milyon rubl dəyərində əskinas və İrəvan qalasının ələ keçirilməsinə görə "Erivanski" titulu aldı [177, 591]. Bundan əlavə, İrəvan qalasının alınması münasibətilə xüsusi medallar təsis olundu [bax: bölmənin sonu, şəkil 6,7]. İşğalçı general İrəvanda Krasovskinin rəhbərliyi ilə "müvəqqəti hökumət" təşkil etdi. Ermənilərin işğalçı rus qoşunlarına göstərdikləri "qulluğa" görə arxiyepiskop Nerses həmin hökumətə üzv seçildi. Qafqazşünas S.Qlinkanın qeyd etdiyi kimi "Krasovski və Nerses əlbir hərəkət edirdilər" [46, 34-35; 132, 170].

Paskeviçin əmrilə 1827-ci il oktyabrın 2-də İrəvan qalasının işğalı ilə bağlı rus qoşunlarının "qələbə" paradı keçirildi. Parad zamanı İrəvanın qala divarlarının böyük bir hissəsi, sanki tarixin bu ədalətsizliyinə tab gətirməyərək, uçdu və onun dağıntıları altında çoxlu işğalçı Rusiya əsgəri qalıb məhv oldu [177, 517-518].

İrəvan xanlığının işğalı ilə Şimali Azərbaycanın bütün ərazisi Rusiyanın tərkibinə qatıldı. Məğlub edilmiş Qacarlar İranı ilə 1828-ci il fevralın 10-da Türkmənçayda müqavilə imzalandı. Müqavilənin üçüncü maddəsinə əsasən, Şimali Azərbaycanın Gülüstan müqaviləsinə (1813) daxil edilməmiş İrəvan və Naxçıvan xanlıqları da Rusiya imperiyasına ilhaq edildi [76, 125-126-131; bax: bölmənin sonu, sənəd 4].

Beləliklə, Türkmənçay müqaviləsi ilə Azərbaycan torpaqları iki imperiya arasında yenidən — ikinci dəfə bölüşdürüldü. Öz torpağının əsil sahibi olan Azərbaycan xalqının iradəsi nəzərə alınmadan Azərbaycan Rusiya imperiyası ilə Qacarlar İranı arasında bölüşdürüldü. Şimali Azərbaycan çar Rusiyasının, Cənubi Azərbaycan isə Qacarlar İranının əsarəti altına düşdü. Çox keçmədən — 1828-ci il

martın 21-də (Novruz bayramı günlərindən birində — ***red.***) imperator I Nikolayın xüsusi fərmanı ilə Rusiya işğalçıları qədim Azərbaycan torpağı olan İrəvan və Naxçıvan xanlıqları ərazilərində "Erməni vilayəti" adlı qondarma qurum yaratdılar [76, 272-273; 32, sənəd 437, s.487; bax: bölmənin sonu, sənəd 5]. Bununla Azərbaycan torpaqlarında sonralar erməni dövləti yaradılmasının, həm də Cənubi Qafqaz regionunda yeni gərginlik ocağının əsası qoyuldu [163,37].

V

# СМУТЫ ВЪ ГРУЗІИ

**88.** *Всеподданнѣйшій рапортъ маркиза Паулуччи, отъ 22-го февраля 1812 года, № 46.*

Въ донесеніяхъ моихъ, отъ 12-го числа сего мѣсяца, чрезъ военнаго министра я имѣлъ счастіе довести до Высочайшаго свѣдѣнія В. И. В. объ окончаніи военныхъ дѣйствій въ Дагестанѣ, кои совершены съ величайшею пользою для службы В. В. Нынѣ-же съ живѣйшею скорбью я долженъ изложить прямо предъ В. И. В., что можетъ быть послѣдовало-бы совершенное истребленіе Россійскихъ войскъ, въ здѣшнемъ краѣ расположенныхъ, какъ благоусмотрѣть изволите изъ слѣдующаго:

7-го числа сего мѣсяца получено было мною, при возвращеніи изъ Дербента въ Кюри, непріятное извѣстіе, что Персіяне въ числѣ 20 т. войскъ, между коими бóльшая часть находилась изъ регулярной пѣхоты, при 12-ти орудіяхъ, ворвались въ Карабагскую провинцію, почему для удержанія Карабага я на другой-же день, то-есть 8-го числа, командировалъ отрядъ изъ 1,000 человѣкъ, поручивъ оный полк. Котляревскому, съ повелѣніемъ слѣдовать къ новой Шемахѣ форсированнымъ маршемъ. Самъ-же, проѣхавъ чрезъ Баку (гдѣ мнѣ необходимо нужно было окончить многія дѣла), я долженъ былъ соединиться съ симъ отрядомъ 12-го числа. Въ самомъ дѣлѣ, 12-го я прибылъ въ новую Шемаху и оттоль сначала поспѣшилъ въ Зардобъ, дабы итти искать непріятеля и его разбить; но судьба въ семъ случаѣ рѣшила иначе. Въ новой Шемахѣ получилъ я рапортъ полк. Живковича, начальствующаго войсками въ Карабагѣ, что баталіонъ Троицкаго полка, подъ командою маіора Джини, занимавшій постъ въ Султан-будѣ, былъ 1-го числа сего мѣсяца атакованъ непріятелемъ, и что когда сей маіоръ былъ убитъ, а маіоръ Сачевскій тяжело раненъ и кап. Гумовичъ также убитъ, то кап. Оловяннишниковъ, послѣ ихъ принявшій команду надъ баталіономъ, былъ столько подлъ, что войдя въ сношенія съ непріятелемъ, сдался въ плѣнъ.

По прибытіи моемъ въ Зардобъ я освѣдомился, что непріятель, узнавши о моемъ движеніи съ войскомъ, спѣшилъ, собравъ Карабагскихъ жителей сколько могъ, переправить за Араксъ; также, что самъ Баба-хановъ сынъ Аббас-мирза принялъ намѣреніе ретироваться. Побужденіемъ къ сей экспедиціи на Карабагъ и проводникомъ непріятелю былъ Джафар-Кули-ага, предназначенный наслѣдникъ Карабагскаго ханства, который, имѣвъ причины къ неудовольствіямъ, давно уже вошелъ въ тайныя сношенія съ Персидскимъ правительствомъ и котораго, сколь скоро измѣна его была обнаружена чрезъ письма къ нему Персидскаго правительства, кои бывъ перехвачены, нынѣ имѣются у меня, немедленно приказалъ арестовать, что и было въ точности исполнено, но тотъ-же самый кап. Оловяннишниковъ, который сдалъ Персіянамъ баталіонъ, упустилъ его изъ-подъ караула. Теперь приказалъ я собрать всѣ бумаги относительно сего безчестнаго дѣла, дабы дать вѣрный во всемъ отчетъ В. И. В.

Затѣмъ, къ вящшему прискорбію моему получилъ я рапортъ изъ Тифлиса, что вдругъ весь Кахетинскій народъ и жители Анануркаго уѣзда, покушавшіеся овладѣть кр. Анануромъ, дабы симъ способомъ войти въ связь съ обитателями Кавказскаго

Sənəd 1. Qafqazdakı rus qoşunlarının komandiri markiz Pauluqçinin 22 fevral 1812-ci tarixli məlumatı

***Mənbə:*** AKAK, т.V. Тифлис, 1873, д. 88, с.59-60

Rusiyadan narazı qalan azərbaycanlı əhalinin sərhədin o tayında cəmləşməsi Paskeviçi narahat etdi. Buna görə də o, Nersesi İrəvanın "Müvəqqəti idarə"sindən uzaqlaşdırmağa məcbur oldu. Türkmənçay müqaviləsi imzalandıqdan sonra Paskeviç general Krasovskini də "Müvəqqəti idarə"nin rəisi vəzifəsindən azad etdi. Bunun ardınca azərbaycanlı əhaliyə qarşı bəd əməllərindən əl çəkməyən Nersesi Bessarabiyaya sürgün etdirdi [109, 22; 172,72].

Türkmənçay müqaviləsinin təsdiq edilməsinin (20 mart, 1828) ertəsi günü I Nikolay "Erməni vilayəti" yaradılması haqqında fərman imzaladı. Fərmanda deyilir: "İranla bağlanmış müqaviləyə əsasən, İrandan Rusiyaya birləşdirilən İrəvan və Naxçıvan xanlıqlarını bundan sonra "Erməni vilayəti" adlandırmağı hökm edir və öz titulumuza daxil edirik. Həmin vilayətin quruluşu və onun idarə edilməsi qaydası haqqında Ali Senat lazımi fərmanları öz vaxtında alacaqdır" [76, 272-273; bax: bölmənin sonu, sənəd 2]. Rusiyaya ilhaq olunan iki Azərbaycan xanlığının torpaqları hesabına yaradılan "Erməni vilayəti" İrəvan və Naxçıvan əyalətlərinə və Ordubad dairəsinə bölünmüşdü [32, sənəd 437, s.487]. İrəvan əyalətinə, keçmiş İrəvan xanlığında olduğu kimi, 15 mahal, Naxçıvan əyalətinə 5 mahal, Ordubad dairəsinə də 5 mahal daxil idi. "Erməni vilayəti" idarəsinin rəisi vəzifəsinə yerli qoşunların komandanı general-mayor, gürcü knyazı A.Q.Çavçavadze təyin edilmişdi [32, sənəd 438, s.487; 109, 23].

### *Ermənilərin İrandan İrəvan xanlığı ərazisinə köçürülməsi*

***Köçürməyə hazırlıq.*** Türkmənçay müqaviləsinin 15-ci maddəsinə görə, şah hökuməti müharibə dövründə öz dövlətinə xəyanət edərək ruslara xidmət etmiş şəxslərin (yəni ermənilərin — ***red.***) Rusiya tabeliyində olan ərazilərə köçmələrinə mane olmamalı idi. Bununla da İranda yaşayan ermənilərə sərbəst surətdə Rusiyanın himayəsinə keçmək hüququ verildi [47, 339-341; 130, 85-86]. İranın hökumət və yer-

li hakimiyyət orqanlarının heç bir maneçiliyi olmadan, onların satlıq malına və ya əmlakına, əşyalarına hər hansı gömrük və vergi qoyulmadan daşınan əmlakını aparmaq və satmaq üçün bir il, daşınmaz əmlaka gəldikdə isə, onun satılması və ya onun haqqında özxoşuna sərəncam (vəkalət) üçün 5 illik müddət müəyyən edildi [76, 130; 75, 221-222; 46, 44; 4, 283].

Ermənilərin Şimali Azərbaycan torpaqlarına köçürülməsi layihəsi hələ 1827-ci ildə A.S.Qriboyedovun başçılıq etdiyi Cənubi Qafqaz diyarının diplomatik dəftərxanasında hazırlanmışdı. Rusiyanın İrandakı səfiri A.S.Qriboyedov İran ermənilərinin yenicə işğal edilmiş Şimali Azərbaycan torpaqlarına köçürülməsində fəal iştirak edirdi. Ermənilərin Şimali Azərbaycan torpaqlarına köçürülməsinin reallaşması ilə əlaqədar olaraq Rusiya hökumətinin İranla sərhədboyu ərazilərə 80 min kazakın köçürülməsi barədə əvvəllər hazırladığı layihə qüvvədən salındı [79, sənəd 923, v.1-16; 153, 128, 129]. İ.Yenikolopova görə, A.Qriboyedov ermənilərin İrandan Rusiya sərhədlərinə, yəni Çuxursəd çökəkliyinə köçürülməsinə xüsusi diqqətlə yanaşır və bu məsələyə Rusiyanın Şərqdəki mövqelərinin möhkəmlənməsinin təminatı kimi baxırdı [153,128].

Artıq 1827-ci ilin mayında general Paskeviçin Peterburqdan xüsusi tələbnamə əsasında ermənilər arasında nüfuza malik olan polkovnik Lazaryevi* (Qazaros Lazaryan**) öz sərəncamına götürməsi ilə köçürülmənin hazırlıq işlərinə başlandı [153, 129]. Oktyabrın əvvəlində artıq Lazaryev Cənubi Azərbaycan erməniləri arasında iş aparmaq üçün ayrılan dəstənin tərkibində idi. Rus qoşunlarının Təbrizə

---

* Rusiya imperiyası ermənilərin İrandan Şimali Azərbaycan torpaqlarına köçürülməsini mütəşəkkil həyata keçirmək üçün Peterburqda yaşayan polkovnik Q.Lazaryevi 1827-ci il oktyabrın 19-da Təbrizə komendant təyin etdi [46, 40]. Hələ XVIII əsrdə Rusiya çarlarının qılığına girərək Peterburqda və Moskvada möhkəmlənən varlı erməni ailəsinin nümayəndəsi olan bu qaniçən polkovnik, 1787-1791-cı illərdə baş vermiş Osmanlı — Rusiya savaşında türklərə qarşı qəddarlığı ilə seçilən qardaşı İvan Lazaryev [bax: 74, 649] kimi, nəinki Azərbaycan türklərinin, bütövlükdə müsəlmanların düşməni idi.

** Q.Lazaryanın 1828-ci il martın 30-da İran ərazisində yaşayan və Şimali Azərbaycan torpaqlarına köçürülməsi nəzərdə tutulan ermənilərə müraciətinin erməni dilində olan variantında qaniçən generalın adı tam şəkildə verilir [46, 111].

hücumu zamanı (13 oktyabr — ***red.***) Lazaryevin çağırışından "ruhlanan" ermənilər həmişə olduğu kimi, yenə də yaşadıqları dövlətə xəyanət edərək Təbrizin darvazalarını rus qoşunlarının üzünə açdılar. Oktyabrın 19-da Lazaryevin Təbrizin komendantı təyin edilməsi xəbəri ermənilər tərəfindən böyük sevinclə qarşılandı [46, 38, 40].

Yeri gəlmişkən, Rusiya hakim dairələrinin ermənilərin Şimali Azərbaycana köçürülməsi siyasətinin hazırlanmasında "uzaqgörən" ermənilər az rol oynamamışdılar. Bu qanlı siyasətin həyata keçirilməsi məxfi deyildi və açıq-aşkar surətdə həyata keçirilirdi. Köçürmə planının həyata keçirilməsində bütün ermənilərin katolikosu yepiskop Nerses öz köməkliyini vəd etmişdi [153, 129]. Paskeviç, eyni zamanda, Tiflisin hərbi qubernatoru Sipyaginə dekabrda göndərdiyi məktubda bildirmişdi ki, Urmiya ətrafında yaşayan 15 min yunan [aysor — ***red.***] və erməni Rusiyanın əyalətlərinə köçmək istəyir. Sipyagin isə cavabında onların İrəvan və Naxçıvan əyalətlərində yerləşdirilməsi təklifini irəli sürmüşdü [153, 129-130]. Arxiv sənədləri sübut edir ki, İran ermənilərinin özləri də general Paskeviçin yanına gələrək onların Rusiya tərəfindən yeni ələ keçirilmiş vilayətlərə köçürülməsinə icazə istəyirdilər [79, iş 978, №1; 153, 129-131]. Diqqəti cəlb edən cəhət budur ki, İrəvan və Naxçıvan vilayətlərinin Azərbaycan torpaqları olduğunu yaxşı bilən ermənilər Rusiya işğallarından sonra məqsədyönlü olaraq mütəşəkkil surətdə və kütləvi halda məhz bu ərazilərə köçürülmələrinə nail olmaq istəyirdilər.

Türkmənçay müqaviləsi imzalandıqdan dərhal sonra — 1828-ci il fevralın 14-də Lazaryev elə oradaca Paskeviçə göndərdiyi raportunda xatırladırdı ki, ermənilər müharibə zamanı Rusiyanın qələbəsi üçün mümkün olan hər şeyi ediblər və indi evlərini qoyub Rusiya tərəfə (yəni İrandan Şimali Azərbaycana — ***red.***) köçmək istəyirlər. Ermənilərin sürətlə və rahat köçürülməsi üçün Lazaryev aşağıdakı təklifləri edirdi: "1) Köçürmə işlərinə rəhbərlik etmək üçün Paskeviç

ona yazılı təlimat versin və həmin sənəddə köçənlərə verilən güzəştlər göstərilsin; 2) köçürmə işlərinə rəhbərlik etmək üçün erməni dilini bilən lazımi qədər ştabs və ober-zabitlər təyin etmək məsələsi onun ixtiyarına verilsin (bununla Lazaryev bu işə erməni zabitlərini cəlb etmək istəyirdi — ***red.***); 3) iqlim şəraitinə görə köçürmə işlərinin ləngiyəcəyi yerlərdə rus ordusu orada gözləsin və ordu köçənləri müşayiət etsin; 4) kasıb köçkünlər üçün xəzinədən vəsait ayrılsın" [32, sənəd 553, s.588; 32, sənəd 561, s.603-604; 109, 26].

Paskeviç bu təkliflərin yerinə yetirilməsi üçün fevralın 26-da Lazaryevə, 29-da isə İrəvan "Müvəqqəti idarə"sinə xüsusi təlimat göndərdi.

Paskeviçin Lazaryevə verdiyi 19 maddəlik təlimatda göstərilirdi: ***"Köçürülən xristianlardan ticarətlə məşğul olanlar şəhərlərdə yerləşdiriləcəklər ki, yenə ticarətlə məşğul olsunlar; kəndlilərə kifayət qədər münbit torpaq ayrılacaq və onlar 6 il müddətinə vergilərdən, 3 il müddətinə isə torpaq mükəlləfiyyətindən azad ediləcəklər; köçməyə hazır olan ailələrə veriləcək güzəştlər haqqında onlara xüsusi formada vərəqələr verilməlidir; köçürülənlər kəndlər üzrə dəstələrə ayrılmalı, hər dəstədə 150-dən 300-ə qədər ailə olmalıdır; köçürülənləri İrəvan və Naxçıvan əyalətlərinə istiqamətləndirmək lazımdır ki, həmin ərazilərdə xristian əhali mümkün qədər artırılsın; hər dəstəni müşayiət etmək üçün ermənicə bilən bir zabit və 2-5 kazak ayrılsın; köçkün dəstələri yola düşən kimi, dərhal İrəvan "Müvəqqəti idarə"sinə ailələrin sayı, onların yaşadıqları ərazinin iqlim şəraiti, məşğuliyyətləri, malik olduqları sürülər və sərhədə yetişəcəkləri təxmini vaxt haqqında xəbər göndərmək lazımdır. Kasıb ailələrə 10 gümüş rublu keçməmək şərti ilə köməklik göstərmək üçün 25 min rubl gümüş pul ayrılsın"*** [bax: 46,98-107; bax: bölmənin sonu, sənəd 3].

Paskeviçin İrəvan "Müvəqqəti idarə"sinə verdiyi 16 maddəlik təlimatda isə göstərilirdi: "***Komitə köçürülən ailələrin sayına uyğun torpaq***

***sahəsi ayırmalı və onların nəzərdə tutulan yerlərdə məskunlaşmasına rəhbərlik etməlidir. Komitə çalışmalıdır ki, köçürülən kəndlərin sakinləri, əvvəlki ərazilərindəki kimi, yığcam şəkildə ayrıca və bir-birinə qonşuluqda yerləşdirilsinlər. Dağlıq şəraitində yaşayanlar dağlıq yerdə, düzənlikdə yaşayanlar isə düzənlikdə yerləşdirilməlidir ki, onlar mümkün qədər xəstəlik və ölümdən xilas olsunlar, onların adət-ənənələrinin və təsərrüfat vərdişlərinin saxlanılmasına şərait yaradılsın.* Müsəlmanların yaşadıqları kəndlərdə xristianların yerləşdirilməsinə yol verməməli, xristianlardan ibarət ayrıca dairə və mahallar yaratmaq lazımdır. Müsəlman (xristian) kəndlərinin əhatəsində yaşayan xristianları (müsəlmanları) öz dindaşlarının yanına köçürmək lazımdır. Köçürülənlər mülkədar torpaqlarında deyil, dövlət torpaqlarında yerləşdirilməlidir. Yeni məhsul götürülənədək ilkin taxıl səpini üçün köçürülənlərə bərabər miqdarda borc verilməli, təsərrüfatın dirçəldilməsi üçün götürülən borc faizsiz olaraq dörd il müddətinə verilməli, bundan sonra altı il ərzində ödənilməlidir. Məskunlaşdırmaq üçün yer seçərkən sağlamlıq üçün şərait və yaxşı içməli suyun olması nəzərə alınmalıdır. Hər bir ailənin yerləşdirilməsi haqqında xüsusi formada hesabat verilməli və hesabatda çəkilən ümumi xərclərin miqdarı göstərilməlidir"*** [77,189-191; 109, 27-28].

Qeyd etmək lazımdır ki, sonralar hər iki təlimatın köçürmədə könüllülük prinsipinin əsas tutulması barədə tələbləri tamamilə pozuldu. Belə ki, Lazaryev və onun yerlərə göndərdiyi erməni nümayəndələr Türkmənçay müqaviləsini və onlara verilən təlimatı pozaraq erməniləri Şimali Azərbaycana könüllü deyil, zorla köçürməyə başladılar.

Rusiyanın bufer erməni dövləti yaratmaq siyasətini başa düşən Abbas Mirzə Rusiya ilə İranın yeni sərhədləri boyunca ermənilərin

* Rusiya hökuməti ermənilərə belə qayğı göstərdiyi halda, 1948-1953-cü illərdə azərbaycanlıların doğma torpağı olan İrəvan bölgəsindən deportasiyası zamanı dağlıq və dağətəyi bölgədən köçürülən əhali Azərbaycan SSR-in isti iqlimi olan Kür-Araz ovalığında yerləşdirildi və bununla onların həyatına qəsd edildi. Bu ağır cinayət nəticəsində onlar kütləvi surətdə qırılıb məhv oldular.

kütləvi surətdə yerləşdirilməsindən narahat idi [65, 60]. Buna görə də o, ermənilərin İrandan kütləvi surətdə köçürülməsinə mane olmağa çalışırdı. Bu prosesin qarşısını almaq üçün onun nümayəndələri yerlərdə olur, ermənilərə köçmədikləri halda 6 il müddətinə vergilərdən azad ediləcəklərini vəd edirdilər [32, sənəd 586, s.619-620]. Bununla bağlı Abbas Mirzə iki dəfə polkovnik Lazaryevə müraciət etmişdi ki, ermənilərin zorla köçürülməsi hallarına son qoysun və Türkmənçay müqaviləsinin şərtlərinə əməl etsin [bax: 46, 66-67, 76-78]. Abbas Mirzənin Lazaryevə göndərdiyi ikinci məktubunda erməni polkovnikin ikiüzlü siyasəti açıq-aydın ifşa olunurdu: ***"İndi cənabınız Səlmasda qalır və qoşunlar da oradadır. Köçməyən kəndlərdən kazaklar və yasavullar vasitəsilə pul tələb edirsiniz, köçənlərə isə, eyni zamanda, pul verirsiniz"*** [46, 77-78].

Ermənilərin Şimali Azərbaycan torpaqlarına zorla köçürülməsi onların öz içərisində də ciddi etirazlara səbəb olurdu. Bununla bağlı Lazaryev öz hesabatında general Paskeviçə yazırdı ki, İranda yaşayan saysız-hesabsız nestorianları [aysor — ***red.***] razı salmaq üçün durmadan səy göstərməyimə və daha çox maddi yardım təklif etməyimə baxmayaraq, böyük zəhmət bahasına yalnız yüzə yaxın ailə köçürə bilmişəm [46, 115]. Bundan əlavə, Səlmas monastırının yepiskopu İsrael ermənilərin zorla köçürülməsinə maneçilik törətdiyi üçün erməni arxiyepiskopu Nerses 1828-ci il martın 17-də general Paskeviçə yazdığı məktubunda generaldan xahiş etdirdi ki, İsraeli bu işdən çəkindirmək üçün Xoydakı yerli komendanta göstəriş versin və onu rütbəsindən məhrum edərək cəzalandırmaq üçün Üçkilsəyə göndərsin [32, sənəd 568, s.607-608; 65, 72-73; 109, 28]. Həmin il martın 19-da general Paskeviçin Nersesə cavab məktubunda bu xahişin yerinə yetiriləcəyi vəd olunurdu [32, sənəd 568, s.607-608].

***Köçürmənin həyata keçirilməsi.*** Şimali Azərbaycana köçürülən kasıb erməni ailələrinə kömək üçün xəzinədən 25 min rubl gümüş pul ayrılmışdı. Lazaryevin və ona təhkim edilən erməni zabitlərin vəzifəsi köçürülənlərin sərhədə çatdırılması ilə bitirdi. Bundan sonrakı işlə-

rə rəhbərlik İrəvan "Müvəqqəti idarə"si yanında xüsusi olaraq köçürülən ermənilərin yerləşdirilməsi üçün yaradılan komitəyə həvalə edilirdi. Komitə köçürülən erməni dəstələrini sərhəddə qarşılamaq üçün heyət göndərməli və həmin heyət onları yeni yaşayış məntəqəsinədək müşayiət etməli idi. Qarabağ üzrə bu vəzifə gömrük hərbi dairəsinin rəisi knyaz Abxazova həvalə edildi [46,105-106].

Ermənilərin İran ərazisindən Şimali Azərbaycan torpaqlarına köçürülməsinin həyata keçirilməsi haqqında məlumatı Lazaryevin 1829-cu il dekabrın 24-də qraf Paskeviçə yazdığı "Yekun hesabat"ında izləmək mümkündür. Hesabata görə, köçürmə prosesi 1828-ci il fevralın 26-da başlamış və iyunun 11-də başa çatdırılmışdı. Bu qanlı siyasətin tezliklə həyata keçirilməsinə çox canfəşanlıq göstərən erməni general Qazaros Lazaryan şəxsən özü rəhbərlik etmişdi. Digər erməni zabitləri — 41-ci yeger polkunun podpolkovniki knyaz Melikov Üzümçü və onun ətrafındakı kəndlərin, gürcü qrenadyor polkunun podpolkovniki knyaz Arqutinski-Dolqoruki Təbriz, onun ətrafındakı kəndlərin və Səlmas əyalətinin, kollec asessoru Qamazov Marağa və Urmiya xanlıqları kəndlərinin, knyaz Şalikov isə Xoy xanlığında yaşayan ermənilərin köçürülməsində* ona yaxından kömək etmişlər [bax: 46, 48, 55, 63, 69, 115-116].

Müqaviləyə əsasən, rus qoşunlarının geriçəkilmə prosesinə martın 8-dən etibarən Marağadan başlanıldığı üçün ilk növbədə orada yaşayan erməniləri köçürmək nəzərdə tutulurdu. 1828-ci il fevralın axırla-

* Tədqiq olunan dövr üzrə mütəxəssis olmayan AMEA-nın müxbir üzvü, t.e.d. F.Məmmədova yazır ki, İrandan Azərbaycan torpaqlarına köçürülən ermənilər guya XVII əsrin əvvəllərində Qarabağdan İrana sürgün edilmiş xristian albanlar idi [Мамедова Ф. Дж. Кавказская Албания и албаны. Баку, 2005, s.601-602 və s.]. Bu fikrin heç bir elmi əsası yoxdur. Çünki həmin dövrün görkəmli mütəxəssisi, tanınmış şərqşünas İ.P.Petruşevskinin araşdırmalarına görə, Şah I Abbasa qarşı üsyan edən Qarabağ xristianları — albanlar Mazandarana sürgün olunmuşdular. Çar Rusiyası isə Mazandarandan Şimali Azərbaycan torpaqlarına ümumiyyətlə xristian əhali köçürməmişdir. Digər tərəfdən, bu qeyri-elmi iddianın kiçicik belə elmi əsası olsaydı, bunu qanlı köçürmə siyasətini həyata keçirən Rusiya işğalçıları hamıdan əvvəl və hamıdan daha yaxşı əsaslandırardılar.

rında Marağaya gələn Lazaryev qar yağdığı üçün köçürməni dayandırıb erməni dəstələrini Marağa kollec asessoru Qamazova və ştabs-kapitan Voynikova tapşırıb… martın 7-də Marağadan çıxdı. Artıq martın 9-da general Paskeviç və "Müvəqqəti Azərbaycan İdarə Heyəti"nin üzvləri Təbrizi tərk etdi. Abbas Mirzə yenidən Təbrizdə öz hakimiyyətini bərpa etdi. Buna görə də Lazaryev Təbrizdən cəld keçərək Sufiyana — (Təbrizin şimalında qəsəbə — ***red.***) rus sərkərdəsinin yanına gəldi və köçürmə üçün yeni pul vəsaiti ayrılmasına icazə aldı [46, 55-56]. Həmin il martın 9-da Lazaryev Paskeviçə yazdığı raportunda göstərirdi ki, artıq 4500 erməni ailəsi köçürülərək Araz çayının İran tərəfindəki sahilinə gətirilmişdir [32, sənəd 592, s.624-625].

Türkmənçaya yaxın olan müxtəlif kəndlərin ermənilərini keçmiş Qarabağ xanlığının ərazisinə yola salan Lazaryev ermənilərin köçürülməsi prosesini davam etdirmək üçün podpolkovnik Arqutinski-Dolqorukini Təbrizdə qoyaraq özü yenidən Marağaya yola düşdü [46,48]. Səlmas və Qəzvin xanlıqları ərazisindən gələn ailələr də Marağadan köçürülən dəstələrə qoşuldular [bax: 46,57-58]. Köçürmə işlərinin ləngidiyini görən Lazaryev 1828-ci il martın 30-da ermənilərə müraciət etdi. Müraciətdə deyilirdi: ***"…orada*** *(yəni Şimali Azərbaycanda —* ***red.****)* ***siz xristianların məskunlaşdırıldığı Yeni Vətən əldə edəcəksiniz … İranın müxtəlif əyalətlərinə səpələnmiş xristianların bir yerə cəmləşdiyini görəcəksiniz. Tələsin! Vaxt qiymətlidir. Tezliklə rus qoşunları İranı tərk edəcək, bundan sonra sizin köçməyiniz çətinləşəcək və biz sizin təhlükəsiz köçməyinizə cavabdeh olmayacağıq. Azca itkiyə məruz qalsanız da, qısa zamanda hər şeyə nail olacaqsınız, özü də həmişəlik"*** *[46, 107-111;* bax: bölmənin sonu, sənəd 4]. Lazaryevin müraciətinin ermənicə mətni İranda yaşayan bütün ermənilər arasında yayıldı.

1828-ci ilin aprel-may aylarında Lazaryev Urmiya, Xoy, yenidən Səlmas xanlıqlarında və İranın Kürdüstan ərazisində yaşayan ermənilərin də Şimali Azərbaycan torpaqlarına köçürülməsini təmin etdi [bax: 46, 59-60, 61-62]. Lazaryev İrandan təkcə erməniləri deyil, kürdləri də Şimali Azərbaycan torpaqlarına köçürməyə çalışırdı. O, 1828-ci il mayın 27-də göndərdiyi raportda təxminən 500 ailədən ibarət müsəlman kürdlərin də İran Kürdüstanından İrəvan əyalətinə köçmək niyyətində olduğunu bildirmişdi. Lakin erməni zabitinin bu planı baş tutmadı. Çünki hələ fevralın 29-da Lazaryevə xüsusi məktubla tapşırılmışdı ki, müsəlmanların köçürülməsinə imkan verməsin [32, sənəd 598, s.629; 109, 29].

Ermənilərin Şimali Azərbaycan torpaqlarına kütləvi surətdə köçürülməsini müxtəlif arxiv sənədləri də təsdiq edir. Məsələn, Gürcüstandakı baş qərargah rəisinə təqdim edilən 1828-cı il 26 may tarixli raportda bildirilirdi: ***"Rusiyaya məxsus olan vilayətlərə xristianların köçürülməsi müvəffəqiyyətlə aparılır. Artıq Qarabağda 279, İrəvan vilayətində 948 ailə məskunlaşdırılmışdır; polkovnik Lazaryevin vədinə görə, köçənlərin sayı 5 min ailəyə çatdırılmalıdır"*** [79, iş 978,v.19]. İ.Şopenin məlumatına görə, İrandan köçürülən ermənilərdən təkcə 366 ailə (1715 nəfər) İrəvan şəhərinin özündə, 265 ailə (1110 nəfər) Naxçıvan şəhərində və 36 ailə (182 nəfər) isə Ordubad şəhərində yerləşdirildi [95,636-638]. Köçürülən ermənilər İrəvan əyalətinin 119 kəndində, Naxçıvan əyalətinin 61 kəndində, Ordubad dairəsinin 11 kəndində məskunlaşdırıldı. Ümumiyyətlə, İrəvan əyalətində 4559 (23568 nəfər), Naxçıvan əyalətində 2137 (10652 nəfər), Ordubad dairəsində 250 (1340 nəfər) erməni ailəsi yerləşdirildi. Nəticədə qondarma "Erməni vilayəti"nə 35560 nəfərdən ibarət 6949 erməni ailəsi köçürüldü [95, 635-642; 109, 31-32].

Lazaryevin özünün hesabatından isə məlum olur ki, üç ay yarım ərzində İran ərazisindən 8249 xristian — erməni ailəsi İrəvan, Naxçıvan və Qarabağ əyalətinə köçürülmüşdü, bu da, ən azı, 40 min nəfər demək idi; köçürmə işlərinə xəzinədən 14000 manat qızıl, 400 manat gümüş pul xərclənmişdi; köçmək istəyən 1500 erməni ailəsi İranda qaldı. Çünki Lazaryev köçürmə üçün ayrılan vaxt başa çatdığından onları köçürməyə imkan tapmamışdı [bax: 46, 131; 109, 31]. Lakin nəzərə almaq lazımdır ki, Lazaryevin hesabatında İrandan Şimali Azərbaycan torpaqlarına köçürülən erməni ailələrinin miqdarı tam dolğunluğu ilə əks olunmamışdır. Məsələn, rus tədqiqatçısı N.A.Smirnov İrandan 90 min ermənininin köçürülərək Azərbaycan torpaqlarında məskunlaşdırıldığını yazır [bax: 183, 180].

***Köçürülənlərin yerləşdirilməsi.*** Lazeryevin tapşırığını yerinə yetirən Qamazov öz hesabatında bildirirdi ki, İrəvan əyalətinə köçürülən ermənilərin əksəriyyəti buranın ən yaxşı mahallarında — Şərur, Dəvəli, Gərniçay, Zəngi, Abaran, Qırxbulaq, Dərəçiçək və Araz çayının İran tərəfində yerləşən hissəsindəki Saat Çuxurunda (Çuxursəd — ***red.***), yəni Sürməli mahalında yerləşdirildi. 300-dən artıq sənətkar erməni ailəsi İrəvanda yerli şəhərlilərin — azərbaycanlıların evlərində yerləşdirildi [153, 135-136; 122, 94]. Səlmas və Xoy xanlıqlarından köçürülən 200-dək erməni ailəsi isə İ.Arqutinskinin göstərişi ilə Sürməli mahalına göndərildi [153, 141; 122, 94]. Beləliklə, İrandan köçürülən ermənilər İrəvan, Naxçıvan və Ordubad şəhərlərində (Naxçıvanda — Dərələyəz, Şərur, Naxçıvan və Azadciran şəhərində; İrəvanın mərkəzi mahallarında — Gərnibasar, Zəngibasar, Dərəçiçək, Qərbibasar, Abaran və b. yerlərdə) məskunlaşdırıldılar [45, 93; bax: 182, 118]. Köçürülənlərin dövlət torpaqlarında yerləşdirilməsi haqqında Paskeviçin verdiyi təlimata baxmayaraq, ermənilərin əksəriyyəti Azərbaycan mülkədarlarına məxsus torpaqlarda yerləşdirildi.

Özü də ermənilərə bu zaman yaylaqlarda olan azərbaycanlıların evləri paylandı. Yaylaqlardan qayıdan azərbaycanlılar isə ev-eşiksiz qaldı. Bunu rus müəllifi İ.K.Yenikolopov təsdiq edərək öz əsərində yazırdı: ***"Türkmənçay müqaviləsi imzalanandan sonra ayrı-ayrı qrupların köçürülməsi eybəcər formada həyata keçirilməyə başlandı: xüsusi torpaq fondu ayrılmadığından yeni əhalinin*** *(yəni ermənilərin — **red.**)* ***əksəriyyəti yaylaqda olan kəndlilərin*** *(Azərbaycan türklərinin — **red.**)* ***evlərində yerləşdirildi"*** [153,135].

Bundan başqa, müəllifi A.Qriboyedov olduğu ehtimal edilən "Ermənilərin İrandan bizim vilayətlərə köçürülməsi haqqında qeydlər"-də göstərilir ki, ***"ermənilərin mülkədar torpaqlarında yerləşdirilməsi, onların müsəlmanların yerini dar etməsi bir yana, hələ üstəlik onlara güzəştlər də verildi. Halbuki ziyan çəkən tərəf müsəlmanlar idi. Əslində, erməniləri deyil, buranın müsəlmanlarını köçkün hesab etmək lazımdır. Ermənilər köçürülən zaman müsəlman ailələrin əksəriyyəti yaylaqda idi və gəlmə ermənilərin onların evlərində yerləşdirilməsindən xəbərləri yox idi"**** [32, sənəd 618, s.642-644; 65, 81-85; 153, 140; bax: bölmənin sonu, sənəd 5].

İlk mənbələrin məlumatından görünür ki, İrandan köçürülən ermənilərin əksəriyyəti, bu barədə verilmiş təlimatların əksinə olaraq, müsəlman kəndlərində yerləşdirilmişdi. Bundan əvvəl köçürülmüş ermənilərin müsəlmanlarla qarışıq yaşadıqları kəndlərdə isə, demək olar ki, yeni köçkünlər yerləşdirilmədi. Təbiidir ki, torpaqlarının və evlərinin əllərindən alınması azərbaycanlı əhalinin kəskin narazılığına səbəb olurdu. Naxçıvan kəndlərində bu cür narazılıqlar daha tez-tez baş verirdi. Odur ki, Qriboyedov vəziyyətdən çıxış yolu kimi Naxçıvan əyalətində müsəlmanlar yaşayan kəndlərdə məskunlaşdırılmış

* Rus mənbələrindən [32, sənəd 618, s.642-644; 65, 81-85] fərqli olaraq, İ.Yenikolopovun əsərində Rusiya hökumətinin bu qanlı siyasətini açıqlayan həmin yazıların İ.Qriboyedova deyil, hərbçi D.Zubarevə məxsus olduğu göstərilir [bax: 153, 140].

500 erməni ailəsini Dərələyəzə köçürməyi təklif etdi. Onun bu təklifi həyata keçirildi [32, sənəd 623, s.647-648; 109, 30-31].

Təqribi hesablamalara görə, ermənilərin köçürülməsi İrana, əsasən Cənubi Azərbaycana 32 milyon rubl ziyan vurmuşdu. Köçürmə prosesinin bütün ağırlığı yerli əhalinin üzərinə düşmüş, onların vəziyyətini kəskin şəkildə pisləşdirmişdi. Köçürülmə Şimali Azərbaycanda da azərbaycanlıların məhsuldar torpaqlarının əllərindən çıxması ilə nəticələnmişdi. Köçürmənin xərcləri, demək olar ki, Cənubi Azərbaycanın hesabına həyata keçirilmişdi [bax: 130, 94].

Beləliklə, Rusiya imperiyasının erməniləri İrandan Şimali Azərbaycanın qərb bölgələrinə və Qarabağa köçürməsi siyasəti azərbaycanlıların öz ata-baba torpaqlarından sıxışdırıb çıxarmaq məqsədi güdürdü və "erməni dövləti"nin yaradılmasına hazırlıq idi. Tarixi hadisələrin sonrakı gedişi bir daha sübut etdi ki, İran erməniləri Şimali Azərbaycana xüsusi məqsədlə — onlara burada ***"yeni vətən"*** yaratmaq məqsədilə köçürülmüşdü.

İrandan ermənilərin Şimali Azərbaycana köçürülməsində fəallıq göstərən hərbçilər və din xadimləri Rusiya tərəfindən mükafatlandırıldılar.

### *Ermənilərin Osmanlı imperiyasından İrəvan xanlığı ərazisinə köçürülməsi*

1826-1828-ci illər Rusiya — İran müharibəsində qələbədən ruhlanan rus ordusu 1828-ci il iyunun 14-ə Paskeviçin komandanlığı altında Gümrü yaxınlığından 12 minlik qoşunla Arpaçayı keçərək Şərqi Anadoluda işğallara başladı və iyunun 23-də Qars qalasını ələ keçirdi. Hücumu genişləndirən rus qoşunları iyulun 24-də Axalkələyi, avqustun 15-də Ahıskanı, 22-də Ərdəhanı, 28-də Bayazidi tutdular. 1829-cu ilin yazında müharibənin yenidən qızışması nəticəsində rus

ordusu Ərzurumu, daha sonra Muşu, Oltunu və Bayburtu işğal etdi [109, 33].

**Yeri gəlmişkən, birinci və ikinci Rusiya — İran müharibələri nəticəsində İrəvan xanlığının ərazisindən — öz ata-baba yurdlarından didərgin salınan azərbaycanlılar əsasən Şərqi Anadoluda sığınacaq tapmışdılar. Rusların Şərqi Anadoluya hücumu zamanı qırğınlara və yenidən köçkün düşməyə məruz qalanların əksəriyyəti yenə də azərbaycanlılar idi. Bu dəfə onlar Türkiyənin içərilərinə doğru köçməyə məcbur oldular** [193, 826; 109, 33].

1829-cu ilin avqustunda rus ordusu Balkan cəbhəsindən İstanbula yaxınlaşdıqda II Sultan Mahmud Rusiyaya barışıq təklif etdi və sentyabrın 2-də Ədirnə müqaviləsi imzalandı. Yeni təyin olunan rus-türk sərhədinə görə, Axılkələk qalası və Axıska şəhəri Rusiyaya ilhaq olundu, müharibə zamanı ruslar tərəfindən zəbt edilmş Qars, Trabzon, Bayazid və Ərzurum paşalıqları isə Türkiyəyə qaytarıldı [183, 180].

***Köçürməyə hazırlıq.*** Ədirnə müqaviləsinin 13-cü maddəsinə əsasən, Türkiyənin işğal olunmuş ərazilərindəki ermənilərə 18 ay müddətində daşınan əmlakları ilə birlikdə Rusiya təbəəliyinə keçmək hüququ verilmişdi. Rus qoşunlarının Qars, Ərdəhan, Bayazid, Ərzurum və digər bölgələrdən geri çəkilməsi hərbi əməliyyatlar zamanı türklərə xəyanət edən erməniləri çıxılmaz vəziyyətə saldı. Rus qoşunlarının komandanlığı İran erməniləri kimi, Türkiyə ermənilərini də yenicə işğal edilmiş Azərbaycan torpaqlarına köçürmək və bununla da Türkiyə ilə sərhədboyu ərazilərdə də ermənilərin say üstünlüyünü təmin etmək qərarına gəldi. Bu məqsədlə də 1829-cu il oktyabrın 10-da general Paskeviç imperator I Nikolaya raport yazıb Ərzurumda və Qarsda yaşayan ermənilərdən 10 min nəfərin Gürcüstanda və "Ermə-

ni vilayəti"ndə yerləşdirilməsinə icazə istədi [32, sənəd 818, s.830].

1829-cu il noyabrın 18-də hərbi nazir Çernışev Paskeviçə bildirdi ki, imperator onun təklifini bəyənmişdir [32, sənəd 819, s.830-832]. Bundan xəbər tutan Paskeviç dərhal əməli fəaliyyətə başladı. O, dekabrın 3-də Gürcüstanın mülki qubernatoruna məktubla xəbər göndərdi ki, Türkiyədə yaşayan və könüllü surətdə Gürcüstana və Rusiyaya məxsus digər vilayətlərə köçmək istəyən, bunun üçün maddi yardım tələb etməyən ermənilərə yola düşmək üçün lazımi sənədlər verilməsi barədə yerli qoşun rəislərinə icazə verib və bundan istifadə edən bir çox erməni ailəsi dərhal yola düşmüşdür [32, sənəd 820, s.831]. Paskeviç ermənilərin köçürülməsi və köçürülən erməni ailələrinin məskunlaşdırılması işinə rəhbərlik etmək üçün xüsusi komitə yaratmışdı. Həmin komitənin fəaliyyətini tənzimləmək üçün 12 maddədən ibarət ümumi qaydalar müəyyənləşdirilmişdi [32, sənəd 822, s.835-836].

***Köçürmənin həyata keçirilməsi və köçürülənlərin yerləşdirilməsi.*** Qars və onun ətraflarından köçürülən ermənilər yaşadıqları yerlərin iqlim şəraitinə uyğun olan Ələyəz (Alagöz) dağı ətrafındakı boşaldılmış Azərbaycan kəndlərində məskunlaşdırıldı. General Pankratyev Paskeviçə xəbər göndərdi ki, Loru dərəsində yerləşmək üçün 95 erməni ailəsinə sənəd verilmişdir. General-mayor Bereman da Qarsdan Gümrüyə yola düşən 400 erməni ailəsinə sənəd verdiyini bildirirdi [32, sənəd 820, s.831]. İrəvan xanlığına, Gəncəbasara, Qarabağa və digər Azərbaycan torpaqlarına, həmçinin Gürcüstana köçürülən ermənilər yerli müsəlman əhalinin torpaqlarında — təbii gözəlliyi, yaxşı iqlimi, saf suyu ilə fərqlənən dağətəyi bölgələrdə və şəhərlərdə yığcam şəkildə yerləşdirildi. Hətta, Sərdarabad qalasında olan 270 ev belə həmin vaxt ermənilər tərəfindən tutulmuşdu [71, IV, 291; 122, 95]. Bir qədər keçdikdən sonra M.Vladikin ermənilərin bura köçürül-

məsi barədə yazırdı: ***"İrəvan quberniyasında yaşayan ermənilərin əksəriyyəti buranın yerli sakinləri olmayıb, 1828-1829-cu illər müharibəsindən sonra Türkiyədən bu ərazilərə köçürülmüşlər"*** [142, 12; 122, 95].

1830-cu il yanvarın 22-də Paskeviçin Çernışevə göndərdiyi məlumata görə, Qars və ətrafından köçən 2500 erməni ailəsi onun sərəncamına əsasən yaşadıqları yerin iqliminə uyğun olan Ələyəz (Alagöz) dağı yaxınlığında — Pəmbək distansiyasındakı boşaldılmış Azərbaycan kəndlərində yerləşdirildi [32, sənəd 821, s.833].

Türkiyə hökuməti də, İran kimi, onun ərazisində səpələnmiş halda yaşayan ermənilərin ruslar tərəfindən köçürülüb sərhəd boyunca ərazilərdə yığcam şəkildə yerləşdirilməsindən ehtiyat edirdi. Ona görə də Osmanlı hökuməti bu köçürmənin qarşısını almaq məqsədilə Rusiya işğalları zamanı ermənilərin Türkiyəyə etdiyi xəyanəti, törətdikləri vəhşilikləri bağışlamaq barədə qərar verdi və fevralın 17-də yerlərdəki ermənilərə "əfvnamə"lər göndərdi. Türkiyə tərəfi, eyni zamanda, ermənilərin köçürülməsinin qarşısını almaq məqsədilə işğala məruz qalan, lakin Ədirnə müqaviləsinin şərtlərinə əsasən Rusiya tərəfindən boşaldılmalı olan Ərzurum, Qars, Bayazid, Ələşgird və s. bölgələrə öz nümayəndələrini göndərdi [189, 386-387; 109, 37-38].

Köçürülən ermənilərin qoyub getdikləri əmlak və torpaqların satılması məsələsini həll etmək üçün Paskeviç öz nümayəndəsi mayor Vannikovu Ərzuruma göndərdi. Yeri gəlmişkən, bu ərazilərdəki erməni kəndlərinin əksəriyyəti əvvəllər onlara məxsus deyildi. Həmin kəndlər bir qədər əvvəl, yəni müharibə zamanı təhlükəsiz yerlərə köçməyə məcbur olan müsəlmanların tərk etdiyi kəndlər idi. Ermənilər bu yolla təkcə Qars bölgəsində 80 kəndə tamamilə, 15 kəndin isə yarısına yiyələnmişdilər. Digər tərəfdən, Rusiyanın işğal etdiyi ərazilərdən (əsasən, Axılkələk və Axıska bölgələrindən) Türkiyənin digər bölgələrinə qaçan türklərin qoyub getdikləri əmlak və torpaqları, on-

ların boşaltmağa məcbur olduqları kəndlərin taleyi Rusiya tərəfini əsla maraqlandırmırdı [109, 38].

Ədirnə müqaviləsi ilə müəyyən edilən müddətin başa çatması ərəfəsində, yəni 1831-ci il aprelin 3-nə qədər tərtib edilən sənəddə Türkiyədən köçürülən erməni ailələrinin təxmini sayı və məskunlaşdıqları ərazilər göstərilmişdir. Türkiyədən köçürülən ermənilər Axıska, Pəmbək-Şörəyel və "Erməni vilayəti"ndə yerləşdirildi [32, sənəd 830, s.847]. Həmin sənəddən məlum olur ki, Türkiyə paşalıqlarından Rusiya hüdudlarına (yəni Axıska paşalığı, Borçalı distansiyası, Pəmbək və Şörəyelə, Talın mahalı, Göyçə gölü ətrafı və Baş Abarana) 14044 erməni ailəsi köçürülmüşdür. Ərzurumdan köçürülən 7288 erməni ailəsindən 5000-i, eləcə də Ərdəhandan 67 erməni ailəsi Axıska paşalığı* ərazisində, 1050 ailə Borçalı distansiyasında və Çalqa ətrafında, qalan 1305 ailə isə Pəmbək və Şörəyel distansiyalarında məskunlaşdırılmışdı. Qarsdan köçürülən 2464 ailədən 2264-ü Pəmbək və Şörəyel distansiyalarında, 200-ü isə Talın mahalında, Bəyaziddən köçürülən 4215 ailə Göyçə gölü ətrafında və Baş Abaranda məskunlaşdırılmışdı [32, sənəd 830, s.847]. Həmin sənədə aid əlavə qeyddə göstərilir ki, tam və dəqiq hesabat təqdim edilmədiyi üçün Türkiyədən neçə nəfərin köçürüldüyü dəqiq göstərilməmişdir. Lakin hesablama komissiyasının təxmini sayına görə, Osmanlı dövləti ərazisindən 84 min nəfərdən artıq erməni və yunan köçürüldüyü məlum olur [32, sənəd 830, s.847]. Lakin 1831-ci il aprelin 24-də qraf Paskeviçin adına verilmiş Əlahəzrətin buyuruğunda Türkiyə vilayətlərindən köçürülmüş xristianlar, yəni erməni və yunanlardan ibarət 14 mindən çox ailə (90 min nəfərə qədər) üçün 380 min rubl gümüş pul ayrıldığı bildirilirdi

* Axıska paşalığı indiki Gürcüstan Respublikasının Cavaxeti bölgəsidir. XX əsrin ortalarında Stalin rejmi bölgənin yerli əhalisi olan Məhsəti türklərini zorla Mərkəzi Asiyaya köçürdükdən sonra yenidən, ikinci dəfə bu bölgəyə erməniləri yerləşdirdi. Qonşulara qarşı saxta torpaq iddia - larından çəkinməyən ermənilər müasir dövrdə Cavaxeti (Məhsəti) bölgəsinə də ərazi iddiası irəli sürürlər.

[89, 61; 32, sənəd 832, s.847]. General Paskeviç özü köçürülənlərin 90 mindən artıq [32, sənəd 829, s.845; 172, 66], erməni tarixçisi Tavakalyan isə 100 min nəfərə yaxın olduğunu göstərirlər [186, 37].

Osmanlı imperiyası ərazisindən Gürcüstana köçürülən ermənilər əsasən Azərbaycan və Məhsəti türklərinin yaşadığı bölgələrdə yerləşdirildi. Bu faktı gürcü müəllifləri də öz əsərlərində təsdiq edirlər. Ədirnə müqaviləsindən sonra 106 mindən çox erməni general Paskeviçə Axıska torpağında məskunlaşmaq üçün müraciət etdi. Köçürmənin birinci böyük axını Axıskaya, ikincisi isə Kvemo-Kartliyə (Borçalı — ***red.***) oldu [212, 75]. General Paskeviç Ərzurumdan köçürülən 100 min ermənini Axılkələk və Axıska bölgələrinə yerləşdirdi [212, 100]. Artıq 1832-ci ildə Axıska əhalisinin əksəriyyətini ermənilər təşkil edirdi [213, 82-111]. Digər müəllifin məlumatına görə, Rusiya tərəfindən köçürülən 20 min erməni ailəsi Cavaxetidə [Axıska — ***red.***] yerləşdirildi [211,70].

Ümumiyyətlə, Türkiyədən keçmiş İrəvan xanlığı ərazisinə köçürülən ermənilər şəhərlərdə yerləşmək istəmədiyindən özləri üçün yaşayış məskəni olaraq Göyçənin cənubunu və qərbini, Dərəçiçək, Abaran, Sürməli və Talın mahallarını seçdilər [45, 93; bax: 182, 118]. Beləliklə, yeni köçürülənlərin əksəriyyəti İrəvan vilayətinin şimal və mərkəzi hissələrində və demək olar ki, bütünlüklə Pəmbək-Şörəyeldə yerləşdirildilər. Bunun nəticəsində Pəmbək və Şörəyeldə ermənilər 96 faizə çatdırıldı [71, II, 303-304; 182, 118].

Ermənilərin İrandan köçürülməsi zamanı fəallıq göstərən hərbçilər və din xadimləri mükafatlandırıldıqları kimi, Türkiyədən köçürülmələr zamanı da xidməti olanlara yüksək mükafatlar verildi.

İ.Şopenin apardığı siyahıyaalmanın nəticələrinə görə, ümumiyyətlə, 1828-1829-cu illər Rusiya — Türkiyə müharibəsindən sonra "Erməni vilayəti"nə Türkiyədən 21666 nəfər (3682 ailə) erməni, 324 nəfər (67 ailə) yezidi kürd köçürülmüşdür. ***Köçürülən ermənilər əsasən***

***keçmiş İrəvan xanlığının Qırxbulaq, Sürməli, Talın, Körpübasar, Abaran, Dərəçiçək və Göyçə mahallarının 129 kəndində yerləşdirildi*** [95, 636-642; 109, 40].

Qeyd olunmalıdır ki, Şimali Azərbaycana məxsus olan Şörəyel və Lori-Pəmbək bölgələri 1801-1805-ci illərdə Gürcüstana birləşdirildiyindən, "Erməni vilayəti"nə daxil edilməmiş və Gürcüstanın tərkibində qalmışdı. 1829-cu ilədək (yəni Rusiya — Türkiyə müharibəsindən sonra ermənilərin rəsmi surətdə köçürülməsinə qədər) Şörəyel-Pəmbək distansiyasına 1536 erməni ailəsi (5425 nəfər kişi cinsi) köçürülmüşdü. Sonra isə Türkiyədən 3148 ailə (10575 nəfər kişi cinsi) köçürüldü. 1832-ci ilin sonu, 1833-cü ilin əvvəlində Türkiyədən Zalqayaya köçürülən ermənilərdən 182 ailə (674 nəfər kişi cinsi) yenidən Şörəyel-Pəmbək distansiyasına gətirildi. Köçürülənlər arasında 169 nəfər yunan və 963 nəfər erməni katoliki də var idi [71, h.II, 302-304; 109, 41]. Smirnova görə isə, Türkmənçay və Ədirnə müqavilələrinin onlara verdiyi hüquqdan yararlanan ermənilər İrandan 90 min nəfər, Türkiyədən isə təxminən 75 min nəfərədək köçürülərək Azərbaycan ərazisində məskunlaşdırıldı [183,180]. Erməni mənşəli amerikan tarixçisi C.Bornoutyan öz tədqiqatında Rusiya işğalından sonra İrəvan xanlığına xeyli sayda erməni əhalinin köçürülüb gətirildiyini, azərbaycanlıların isə ata-baba yer adlarının erməniləşdirildiyini etiraf edir; məsələn, Osmanlı imperiyasından ermənilər köçürülükdən sonra Göyçə mahalının mərkəzinin [Kəvər — ***red.***] ermənilər tərəfindən dəyişdirilərək Nor Bayazid adlandığını qeyd edir [200, 37-38; 145, 122].

## *İrəvan xanlığı ərazisində etnodemoqrafik vəziyyətin ermənilərin xeyrinə dəyişdirilməsi*

Rusiya imperiyası tərəfindən həyata keçirilən bu qanlı siyasət nəticəsində İrəvan xanlığında etnodemoqrafik vəziyyət ermənilərin xeyrinə dəyişdirildi.

Qeyd etdiyimiz kimi, 1828-ci il martın 21-də Azərbaycan torpaqları hesabına yaradılan "Erməni vilayəti" İrəvan və Naxçıvan əyalətlərinə və Ordubad dairəsinə bölünmüşdü. İmperatorun fərmanı ilə "Erməni vilayəti" təşkil olunan zaman İrəvan əyalətində 4 dairə yaradıldı: İrəvan, Sərdarabad, Şərur və Sürməli. Həmin dairələrə daxil edilən mahallar isə əvvəlki sayında saxlanıldı [71, IV, 270].

Ermənilərin İrandan və Türkiyədən İrəvan xanlığı ərazisinə köçürülməsi işğaldan sonra uzun müddət davam etdirildi. Matenadaranda saxlanılan sənədlərə istinad edən N.A.Tavakalyan İrandan köçürülən ermənilərin sayının 8510 ailə olduğunu qeyd edir [186, 33].

1834-cü ilin kameral təsvirinə görə, İrəvan şəhərinin ətrafında yaşayan 2750 ailədən 1807 ailə tatar (yəni Azərbaycan türkü — ***red.***), 898 ailə erməni, 40 boşa (qaraçı — ***red.***) ailəsi vardı və onların içərisində çoxu müxtəlif peşədən olan ustalar və sənətkarlar idi [71, IV, 291]. Həmin kameral təsvirə görə, bütövlükdə İrəvan əyalətində 22336 ailə var idi ki, bunun da 65300 nəfərini kişi cinsi təşkil edirdi. Bunların 29690 nəfəri tatar (yəni Azərbaycan türkü — ***red.***), 10350 nəfəri əvvəllər köçürülmüş ermənilər və 24255 nəfəri İran və Türkiyədən yenicə köçürülən ermənilər, 1000 nəfərə yaxını Bayazid paşalığından buraya köçürülən yezidi kürdlər və az bir hissəsi boşa adlanan qaraçılardan ibarət idi [71, IV, 270-271; bax: bölmənin sonu, cədvəl 5].

## *Azərbaycanlı əhalinin doğma torpağından didərgin salınmasının başlanması*

Ermənilərin köçürülməsi ilə bağlı olaraq azərbaycanlı əhalinin təqib olunması və sıxışdırılması nəticəsində 1828- ci ildə İrəvan və Naxçıvandakı müsəlmanlar açıq və ya gizli şəkildə vətənlərini tərk edib xarici ölkələrə pənah aparmaqda davam edirdilər [32, sənəd 622, s.646; sənəd 623, s.647]. Bu cür vəziyyət Rusiya işğalçılarını və gəlmə erməniləri tamamilə təmin edirdi. Belə ki, 1828-ci ilin aprelində Paskeviçin verdiyi əmrə görə, İrəvan əyalətini tərk edən müsəlman köçkünlər Rusiya hüdudlarına (yəni öz vətənləri olan İrəvan xanlığı ərazisinə — ***red.***) yalnız onun xüsusi icazəsi əsasında qayıda bilərdilər [32, sənəd 438, s.490].

1829-cu ilin əvvəlində qraf Paskeviç-"Erivanski"nin tapşırığı ilə kollec asessoru İ.Şopen "Erməni vilayəti"ndə kameral siyahıyaalma keçirdi. Əlyazması 20 cilddən ibarət olan həmin siyahıyaalmanın nəticələri müəllifin 1852-ci ildə nəşr edilən "Erməni vilayətinin Rusiya imperiyasına birləşdirilməsi dövrünün tarixi abidəsi" adlı əsərində verilmişdir. İ.Şopenin siyahıyaalmasına görə, müharibələrdən sonra "Erməni vilayəti"ndə mövcud olmuş 752 kənddən 521-i İrəvan əyalətinə, 179-u Naxçıvan əyalətinə, 52-si isə Ordubad dairəsinə aid idi [95, 485-508]. Müharibə nəticəsində vilayətin ərazisində 359 kənd, o cümlədən 310 kənd İrəvan əyalətində (nəzərə almaq lazımdır ki, o vaxt Şərur mahalı İrəvan əyalətinə daxil idi — ***red.***), 43 kənd Naxçıvan əyalətində, 6 kənd isə Ordubad dairəsində xaraba qaldı. Bu Azərbaycan kəndlərinin əhalisi kütləvi qırğınlara məruz qaldı və öz doğma yurd-yuvalarından didərgin salındı [95, 510-518]. Deməli, dağıdılmış və xaraba qalan kəndlərlə birlikdə "Erməni vilayəti"ndə cəmisi 1111 kənd (359 xaraba qalmış və 752 abad kənd) olmuşdur ki, bunla-

rın da 831-i (521 abad və 310 xaraba kənd) əvvəllər İrəvan xanlığının ərazisinə daxil idi [109, 23; bax: bölmənin sonu, əlavə 2;3].

İ.Şopenin hesablamasına görə, İrəvan və Naxçıvan xanlıqlarının Rusiya tərəfindən işğal edilməsinədək "Erməni vilayəti"ni təşkil edən ərazilərdə təxminən 23730 ailə (İrəvan əyalətində 17000, Naxçıvan əyalətində 4600, Ordubad dairəsində isə 2130 ailə) yaşamışdır ki, bu da, orta hesabla hər ailəyə 5 nəfər olmaqla, 118650 nəfər edir [95, 542].

Siyahıyaalmanın nəticələrinə görə, köçürülməyədək vilayətdə 81749 nəfər müsəlman və 25151 nəfər erməni* qeydə alınmışdı. Bu tarixi fakt ermənilərin kütləvi surətdə köçürülüb gətirilməsinə baxmayaraq, yerli azərbaycanlı əhalinin yenə də böyük üstünlük təşkil etdiyini göstərir. Bundan əlavə, İ.Şopenin siyahıyaalmasında ayrı-ayrı yaşayış məntəqələri üzrə İrandan (35560 nəfər) və Türkiyədən (21666 nəfər) Azərbaycan torpaqlarına köçürülən erməni ailələrinin sayı (ümumilikdə 10631 ailə) və onların hansı yaşayış məntəqələrində məskunlaşdırıldığı da göstərilmişdir [95, 639-642]. Bu da siyahıyaalmanın o zamankı tarixi reallığı əks etdirən ilk mənbə olduğunu göstərir [bax: bölmənin sonu, əlavə 1].

Ermənilərin Azərbaycan torpaqlarına köçürülməsi sonrakı illərdə də davamlı olaraq həyata keçirilirdi. Qədim Azərbaycan torpağı olan İrəvan xanlığının ərazisində Rusiya işğalından sonra gəlmə ermənilərin sayının süni surətdə artırıldığını, yerli Azərbaycan türklərinin isə sayının azaldığını çox aydın göstərir. Belə ki, 1826-1828-ci illər Rusiya işğalınadək İrəvan xanlığında ermənilərin sayı 20 faizdən** də az olduğu halda, işğaldan sonra — 1832-ci ildə artıq onların sayı 55,5 %-ə çatdırılmışdı.

---

* İ.Şopenin siyahıyaalmasına əsasən, "Erməni vilayəti"ndə "əvvəllər yaşayan" ermənilər bura XIX əsrin əvvəllərindəki Rusiya — İran və Rusiya — Türkiyə müharibələri zamanı köçürülmüşdülər.

** Qeyd etdiyimiz kimi, İrəvan xanlığı əhalisinin təqribən 20%-ə qədərini təşkil edən ermənilərin əksəriyyəti bura əsasən XIX əsrin əvvəllərində Rusiya işğalının başlandığı dövrdə köçürülmüşdü.

Əhalinin demoqrafik tərkibində zorla aparılmış dəyişikliyi rus mənbələri də təsdiq edir: ***"Pəmbək və Şörəyelin əhalisi rus işğalından sonra dəyişdi. Yerli əhalini*** (yəni Azərbaycan türklərini — ***red.***) ***gəlmələr*** (yəni ermənilər — ***red.***) ***əvəz etdi. Belə ki, yerli əhali içərisində oranın əvvəlki sakini olmuş hər hansı bir qoca ermənini nadir halda taparsan. Yeni əhali buraya əsasən "Erməni vilayəti"ndən, Ərzurumdan, Qars və Kürdüstandan köçürülmüşdür. Hazırda Pəmbək distansiyasının sakinləri 2 hissəyə bölünür. Yerli sakinlər*** (yəni Azərbaycan türkləri — ***red.***) ***və yeni köçürülənlər*** (yəni ermənilər — ***red.***). ***Axırıncılar Rusiya — Türkiyə müharibəsindən sonra 1829-cu ildə rus hökumətinin təbəəliyinə keçənlərdir".*** 1829-cu ilin kameral təsvirinə görə, distansiyanın əhalisi — yerli sakinlər 1536 ailə (5425 nəfər) və yeni köçürülənlər 3148 ailədən (10575 nəfər kişi cinsi) ibarətdir [71, II, 303; 122, 95-96].

Ən çox etnik dəyişikliyə İrəvan və Naxçıvanın kənd əhalisi məruz qaldı. Hər iki əyalətdə ermənilərin sayı 2 dəfədən çox artdı. İrəvanda ermənilər sayca yerli əhali ilə bərabərləşdi, Naxçıvanda isə əhalinin 1/3-nə çatdı. Şəhər əhalisi içərisində azərbaycanlılar — İrəvan şəhərində 64%, Naxçıvanda 66% çox, Ordubadda 98% üstünlük təşkil edirdi [95, 635-638; 182,118]. Qeyd etmək lazımdır ki, Naxçıvan bölgəsində yerli əhalinin kütləvi narazılıqları nəticəsində ermənilər bu yerləri tərk etməyə məcbur oldular.

N.Voronov qeyd edirdi ki, ümumiyyətlə, köçürülənlər məskunlaşdırılarkən rus hökuməti erməniləri bu ərazilərə yerləşdirməklə müsəlman elementinin əhəmiyyətini azaltmağa çalışırdı [45, 92].

1832-ci il siyahıyaalmasına görə, İrəvan əyalətindəki kəndlərdən 463-də müsəlmanlar [Azərbaycan türkləri — ***red.***], 98-də ermənilər, 65 kənddə isə azərbaycanlılar və ermənilər qarışıq yaşayırdılar. Əv-

vəllər ermənilərin heç yaşamadığı Göyçə, Abaran, Vedibasar, Şərur və digər mahallarda onların kütləvi şəkildə yerləşdirilməsi diqqəti cəlb edir. İrandan köçürülən ermənilər Azərbaycan türklərinin tərk etməyə məcbur olduqları 62 kənddə, Azərbaycan türklərinin yaşadığı 68 kənddə, qarışıq əhalisi olan 24 kənddə və yalnız yeni salınmış 32 erməni kəndində məskunlaşdılar. Türkiyədən köçürülən ermənilər, İrandan köçürülənlərdən fərqli olaraq, rus işğalına qədər ancaq müsəlmanların yaşadıqları, lakin məcburiyyət qarşısında tərk etdikləri 64 kənddə yerləşdirildi. Onların bir hissəsi bundan əvvəl köçüb gəlmiş ermənilərin (15 kənd) və İran ermənilərinin (23 kənd) və ya əhilinin qarışıq yaşadığı kəndlərdə (12 kənd) məskunlaşdırıldı. Yalnız Türkiyə ermənilərinin cüzi hissəsi azərbaycanlı-erməni kəndlərində (12 kənd) yerləşdi. Beləliklə, erməni köçkünləri boşaldılmış 126 azərbaycanlı kəndində, azərbaycanlıların yaşadığı 70 kənddə, 22 qarışıq və 47 erməni kəndində məskunlaşdırıldılar [95, 543-630; bax: 182, 118-119].

Hətta, ermənilərin Şimali Azərbaycan torpaqlarına köçürülməsi layihəsini hazırlayan Qriboyedovun özü belə köçürmə prosesini mənfi qiymətləndirmiş və ermənilərin dövlət torpaqlarında deyil, əsasən müsəlmanlara — mülkədarlara və kəndlilərə məxsus torpaqlarda yerləşdirildiklərini və onların burada müsəlmanları sıxışdırdıqlarını qeyd edir [32, sənəd 618, s.642].

Şimali və Qərbi Azərbaycana köçürülən ermənilərin böyük hissəsi dövlət kəndliləri olan azərbaycanlıların torpaqlarında yerləşdirilirdi. Bu torpaqların sahibləri yay aylarında yaylaqlarda olduqlarına görə ilk vaxtlar gəlmə ermənilərin yerləşdirilməsi əməliyyatı sakit bir şəraitdə gedir, elə bir münaqişə baş vermirdi. Lakin sonralar yerli əhali yaylaqdan qayıtdıqdan sonra bu prosesin daimiləşdiyini görən

müsəlmanların ciddi narazılıq dövrü başlandı. Rus diplomatı Qriboyedov bu məsələ ilə əlaqədar olaraq yazırdı: ***"Ermənilərin ilk dəfə buraxıldıqları torpaqlara əbədi sahib duracaqlarından müsəlmanlar içərisində yaranan vahiməni aradan qaldırmaq və sonuncuların düşdükləri ağır vəziyyəin uzun sürməyəcəyini bildirməklə onları sakitləşdirmək məsələsini biz dəfələrlə götür-qoy etmişik"*** [47, 341]**.** Maraqlıdır ki, Rusiya səfirinin təklifinə əsasən müsəlmanlara ermənilərin onların torpaqlarında məskunlaşdırılması barədə yalan məlumatlar verilirdi. Qriboyedov yazırdı ki, indi biz müsəlmanları düşdükləri bu çətin vəziyyətlə barışdırmalı və onları inandırmalıyıq ki, ermənilər bu torpaqlarda müvəqqəti qalacaqlar. Çünki, azərbaycanlılarda belə bir fikir yaranıb ki, ***"ermənilər ilk dəfə ayaq basdıqları torpaqlara həmişəlik yiyələnirlər".*** Biz müsəlmanları bu fikirdən daşındırmalıyıq [47, 341].

Köçürmə komissiyasının verdiyi təlimata görə, yeni salınan xristian-erməni kəndləri müsəlman-azərbaycanlı kəndlərindən ayrı olmalı, xristianlar-ermənilər xüsusi dairə və mahallarda yerləşdirilməli idi [90, 159].

İrəvan xanlığının ərazisinə ermənilərin kütləvi köçürülmələri sonrakı dövrlərdə də davam etdirildi. Ermənilərlə yanaşı, yezidi kürdlər də İrəvan xanlığı ərazisində yerləşdirildi. 1834-cü ilin məlumatına görə, Bayaziddən gətirilən 1000 nəfər (təqribən 300 ailə) yezidi kürd İrəvan əyalətində məskunlaşdırıldı [71, h.IV, 270-271]. Ələyəz (Alagöz) dağının ətəyindəki bir sıra boşaldılmış Azərbaycan kəndlərində də yezidi kürdlər məskunlaşdırıldı. Yezidi kürdlər 1839-cu ildə Mirək, Quruboğaz, Carcarçı, Çobangərəkməz kəndlərində, sonralar isə Pəmbək, Qundaxsaz, Böyük Camışlı, Kiçik Camışlı və Korbulaq kəndlərində yerləşdirildi. Nəhayət, 1877-ci ildə yezidi kürdlər Bağ-

dad-Dolu-Taxt və Kiçik Cəngi (və ya Şah Səngər) kəndlərində yerləşdirildi [70, 4]. Türkiyədən köçürülən yunanlar isə əsasən Şörəyel-Pəmbək distansiyasının Bayandur, Sisimədən, Alakilsə (Baytar) kəndlərində və Gümrüdə məskunlaşdırıldı [109,42].

Ümumiyyətlə, 1826-1828-ci illər Rusiya — İran və 1828-1829-cu illər Rusiya — Türkiyə müharibələrindən sonra kütləvi köçürmələr zamanı "Erməni vilayəti"nə — İrəvan və Naxçıvan xanlıqlarının ərazisinə İran və Türkiyədən 57226 nəfər erməni (10631 ailə) köçürüldü. Köçürülmələrdən əvvəl həmin ərazidə cəmisi 25151 nəfər (4428 ailə) erməni yaşayırdı ki, onlar da bundan əvvəlki müharibələr zamanı köçürülmüşdü. Müharibələr nəticəsində İrəvan və Naxçıvan xanlıqlarının ərazisindən Azərbaycan türklərinin xeyli hissəsi qaçqın düşmüş, orada yalnız 81749 nəfər (16078 ailə) azərbaycanlı qalmışdı. Kütləvi köçürmələrdən sonra "Erməni vilayəti"ndə ermənilərin sayı 82377 nəfərə (15059 ailə) çatdı. Nəticədə vilayətdə erməni əhali müsəlmanları, cüzi də olsa, sayca üstələdi [95, 642; 109,42]. Bununla da bu qanlı siyasəti həyata keçirən çar Rusiyası və erməni siyasətçiləri öz çirkin məqsədlərinə nail oldular. Ümumiyyətlə, İrandan köçürülən 8249 ailədən 6949-nun "Erməni vilayəti"ndə yerləşdirilməsi nəzərə alınsa, onda belə qənaətə gəlmək olar ki, qalan 1300 ailə Qarabağa və Zəngəzura köçürülmüşdür [109, 32].

1840-cı ildə "Erməni vilayəti" ləğv edildi. Onun əvəzində İrəvan qəzası yaradıldı və bu qəza Gürcü-İmereti quberniyasının tərkibinə daxil edildi. Bununla Azərbaycanın ərazi-dövlətçilik ənənələrinə növbəti zərbə vuruldu və İrəvan xanlığının ərazisində erməni dövləti yaratmaq üçün növbəti addım atıldı. 1849-cu ildə İrəvan, Aleksandropol [Gümrü — ***red.***], Naxçıvan, Ordubad və Novo-Bayazid [Göyçə mahalının şərq hissəsi — ***red.***] qəzalarından ibarət İrəvan quberniya-

sı təşkil edildi və 1917-ci ilə qədər bu struktur əsasən dəyişməz qaldı [109, 24]. İrəvan quberniyasının yaradılması Şimali Azərbaycan ərazisində erməni dövləti yaradılması yolunda həlledici addım oldu.

Yeri gəlmişkən, XIX əsrin əvvəlində Rusiya imperiyasının bəzi hakim dairələri Cənubi Qafqazda — Azərbaycan torpaqlarında ermənilərin deyil, məhz rus kolonistlərinin — kazaklar, molokanlar, duxoborlar və başqa təriqətlərdən olan xristian əhalinin yerləşdirilməsinə üstünlük verirdi. Bu məqsədlə bir neçə layihə hazırlansa da, sonralar onların icrası təxirə salındı.

N.N.Şavrov Rusiyanın Cənubi Qafqazdakı müstəmləkəçilik siyasəti haqqında yazır: ***"Biz müstəmləkəçilik fəaliyyətimizə Cənubi Qafqazda rusların deyil, bizə yad olan xalqların yerləşdirilməsindən başladıq... 1826-1828-ci illər müharibəsinin qurtarmasından sonrakı iki il ərzində — 1828-ci ildən 1830-cu ilədək Cənubi Qafqaza 40 min İran və 84 min Türkiyə ermənisi köçürdük və onları erməni əhalinin cüzi olduğu Yelizavetpol və İrəvan quberniyalarının ən yaxşı dövlət torpaqlarında yerləşdirdik. Onları, həmçinin, Tiflis quberniyasının Borçalı, Axıska və Axılkələk qəzalarında yerləşdirdik. Onların yerləşdirilməsi üçün 200 min desyatindən artıq dövlət torpağı ayrıldı, müsəlmanlardan 2 milyon rubldan artıq məbləğdə xüsusi mülkiyyət torpaqları satın alındı. Yelizavetpol quberniyasının dağlıq hissəsi və Göyçə gölünün sahili həmin ermənilərlə məskunlaşdırıldı. Nəzərə almaq lazımdır ki, rəsmi köçürülən 124 min nəfər erməni ilə yanaşı, qeyri-rəsmi şəkildə köçənlər də çox olmuşdur və ümumiyyətlə, köçürülənlərin sayı 200 min nəfərdən xeyli artıqdır"*** [92, 63; 109,43].

Ermənilərin keçmiş İrəvan xanlığı ərazisinə axını 1877-1878-ci illər Rusiya — Türkiyə müharibəsindən sonra daha da gücləndi. X1X əsrin 90-cı illərində Türkiyədə dövlətə qarşı baş verən erməni qiyam-

